Jurnal 25.04.2007-ci ildə Azərbaycan Respublikası Ədliyyə Nazirliyi Mətbu nəşrlərin reyestrinə daxil edilmişdir. Reyestr № 2212

---

On 25.04. 2007, the journal was included in the register of Press publications of the Ministry of Justice of the Azerbaijan Republic. Registration № 2212






---

**Redaksiyanın ünvanı:**
Az1073, Bakı şəh.,
Mətbuat prospekti, 529,
"Azərbaycan" nəşriyyatı,
6-cı mərtəbə

**Editorial address:**
Az1073, Baku,
Press Avenue, 529,
"Azerbaijan" Publish House,
6-th floor

**Tel.:** +994 50 209 59 68
+994 55 209 59 68
+994 99 805 67 68
+994 12 510 63 99

**e-mail:**
elmmerkezi@gmail.com

## Beynəlxalq indekslər / International indices

ISSN: 2663-4619
e-ISSN: 2708-986X
DOI: 10. 36719
















































# HUMANİTAR VƏ İCTİMAİ ELMLƏR

## HUMANITIES AND SOCIAL SCIENCES

DOI: https://www.doi.org/10.36719/2663-4619/78/7-11

**Natavan Havar qızı Hacıyeva**
Azərbaycan Tibb Universiteti
filologiya elmləri doktoru
mrs.hacıyevanata7@gmail.com
**Arzu Ağanəhməd qızı Mirzəyeva**
Azərbaycan Tibb Universiteti
müəllim
mrs.arzu1960@gmail.com

## TƏYİNİ SÖZ BİRLƏŞMƏLƏRİ İLƏ İFADƏ OLUNAN İSMİ İDİOMLAR

**Xülasə**

Azərbaycan dilinə aid olan əsərlərdə ismi birləşmələr "təyini söz birləşmələri" adı ilə qeyd olunmuşdur.

Dilçi alim M. Hüseynzadə bu birləşmələri bele qruolaşdırır: birinci növ təyini söz birləşməsi, ikinci növ təyini söz birləşməsi, üçüncü növ təyini söz birləşməsi. O, eyni zamanda bu birləşmələrin hər birinin ayrıca leksik-qrammatik məna xüsusiyyətlərini qeyd edir.

Azərbaycan dilində idiomların təyini söz birləşmələri ilə ifadəsi mühüm yer tutur. İdiomlar insan hisslərinin dolayı yolla ifadəsidir. Məfhumların dolayı yolla ifadəsi ona daha təsirli məna çalarları vermək məcburiyyətindən irəli gəlmişdir.

Obrazlı mənaya, böyük təsir qüvvəsinə malik olan idiomlar sözün ekvivalenti, yəni məcazi məna ilə verilən sinonimi kimi dildə özünü göstərir.

İdiomlar milli xüsusiyyətlərə malik olduğu üçün hər bir xalqın tarixini, mədəniyyətini və yaşayış tərzini əks etdirir. Bu ifadələr tarixi mənbələrdə, dilçilik ədəbiyyatlarında lüğətlərdə "idiomlar", "frazeoloji birləşmələr", "sabit söz birləşmələri" adları altında tədqiq edilmişdir.

***Açar sözlər:*** *təyini söz birləşməsi, frazeoloji vahidlər, obrazlı ifadələr, milli xüsusiyyətlər, idiomlar, məcazi mənalı sözlər*

**Natavan Havar Hajiyeva**
**Arzu Agahamad Mirzayeva**

## Nominal idioms expressed with defining word compounds

**Abstract**

Idioms in linguistics are given under the word combinations, phraseological combinations, phraseologisms, etc.

Idiom - An idiom is a word of Greek origin. It means an expression with its own characteristics. An idiom is a combination of words that have a real meaning and combine it with a figurative meaning. The concept expressed by idioms is more specific than other word combinations.

Idioms manifest themselves in language as the equivalent of a word, that is, a synonym given in a figurative sense.

Because idioms have national characteristics, it is possible to get acquainted with the culture, history and way of life of each people by studying the idioms in the language of each nation.

One of the main features of idioms is that they are figurative emotional expressions. They often express any concept more effectively and figuratively than individual words. Certain categories of

idioms distinguish it from other language units. Idioms are the original means, existence and richness of language.

Such interesting features of idioms have made scientists of different fields of linguistics - lexicographers, stylists, grammarians, folklorists think a lot and involved them in scientific research. Idioms in the Azerbaijani language are divided into 2 groups, including nouns and verbs.

***Key words:*** *defining word compounds, phraseological units, figurative expressions, national features, idioms, words in figurative meaning*

## Giriş

İsmi birləşmələr türkologiyada müxtəlif adlarla qeyd edilsə də, əsasən "izafət" adı ilə tanınmışdır. (Mayzel, 1976 259) Azərbaycan dilinə aid əsərlərdə isə bu birləşmələr "təyini söz birləşmələri" adı ilə qeyd olunmuşdur (Hüseynzadə 1951, 60) Sonralar feili birləşmələrin tədqiqi ilə bağlı olaraq, başqa türk dillərində olduğu kimi, Azərbaycan dilçiliyində də "feili birləşmə" ifadəsi qarşısında "ismi birləşmə" ifadəsi də özünə mövqe tutmağa və möhkəmləməyə başlamışdır. (13, 1966: 18)

"İzafət" əslində, ərəbcə olub, ərəb və fars dillərinin qaydalarına əsaslanan ismi birləşmələri ifadə etmək üçün dilə gətirilmişdir. "İzafət" çox spesifik termindir və türk dillərinə aid birləşmələrin heç bir xüsusiyyətini özündə əks etdirmir. Ona görə də "İzafət" türk dillərində, eləcə də Azərbaycan dilində söz birləşmələrinin tədqiqi tarixində ciddi məhdudiyyətlər yaratmışdır. Belə ki, tədqiqatçılar fars dilinə aid olan izafət formalarının türk dillərində qarşılığını axtarmış, bunlara uyğun gəlməyən birləşmələr isə nəzərdən qaçırılmışdır. (Seyidov,1992: 176)

İzafət türk dilində üç formaya uyğun gəlir:

Əsrari-nuhan – gizli sirlər, mahi-taban – parlaq ay. Şəbi-hicran – hicran gecəsi, həvayi-eşq – eşq havası. Əhvali-dünya – dünyanın əhvalı, sürəti Şirin – Şirinin sürəti

C.C. Mayzel bu birləşmə formasını belə göstərir:

Birinci növ – $C_o+M_o$. İkinci növ – $C_o+M_1$. Üçüncü növ – $C_1+M_1$

Bu birləşmələrin hər biri üçün bir sıra leksik-qrammatik məna xüsusiyyətlərini qeyd edir (Mayzel, 1976: 260)

Bu üç formanın "təyini söz birləşməsi" adı ilə qeyd edilməsinin səbəbi onların hamısında birinci tərəflərin müxtəlif yollarla ikinci tərəfləri təyin etməkdən ibarətdir. Deməli "təyini söz birləşməsi" ifadəsi bu birləşmələrin xarakterindən irəli gəlir və onların hamısı üçün ümumi olan müəyyən xüsusiyyətləri əks etdirə bilir. Bu ifadədən yalnız Azərbaycan dilçiliyində deyil, başqa türk dillərinə aid olan əsərlərdə də tez-tez istifadə olunur (Dimitriev,1987: 259) M. Hüseynzadə bu birləşmələri bütöv şəkildə "təyini söz birləşmələri" adı ilə qeyd edir və belə bir qruplaşma aparır: birinci növ təyini söz birləşməsi, ikinci növ təyini söz birləşməsi və üçüncü növ təyini söz birləşmələri (Hüseynzadə, 19516 60)

Birinci növ təyini söz birləşməsinin birinci tərəfi isimlə, sifətlə, sayla, əvəzliklə, feili sifətlə ifadə olunur.

a) birinci tərəfi isimlə ifadə olunanlar: *daş hasar, dəmir qapı, gümüş qaşıq.*

b) birinci tərəfi sifətlə ifadə olunanlar: *böyük şəhər, sərin su, göy çəmən.*

c) birinci tərəfi sayla ifadə olunanlar: *iki millət, beş qitə, iyirminci əsr.*

d) birinci tərəfi əvəzliklə ifadə olunanlar: *bütün insanlar, həmin hadisə, o dağlar.*

e) birinci tərəfi feili sifətlə ifadə olunanlar: *gələcək gün, ləpələnən dəniz, yazılmış qanun.*

İkinci növ təyini söz birləşməsinin 1-ci tərəfi heç bir qrammatik morfoloji əlamət qəbul etmir, ikinci tərəfi mənsubiyyət şəkilçisi ilə işlənir: bulaq suyu, kənd həyatı, vətən torpağı.

İkinci növ təyini söz birləşməsinin tərəfləri eyni zamanda cəm şəkilçisi qəbul edə bilmir: bir tərəf cəmlənəndə o biri tərəf tək olur: gözəllər gözəli, dünya gəncləri, yollar ayrıcı.

Bu birləşmələr həmişə yanaşı işlənir və onların arasına heç bir söz daxil ola bilmir.

Üçüncü növ təyini söz birləşməsinin birinci tərəfi yiyəlik hal şəkilçisi ilə, ikinci tərəfi mənsubiyyət şəkilçisi ilə işlənir: şəhərin mərkəzi, zamanın hökmü, baharın gəlişi və s.

Bu birləşmələrin birinci tərəfi şəxs əvəzlikləri ilə ifadə olunur: Mənim kitabim, sənin kitabın, bizim kitabımız və s.

Üçüncü növ təyini söz birləşmələrinin tərəfləri eyni zamanda cəmlənə bilir: şagirdlərin kitabları, onların dostları və s.

Bu birləşmələrin tərəfləri arasına müxtəlif sözlər daxil etmək olur. Məs: dağların havası – dağların sərin havası, bulağın suyu – bulağın şır-şır axan suyu və s.

## Əsas hisssə

Təyini söz birləşmələrinin qanunlarını özündə ehtiva edən idiomlar da Azərbaycan dilində mühüm yer tutur. İdiomlar insan hisslərinin dolayı yolla dildə ifadəsidir. Axı əsrlər boyu insanlar sevinc və kədərini, iztirab və həyacanını, arzu və istəklərini yalnız birbaşa deyil, dolayı yolla ifadə etmək məcburiyyətində qalmışlar. Məfhumların dolayı yolla ifadəsi isə ona daha təsirli məna çalarları vermək məcburiyyətindən irəli gəlmişdir. Obrazlı mənaya, böyük təsir qüvvəsinə malik olan idiomatik ifadələr həm bədii əsərlərin dilini, həm də nitqimizi gözəlləşdirir. Bu ifadələr tarixi mənbələrdə, dilçilik ədəbiyyatlarında, lüğətlərdə “idiomlar”, “frazeoloji birləşmələr”, “sabit söz birləşmələri” adları altında tədqiq edilmişdir.

İdiom- idioma yunan mənşəli sözdür. Mənası özünəməxsus xüsusiyyətə malik olan ifadə deməkdir. Bu termin çoxmənalıdır. Dilşünaslıqda bir sıra dilçilər bu termini müxtəlif mənalarda işlətmişlər. Həqiqi mənalı sözlərin qarşılığı olub onu məcazi məna ilə bildirən sabit söz birləşməsinə idiom deyilir.

Hər hansı bir söz məfhumu müstəqim mənada, yəni nominativ mənada ifadə etdiyi halda, idiom həmin məfhumu dolayı yolla, yəni məcazi mənada izah etmək yolu ifadə edir.

İdiomların böyük bir qismi sabit söz sırasına malikdir. Bu bütövlük onun mənası ilə bağlıdır. Qətiyyən dəyişilməyən, möhkəm leksik quruluşa sabit söz sırasına malik olan idiomatik ifadələr: gözləri kəlləsinə çıxmaq, ağzına dil atmaq, barmaq basmaq, başa düşmək, qulaq asmaq və s. Bunlar qovuşma idiomlar adlanır.

Müəyyən leksik, qrammatik dəyişikliyə yol verən idiomatik ifadələrin əsas mənası dəyişilmir. Məsələn: bir ayağı evdədir, bir ayağı qəbirdə - ayağının biri qəbirdədir; üst dodağı göy süpürür, alt dodağı yer süpürür - dodağı yer süpürür.

Bəzi idiomatik ifadələrə müəyyən söz əlavə etmək mümkündür. Məsələn: ağzının suyu axmaq - ağzının suyu damcı-damcı axmaq; ət tökmək - köynək-köynək ət tökmək; başına daş düşmək - başına daşın boyüyü düşmək; canına yayılmaq - canına sarı yağ kimi yayılmaq və s.

İdiomların ifadə etdiyi məfhum başqa sabit söz birləşmələrinə nisbətən daha konkret olur. İdiomlar sözün ekvivalentinin məcazi məna ilə verilən sinonim kimi dildə özünü göstərir. Məsələn: əziyyət çəkmək mənasında: kipriyi ilə od götürmək, dəridən qabıqdan çıxmaq, saçını süpürgə etmək, iynə ilə gor qazmaq, sümük sındırmaq, can qoymaq; yorulmaq mənasında: əldən-ayaqdan düşmək, nəfəsi kəsilmək, haldan düşmək; öyünmək mənasında: mənəm-mənəm demək, ağzına çullu dovşan yerləşməmək, qabağından yeməmək, döşünə döymək; istəmək mənasında: ürəyi istəmək, könlündən keçmək, burnunun ucu göynəmək,sevinmək mənasında; canına yağ kimi yayılmaq, qanad açıb uçmaq, dünyanı ona bağışlamaq; məşhurlaşmaq mənasında: adı dildən-dilə düşmək, könülləri fəth etmək, agızdan-ağıza gəzmək, adı dillərdə dastan olmaq; hirslənmək mənasında: cin atına minmək, hirsi başına vurmaq, özündən çıxmaq, cin başına vurmaq; aldatmaq mənasında: gözdən pərdə asmaq, başına corab hörmək, saman altından su yeritmək və s.

İdiomların əsas xüsusiyyətlərindən biri onların milli formanın əlamətdar cəhətlərindən olmasıdır. İdiomlar hadisə, etnik, ənənə, təfəkkür tərzi, dünyagörüşün tipik izini saxlayan, əks etdirən vahidlərdəndir.

Azərbaycan dilçiliyində idiomların tədqiqinə 1950-ci illərdən sonra başlanılmışdır. Bu haqda ilk məlumata prof. M. Hüseynzadənin 1954-cü ildə nəşr etdirdiyi “Müasir Azərbaycan dili” əsərində rast gəlirik. Müəllif bu əsərdə “Frazeologiya” başlığı altında frazeoloji vahidlərin əmələ gəlməsindən, onların sərbəst söz birləşmələrindən həm məna, həmdə quruluşca fərqli cəhətlərindən söhbət açır (Hüseynzadə, 1954: 32-34).

Azərbaycan dilçiliyində frazeologiyadan bəhs edən digər əsər C.Murtuzayevin “M.F.Axundovun komediyalarının frazeologiyası” adlı tədqiqat əsəridir. Bu əsərdə M.F.Axundovun komediyalarında

işlənmiş frazeoioji vahidlərin üslubi təsnifindən, qrammatik bölgüsündən və s. cəhətlərindən danışılır (Murtuzayev, 1958: 11-21).

S.Cəfərov "Müasir Azərbaycan dilinin leksikası" əsərində idiomlardan daha geniş məlumat verir. Yaranma yollarına görə idiomların qovuşma, birləşmə, uyuşma növlərindən söhbət açır. S.Cəfərov bu əsərində yalnız frazeoloji səciyyə nahidlərindən deyil, həm də hikmətli sözlər, zərb-məsəllərdən danışır (4, s. 35- 46).

İdiomlardan ilk dəfə ətraflı şəkildə "Müasir Azərbaycan dilində söz birləşmələri" əsərində danışılmışdır. Bu əsərdə sabit söz birləşmələrinin əmələgəlmə yolları, mənaca növləri, səciyyəvi xüsusiyyətlərindən danışılır (13,1966: 18-29).

"Azərbaycan dili frazeologiyasının əsasları" adlı tədqiqat işində də idiomlar geniş şəkildə təhlil olunur, onun struktur quruluşu və məna növləri açıqlanır (Bayramov,1978: 44-56).

M.Mirzəliyevanın 1995-ci ildə çapdan çıxmış "Türk dilləri frazeologiyasının nəzəri problemləri" əsərində də frazeologiya məsələləri işıqlandırılır. Oğuz qrupu dillərinin (Azərbaycan, türk, türkmən, qaqauz dilləri) faktik materialları əsasında yazılmış bu əsərdə frazeologiyanın bir sıra problemləri öz uğurlu həllini tapmışdır (Mirzəliyeva, 1995: 9-16).

Azərbaycan dilində idiomların iki qrupa ayırırlar: ismi idiomlar, feli idiomlar.

İsmi idiomlar qrupuna adlar sırasına daxil olan nitq hissələrinin ekvivalenti ola biləcək idiomlar aid edilir. Bu idiomlarda əsas söz yerində isim, sifət, say kimi nitq hissələrindən biri işlənir. Bu da həmin idiomların növlərini meydana çıxarır: İsim mənasında işlədilən idiomlar, sifət mənasında işlədilən idiomlar, say mənasında işlədilən idiomlar. I növ təyini söz birləşməsi quruluşunda olanlar: zəif damar, gül ağız, qara gün, ağ gün.

İsbatla Sevindik həmin professorun zəif damarını ustalıqla tutmuşdular (Hüseynoğlu, 1993: 154).Nəzakət, yenə qonşu arvadın gül ağzı açılıb, üçmərtəbəli söyüşün biri bir köpüyə (Hüseynoğlu, 1993: 112). Hər gündüzün bir gecəsi olduğu kimi, hər ağ günün də bir qara günü vardır (Hüseynoğlu, 1993: 137).

İsim mənasında işlənən idiomların tərkibi təyin və təyinedilən sözdən ibarət olsa da əsas söz obyekti əşyanı göstərir, asılı söz isə onu təyin edir, mənasını açır. Hər iki tərəfi isimlə ifadə olunmuş, II növ təyini söz birləşməsi quruluşunda olanlar: alın yazısı, buz baltası, qan çanağı, qabırğa söhbəti, quş südü, dil pəhləvanı, əl çirki, elm dəryası, zəhər tuluğu, ilan dili, it dəftəri, göz dağı, süd gölü, od parçası, oğlan uşağı, qız uşağı, oğlan çağı, çörək ağacı, cəhənnəm əzabı və s.

Ona-buna iş yazmaqdan cana doydum, adım it dəftərində də olmadı (Hüseynoğlu, 1993: 160). Nə etməli, siz vermirsiniz, mən də istəmirəm pul deyəndə əl çirkidir (1, 1986: 48). Eşşək eşiyə çıxan kimi bir oğlan uşağı yeddi-səkkiz yaşında tumançaq, başıaçıq və keçəl özünü çırpdı küçəyə və ağlaya-ağlaya, çığıra-çığıra qaçıb yapışdı eşşəyin quyruğundan (1,1986: 58). Bir az keçdi, dörd-beş yaşında bir qız uşağı qapını açdı və Xudayar bəyi görən kimi qapını örtüb qaçdı həyətə (1,1986: 58). İndi də o, təzə redaktorumuz Mirzə Kəpəzilinin sağ əli olub (İldırımoğlu 1987: 61). Əjdaha cəhənnəmi udandan sonra onun içərisi başladı alışıb yanmağa, əjdaha ilan dili çıxarıb yalvardı (Ə.Haqverdiyev "Xortdanın cəhənnəm məktubları" (1,1986: 25).

III növ təyini söz birləşməsi quruluşunda olanlar: sözün canı, türkün-sözü, gözünün ağı-arası, itimin qurd dayısı, şeytanın dal ayağı, sözün qısası, dünyanın qurtaran yeri, Allahın yazıq bəndəsi və s.

Təəccüb etməyin, sözümün canı var (1,1986: 28). Nadir Zabikənin gözünün ağı-qarası tək balasıdır (Hüseynoğlu, 1993: 137). Balalarım, sözün qısası, bu yazını yazan da sizin kimi uşaq idi; ancaq bircə təfavütünüz oradadır ki, onun saqqalı var, sizin hələ saqqalınız yoxdur (1,1986: 47).

Sifət mənasında işlənən idiomlar sifətin, feli sifətin birləşməsindən əmələ gəlir. Məsələn: başı uca, başı boş, ağzı göyçək, bəxti qara, könlü-gözü tox, günü qara, kefi kök,damağı çağ, çörək itirən, ayağı yer tutan, çörəyi dizi üstündə olan, başı daşlı,ağıldan kasıb, dildən iti, sudan ucuz çənədən boş, güldən ağır və s.

Bir az o arvadın ayağı sürüşkən, gözü dağınıq idi. Bir də ürəyi əyri olanın işi, hərəkəti düz ola bilməz (Rəhimov, 1970: 25). Naçalnikin kefi kök görünür (Rəhimov, 1970: 298). Murtuzov şüşə cingiltisindən bu ana qədər özünü kefi kök, damağı çağ aparır (Rəhimov, 1970: 348). Xatun oğlunun həmişə gözü-

könlü tox olmağını, artıq tamaha yol verib, öz adını ləkələməməyini, atası Murada layiq tərtəmiz bir oğlu olmasını ürək çırpıntılarıyla arzu edirdi (Rəhimov, 1970: 56)

Say mənasında işlənən idiomların tərkibində kiçik rəqəmlərdən tutmuş böyük rəqəmlərə qədər saylar iştirak edir. Məsələn: iki daş arasında, bir qarın çörəyə möhtac, altı-beş vurmaq, göyün yeddi qatına çıxmaq, yüz arxın suyunu bir arxa calamaq, bir ayağı bu dünyada, bir ayağı o dünyada, 3-də alacağım yox, 5-də verəcəyim və s.

O indi elə yaşdadır ki, belələri barəsində deyirlər: bir ayağı bu dünyadadır,bir ayağı o dünyada (Hüseynoğlu, 1993: 54). 3-də alacağım yox , 5-də verəcəyim (Hüseynoğlu, 1993: 60).

## Nəticə

İdiom- şirin dildir. Bu ifadələr qadın gözəlliyini, kişi ləyaqətini özündə əks etdirir. Ona görə də xalqımız tərəfindən sevilir, hər bir kəsin dilində işlənir, artır, çoxalır, nəsildən nəslə bir əmanət kimi ötürülür. Alimlər tərəfindən nə qədər tədqiq edilsə də həmişə öz aktuallığını saxlayır.

## Ədəbiyyat

1. Azərbaycan yazıçılarının əsərləri (1986) Bakı: Elm.
2. Bayramov, H. (1978) Azərbaycan dili frazeologiyasının əsasları. Bakı: Maarif nəşriyyatı
3. Barovkov, A.K. (1987) Priroda tureçkoqo izafeta, Akademiya Nauk. SSR akademiki N.N. Marri s. 165-177
4. Cəfərov S. (1958) Müasir Azərbaycan dilinin leksikası, Bakı ADU nəşriyyatı
5. Dmitriev N.K. (1987) Stroy tureçskiy yazıkov s. 259.262
6. Hüseynzadə, M. (1954) Müasir Azərbaycan dili Bakı: Elm 32.34
7. Hüseynzadə, M. (1951) Təyini söz birləşmələri Müasir Azərbaycan dili, sintaksis I kitab Bakı: MBM, s. 60
8. Hüseynoğlu, G. (1993) Seçilmiş əsərləri 1-ci cild Bakı: Azərnıəşr
9. İldırımoğlu, Ə. (1987) Həmin adam. Bakı. Yazıçı-1987. S.61
10. Mayzel, S.S. (1976) İzafetv tureçkom yazıke s. 259. 262
11. Mirzəliyeva, M. (1995)Türk dilləri frazelogiyasının nəzəri problemləri. Bakı 1995 s. 9.16
12. Murtazayev, C.M. (1958) Axundovun komediyalarının frazeologiyası. Azərbaycan Bakı: SSR E.A nəşriyyatı
13. Müasir Azərbaycan dilində söz birləşmələri, (1966) Bakı: Azərbaycan SSR EA nəşriyyatı Bakı, s. 18.29
14. Rəhimov, S. (1970) Seçilmiş əsərləri 4-cü cild Azərnəşr Bakı 1970 s. 25
15. Seyidov, Y. (1992) Azərbaycan dilində söz birləşmələri. Bakı Universiteti Nəşriyyatı 176

Göndərildi: 16.03.2022 Qəbul edildi: 19.04.2022

DOI: https://www.doi.org/10.36719/2663-4619/78/12-16

**Aygün Xanoğlan qızı İsayeva**
Bakı Slavyan Universiteti
filologiya üzrə fəlsəfə doktoru
aygun.isayeva@hotmail.com

# MÜASİR İNGİLİS DİLİNDƏ MODALLIQ KATEQORİYASININ ASPEKTLƏRİ

**Xülasə**

Məqalə ingilis dilində modallıq kateqoriyasının kiçik təsvirindən bəhs edir. Modallıq, ifadə ilə reallıq arasında müxtəlif əlaqələri ifadə edən qrammatik və semantik kateqoriyadır. Modallıq təbii dilin əsas kateqoriyalarına aid olan linqvistik anlayışdır. Müxtəlif qrammatik və leksik vasitələr, əhval-ruhiyyənin xüsusi formaları modallığı ifadə edə bilir. Modal fellər müxtəlif mənaları və ya hərəkətləri ifadə etmək üçün istifadə olunur, məsələn, xahiş, öhdəlik, sifariş, icazə və s. Modal fellərin istifadəsində müxtəlif ifadəlrin məna çalarlarının izahı böyük problemdir. İngilis dilində imkan modallığı leksik vasitələrlə ifadə olunur, lakin qrammatik vasitələr qədər geniş deyil.

Modallıq kateqoriyasına ənənəvi olaraq bu kateqoriyanın özəyini təşkil edən və danışanın reallığa münasibətini ifadə edən obyektiv modallıq və danışanın ifadəyə münasibətini vəinam dərəcəsini ifadə edən, ehtimalını müəyyən edən subyektiv modallıq daxildir. Modallıq dilin istifadə xüsusiyyətlərini təsvir edir, danışanla onun nitqi arasında əlaqə funksiyası daşıyan kateqoriyalara aiddir.

Beləliklə, modallıq danışanın dediyi sözə və onun obyektiv reallığa münasibətinin qiymətləndirməsini ifadə edən qrammatik-semantik kateqoriyadır.

***Açar sözlər**: modallıq, leksik vasitələr, imkan, modal sözlər, reallıq, imkan çalarları*

**Aygun Khanoglan Isayeva**

**Aspects of the modality category in modern English**

**Abstract**

The article deals with a small description of the category of modality in English. Modality is a grammatical and semantic category that expresses the various connections between expression and reality. Modality is a linguistic universal that belongs to the main categories of natural language. Various grammatical and lexical means and special forms of moods can express modality. Modal verbs are used to denote different meanings or actions, such as request, obligation, order, permission, etc. With all the different shades of meaning, the use of modal verbs is a huge problem. In English, the modality of possibility is expressed by lexical means, but not as widely as by grammatical ones.

The category of modality includes an objective modality that traditionally forms the core of this category and expresses the attitude of the delivered to reality, and a subjective modality that expresses the speaker's attitude to the message and the degree of confidence in the message, determines the probability of the validity of an opinion that reflects facts or a particular opinion. Modality describes the features of the use of language, not some features, qualities, or characteristics of the world, and refers to categories that have a connection function between the speaker and his speech.

Thus, modality is a grammatical-semantic category that expresses the speaker's attitude to what he says the assessment of the speaker's attitude to objective reality.

***Key words** : modality, lexical means, possibility, modal words, reality, shades of possibility*

## Giriş

Modallıq deyimlə gerçəklik arasındakı müxtəlif əlaqələri ifadə edən qrammatik və semantik kateqoriyadır. Modallıq, dilin əsas kateqoriyalarına aid olan linqvistik bir anlayışdır. İngilis dilində modallıq kateqoriyası elmi-nəzəri cəhətdən kifayət qədər öyrənilmişdir. Bu mövzuda həm fəlsəfi-məntiqi, həm də linqvistik mövqedən yazılmış əsərlər xeyli çoxdur. Bu vəziyyət ingilis dilinin beynəlxalq ünsiyyətdəki rolu ilə birbaşa bağlıdır.

Modallıq məntiq, semiotika və psixologiyanın nailiyyətlərinə əsaslanan bir çox dilçilərin tədqiqat obyektidir. Modal fellər müxtəlif mənaları və ya hərəkətləri ifadə etmək üçün istifadə olunur, məsələn,

xahiş, öhdəlik, əmr, icazə və s. Müxtəlif məna çalarları ilə modal fellərin istifadəsi ingilis dilində təhsil alan üçün böyük bir problemdir. Tələbələr modal feldən səhv istifadə edərlərsə, bu, onların ifadə məqsədini və ya tonunu dəyişəcək və onları kobud və ya etibarsız göstərəcək. Yadda saxlamaq lazımdır ki, modal fellərin bir çox istifadəsi də nitq mədəniyyətindən asılıdır. Modal fellərdən istifadə ingilis dilinin qrammatikasında ən problemli sahələrdən biridir. Modal fellərin bir çox mənası və onlardan istifadə etməyin bir çox yolu var.

Linqvistik ədəbiyyatda modallıq anlayışının müəyyənləşdirilməsi məsələsi mürəkkəb və mübahisəlidir. Birincisi, bu anlayışın kateqoriyalı mənsubiyyətinə dair müxtəlif fikirlər mövcuddur. İkincisi, modallıq anlayışının mürəkkəbliyi onun çoxsaylı cəhətləri ilə izah olunur.

Müasir ingilis dilində modallığı ifadə edən qrammatik və leksik vasitələr mövcuddur. Qrammatik vasitələr modal fellər və feli sifət formalarıdır. Modal fellər müəyyənliklə həmsöhbət olan fərziyyədən tutmuş, danışanın əmin olmadığı fərziyyəyə qədər müxtəlif modallıq çalarlarını çatdırır.

Leksik vasitələr də modal sözlərdir. Bəzi dilçilər modal sözləri müstəqil nitq hissəsi kimi hesab edirlər. Onların sintaktik funksiyası cümlənin baş üzvünün funksiyasıdır.

“Modallıq feli sifət formalarında da ifadə oluna bilər, ancaq bu kateqoriyalar kimi müəyyən edilməməlidir. Feli sifət – felin morfoloji kateqoriyası, modallığı ifadə edən vasitələrdən biridir, modallıq isəfeli sifətdən daha genişdir” (Arnold, 1966: 89).

Son 30 il ərzində modallıq və feli sifətin qrammatik kateqoriyalar kimi qəbul edildiyi bir çox əsərlər meydana çıxmışdı. Onların arasında Lyons, Coates, Palmer, Horn, Traugott, Sweetser, Warner, Bybee və s. əsərlərini görə bilərik.

Müasir ingilis dilində feli sifət kateqoriyası müxtəlif müzakirələrə və şərhlərə səbəb olmuşdur. Bu fikir ayrılıqlarına səbəbi olan amillər aşağıdakılardır:

1) feli sifət kateqoriyasının dəqiq tərifi yoxdur;

2) feli sifəti vurğulayarkən müxtəlif meyarlardan istifadə olunur (formal, semantik, funksional);

3) ənənəvi dillərin qrammatikasında latın, yunan və köhnə ingilis dilinin qrammatikasında oxşar feli sifət sistemlərindən istifadə olunur;

4) modal mənaları ifadə edən fel formalarının omonimliyi və çoxmənalılığı haqqında müxtəlif fikirlər mövcuddur.

Feli sifətin şifahi kateqoriyası qrammatikada modal mənaları qrammatik şəkildə ifadə edən müntəzəm təkrarlanan fel formalarının əhəmiyyətli qarşıdurması kimi nəzərdən keçirilir.

Dilçilikdə modallıq kateqoriyasında iki əsas yanaşma mövcuddur - geniş və dar modallıqdır. Modallıq geniş mənada danışanın hadisələrə münasibətini ifadə edən cümlə kateqoriyası kimi şərh olunur. Modallığa belə yanaşma russünaslıq üçün xarakterikdir və onu V.V.Vinoqradovun və onun tərəfdarlarının əsərlərində görmək olar. Duyğuları ifadə etmək və təsvir etmək olar, lakin modallığı təsviri şəkildə çatdırmaq mümkün deyil. (Vinoqradov, 1950: 38)

Modallıq çoxşaxəli hadisədir və ona görə də dilçilik də bu hadisənin mahiyyəti haqqında müxtəlif fikirlər söylənilir. Bildiyiniz kimi, modallığı iki növə bölmək artıq ənənəvi hal almışdır: obyektiv və subyektiv. Birincisi deyimin qrammatik cəhətdən rəsmiləşdirilmiş ekstralinqvistik reallığa münasibəti, ikincisi danışanın (yazıçının) məruzə etdiyinə münasibətinin ifadəsi kimi başa düşülür. Tədqiqatçılar qeyd edirlər ki, obyektiv modallıq istənilən ifadə üçün məcburidir, subyektiv isə istəyə bağlıdır.

Modallıq qrammatik və leksik vasitələrlə (modal söz və hissəciklər, intonasiya) ifadə olunur. Bildiyiniz kimi, modallığın bölünməsinin müxtəlif prinsipləri var, lakin ənənəvi modallığ üç növə bölünür: obyektiv, subyektiv və törəmə modallıq.Obyektiv modallıq reallığa bildirilən münasibətin ifadəsidir. Obyektiv modallığı ifadə edən qrammatik vasitələr - zaman kateqoriyası, müxtəlif intonasiya növləridir.

Bundan əlavə, dilçilər subyektiv modallığı fərqləndirirlər: mesajla danışan şəxsin münasibətinin ifadəsi (etimad və ya qeyri-müəyyənlik, razılıq və ya fikir ayrılığı, ifadəli qiymətləndirmə). Subyektiv modallığı ifadə edən dil vasitələri bunlardır - söz sırası, intonasiya, leksik təkrarlar, modal söz və hissəciklər, giriş söz və ifadələr, giriş cümləl əridir.

Obyektiv modallıq istənilən ifadənin məcburi əlamətidir və predikativ vahid (cümlə) təşkil edir. Obyektiv modallıq ifadənin reallığa münasibətini reallıq/qeyri-reallıq baxımından ifadə edir. Obyektiv-modal mənalar cümlənin qrammatik paradiqmasında aşkar olunaraq predikat şəklində “yerləşdiyindən” bəzi alimlər obyektiv modallığı ilkin modallıq adlandırırlar. Obyektiv modallıq reallıq baxımından

bildirilənin reallıqla əlaqəsini ifadə edir, zaman kateqoriyası ilə əlaqələndirilir və müvəqqəti müəyyənlik - qeyri-müəyyənlik əsasında fərqləndirilir. Zamanın və anında baş verən hadisənin mənasına - irreallıq birləşir; bu mənaların kompleksinə obyektiv-modal mənalar deyilir. Obyektiv modallıq zaman kateqoriyası ilə bağlıdır və müvəqqəti müəyyənlik - qeyri-müəyyənlik əsasında fərqləndirilir.

Subyektiv modallıq, bəzən ikinci modallıq da adlanır. Onun semantik əhatə dairəsi obyektiv modallığın semantik dairəsindən xeyli genişdir. Qeyd etmək lazımdır ki, subyektiv modallıq kateqoriyası dilin antroposentrik xüsusiyyətini ehtiva edir ki, bu da konseptual başlanğıcın real və qeyri real informasiya fonunda ziddiyyətlə özünü göstərir.

Zolotova G. A. obyektiv və subyektiv modallıqları fərqləndirməklə yanaşı, qeyd edir ki, cümlənin modallığı ifadənin məzmununun etibarlılığı, reallığı, reallığa uyğunluğu və ya qeyri-uyğunluğu baxımından subyektiv-obyektiv münasibətidir, eləcə də cümlənin modal xüsusiyyətlərinə görə əhəmiyyət kəsb etməyən leksik modallıq hərəkət və onun subyekti arasındakı əlaqədir. (Zolotova, 2004: 544)

Bir çox alimlər obyektiv və subyektiv modallıqları da fərqləndirirlər. "Obyektiv modallıq reallıqda obyektiv şəkildə mövcud olan münasibətləri - obyektiv səbəblərə görə zərurət və ya imkan münasibətlərini əks etdirən modallıqdır. Subyektiv modallıq yalnız hansısa hərəkətin və ya vəziyyətin zəruriliyi, mümkünlüyü və ya ehtimalı haqqında danışanın fikrini əks etdirir". (Bazalina, 2001: 38)

Modallıq kateqoriyası problemi ilə bağlı müxtəlif müəlliflərin fikirlərini yekunlaşdıraraq və müxtəlif modallıq növləri üçün ifadə vasitələrinin paylanmasını təhlil edərək, iki növ modallığı daha da alt qruplara bölməklə ayırırıq:

“-obyektiv və ya subyektiv modallıq;
- həqiqi və ya qeyri-həqiqi (yalan) modallıq;
- real və ya qeyri-real modallıq;
- arzuolunan və ya arzuolunmaz modallıq;
- ehtimal olunan və ehtimal olunmaz modallıq;
- zəruri və ya qeyri-zəruri modallıq;
- vacib və ya qeyri-vacib modallıq;
- zaman modallığı.

Göstərilənlərdən əlavə, subyektiv modallığın daha bir neçə yarım qruplarını göstərmək olar:
- əminlik və ya inamsızlıq bildirənlər;
- müəyyənlik və ya qeyri-müəyyənlik bildirənlər;
- ekspressivlik, gücləndirmə və ya zəiflətmə mənası bildirənlər.

Subyektiv modallığın müxtəlifsistemli dillərdə ifadə vasitələri dəzəngindir. Belə ki, subyektiv modallıq intonasiya ilə, söz sırası ilə, sintaktik təkrarlarla, intensivlik və sürət bildirən xüsusi konstruksiyalarla, ədat, modal sözlər, ara sözlər və ara cümlələrlə ifadə oluna bilər. Lakin, subyektiv modallıq münasibətlərini doğuran əsas vasitə modal sözlər hesab olunur” (Cahangirov, 2005: 281).

Modallığın birinci yarımnövlərinin qrammatik spesifikliyi ondadır ki, o, bütün cümlənin modal xarakteristikasını vermir, yalnız cümlə daxilindəki münasibətləri verir və hərəkəti hələ tamamlanmamış kimi ifadə edir, ehtimal istisna edilmir.

Modallığın ikinci alt növünün spesifikliyi ondan ibarətdir ki, natiqin roluna böyük əhəmiyyət verilir, çünki burada danışanın etimad, şübhə və ya qeyri-müəyyənlik dərəcəsi reallığa dair bütün ifadənin məzmununa münasibətdə ifadə olunur.

Modallıq, V.V Vinoqradovun konsepsiyasında cümlənin məzmununun qrammatik ifadəyə malik gerçəkliyə münasibəti kimi başa düşülür; semantik mahiyyətinə görə modallıq kateqoriyası ilə əlaqəli olan və ya ola biləcək halların, təcrübələrin, münasibətlərin, iradi istəklərin, keyfiyyət qiymətləndirmələrinin xarakterik xüsusiyyəti kimi...” (Vinoqradov, 1950: 66).

G.V. Kolşanskinin fikrinə görə, reallıq, imkan, zərurət mənalarını modal hesab etmək lazımdır, çünki “öz təbiətinə görə cümlənin modal məzmunu reallığın əksi kimi, düşüncənin mövcudluğunun “modusu” (ədat) tərəfindən götürülən bir fikir, real hadisədir (imkan, reallıq, zərurət)”.Bu konsepsiyanın müəllifi qeyd edir ki, Hind-Avropa dillərində (o cümlədən rus dilində) modal məzmun qrammatik (morfoloji), leksik (modal sözlər, modal fellər) və intonasiya vasitələri ilə ifadə olunur (Kolşanskiy, 1961: 97).

Qeyd etmək lazımdır ki, modallıq istər qrammatik, istər leksik, istərsə də intonasiya səviyyəsində, ya da bütövlükdə ifadənin bölmələrində həyata keçirilir və müxtəlif icra yollarına malikdir. Modallıq müxtəlif qrammatik və leksik vasitələrlə ifadə olunur: feli sifətin xüsusi formaları ilə, modal fellərlə

(məsələn, *can, must*;), digər modal sözlərlə (məsələn, *perhaps, likely*) və intonasiya vasitəsi ilə. Bir çox dillərdə qrammatik olaraq modallığın mənalarını müxtəlif yollarla ifadə edirlər.

İngilis dilində modallığı ifadə edən leksik vasitələrə aşağıdakılar daxildir:

Certainly, indeed, perhaps, happily — unhappily
of course, evidently, maybe, luckily — unluckily
no doubt, naturally, probably, fortunately — unfortunately
surely, obviously, possibly
assuredly, actually - undoubtedly

Modal sözlər mənalarına görə reallıq faktlarına ifadə etdikləri subyektiv münasibətdən asılı olaraq aşağıdakılara bölünə bilər:

1) təsdiq ifadə edən sözlər;
2) fərziyyə ifadə edən sözlər;
3) ifadənin məzmununun arzuolunan və ya arzuolunmazlığı baxımından subyektiv qiymətləndirilməsini ifadə edən sözlər.

Hər bir qrup daxilində modallığı ifadə edən leksik vasitələr mənaca bir-birinə yaxın olsa da, eyni zamanda, onların hər biri öz çalarlarını ifadə edir və ya eyni semantik qrupun digər leksik vasitələrindən nitqdə işlənməsinə görə fərqlənir.İngilis dilindəki leksik vasitələrin əksəriyyəti zərflərdən yaranır və *-ly* şəkilçisi olan hərəkət tərzi zərfləri ilə üst-üstə düşür, buna görə də modal sözlər çox vaxt zərflərə və hissəciklərə işlədilir, ona görə də birinci ilə sonuncu arasında fərq bəzən çətin olur, məsələn: (Our success is really small. — I listened: indeed it was a voice.)

Məlumdur ki, ingilis dilində modallığı ifadə edən leksik vasitələr inam, şübhə, fərziyyə, cümlədə deyilənlərə müsbət və ya mənfi qiymət verilməsi, müəllifin öz ifadəsinə münasibətini bildirir.Modal sözlər sadə (***sure***, ***perhaps***), törəmə (***surely***, ***naturally***, ***really***) və mürəkkəb (***maybe***, ***to besure***)ola bilər. Ən çox istifadə olunan leksik vasitələr bunlardır:

1) məlumatın etibarlılığına dair şübhə və fərziyyə, qeyri-müəyyənlik ifadə edən modal sözlər: *maybe, perhaps, possibly, probably*bu modal sözlər sinonim kimi çıxış edərək sinonim qruplar əmələ gətirir.Məsələn, *maybe, perhaps* sözləri qeyri-müəyyənlik (şübhə) anlayışını ifadə edir, lakin çox vaxt ümid, ehtimal çalarlarını ifadə edə bilər, məsələn:

*It's all right. — Murry smiled. — Maybe up there i'll find what i am looking for.*
*Perhaps he will be here at nine o'clock tomorrow.*

Bəzi müəlliflər fərziyyə kateqoriyası əvəzinə imkan kateqoriyasını təqdim edirlər. İki dildə eyni olan və nitqdə istifadə olunduqda imkan çalarlarını ötürməyə qadir olan leksik vasitələrlə ifadə olunur. Bunlara *maybe, perhaps, certainly, probably* aiddir.

2) təz hərəkət və ya bəyənməmə ifadə edən modal sözlər: *fortunately, unfortunately, luckily, unluckily, happily, unhappily,* məsələn*: Unfortunately, the weather was bad*

3) intensivləşməni bildirən modal sözlər: *really,* məsəslən*:I really don't know what's to be done;*

Öz növbəsində, M. V. Zaynullin qeyri-reallığı əks etdirən modallığı aşağıdakı alt qruplara bölür:

1. əhəmiyyət və zərurət bildirən modallıq (Debitival);
2. mümkün və qeyri-mümkünlük bildirən modallıq (Potensial);
3. fərziyyələrin və şübhələrin modallığı (Hipotetik);
4. sifariş bildirən modallıq (İmperativ);
5. niyyəti ifadə edən modallıq (Intensional);
6. istəkləri ifadə edən modallıq (Optative)(Zaynullin, 1986: 123).

A.A. Xudyakov modallıq kateqoriyalarının aşağıdakı təsnifatını vermişdir: "obyektiv modallıq aleotik (apodiktik, assertorik) və deontikdir; subyektiv modallıq – epistemik və aksiolojidur. A.A Xudyakova görə, obyektin əlaməti və keyfiyyəti insana xas ola da bilər, olmaya da bilər. Məsələn, cümlələrdə:*Alex is a talented pupil; The weather is good; The bus go* away subyektə və obyektə malik olduqları keyfiyyət və xüsusiyyətlərlə işarələnir. Bu cür mühakimələrin modallığına assertorik modallıq deyilir(Xudyakov, 2010: 256).

Apodiktik (yunanca məntiqi dəyər, təkzibedilməz) və iddialı (latınca təsdiq) obyektiv reallığı əks etdirdikdə və subyektiv amillərdən asılı olduqda birləşdirilə bilər. Apodiktik və təsdiqedici modallıq obyektiv modallığın alt növləridir.

Obyektiv modallığın başqa bir növü deontik adlanır. Deontik modallıq (yunan sözü deontologiyadan götürülmüş, vəzifə haqqında elm deməkdir) - cəmiyyətin, sosial qrupların müəyyən etdiyi normalardan ibarətdir. Belə normalar iki növ ola bilər: hüquqi və etik. Onlar xronoloji olaraq birinci (hüquqi) və ikinci (etik) olandan sonra yaranır, yəni dövlət yarandıqdan sonra hüquq normaları müəyyən edilir. Deontik modallığa misal olaraq aşağıdakı cümlələri göstərmək olar: *Man must be honest. - Hər kəs dürüst olmalıdır. Children ought to respecttheir parents. - Uşaqlar valideynlərinə hörmət etməlidirlər.*

Bu iki növ obyektiv modallığın təhlili göstərir ki, "təbiət qanunlarına və obyektiv reallığa əsaslanan aletik modallıq insanlar və cəmiyyət tərəfindən işlənib hazırlanmış və müşahidə edilən normalardan ibarət olan deontik modallıqdan əsaslı şəkildə fərqlənir. Deontik modallıqda norma və qanunlar insanlar və cəmiyyət tərəfindən yaradılır və tənzimlənir, aletik modallıqda isə yalnız obyektiv reallıq dərk edilir"(Krılova, 2004: 442).

İkinci növ modallıq subyektiv modallıqdır. Subyektiv modallıq danışanın ifadə olunan fikrə və ya ifadəyə münasibətini bildirir. Subyektiv modallığın epistemik və aksioloji alt tipləri vardır. Epistemik modallıq vəziyyətində (yunan sözü, qavrayış elmi mənasını verir) danışan nitq haqqında fikirlərini bildirir. Bu vəziyyətdə, məsələn, aşağıdakı ifadələr istifadə olunur: *I know that…, I believe that…, I am sure that…, və s.*

**Nəticə**

Beləliklə, müasir ingilis dilində modallıq qrammatik, leksik və intonasiya səviyyələrində müxtəlif ifadə vasitələrinə malikdir. Modal fellər (can, may, must və s.), modal sözlər (perhaps, surely, certainly), fonetik vasitələrlə (intonasiya və vurğu) ifadə edilə bilər.

Yuxarıda deyilənləri ümumiləşdirərək belə nəticəyə gəlmək olar ki, modallıq çoxşaxəliliyinə, linqvistik ifadənin spesifikliyinə və funksional xüsusiyyətlərinə görə hələ də tam izahını almamışdır.

**Ədəbiyyat**

1. Arnold, İ. V.(1966),Semantiçeskaya struktura slova v sovremennom anqliyskom yazike I metodike yeye isledovaniya,Leninqrad: Prosvesheniye,— 192 s.
2. Vinoqradov, V.V. (1950) O kateqorii modalnosti I modalnıx slovax v russkom yazıke, V kn.: Trudı instituta rsskoqo yazika, т. 2., Moskva: İzd-vo ANSSSR, c.38-79
3. Axmanova, O.S. (1966) Linqvistiçeskiy slovar, Moskva: Sovetskaya ensikloediya,608 s.
4. Zolotova, Q. A. (2004) Kommunikativnaya qrammatika russkoqo yazıka, Moskva: Nauka,544 s.
5. Bazalina,E. N. (2001) Semantiko-sintaksiçeskiye sredstva vırajeniya modalnosti v xudojestvennom tekste (sopostavitelnıy analiz nemetskoqo i russkoqo yazıkov),Avtoref. Diss. Kand. Filolk. Nauk. Krasnodar: 38 s.
6. Cahangirov, F.F. (2005) İngilis və Azərbaycan dillərində modallığın struktur-semantik tədqiqi, Bakı:Elm, 281 s.
7. Kolşanskiy, Q. V. (1961) K voprosu o soderjanii yazıkovoy kateqorii modalnosti // Voprosı Yazıkaznaniya, Moskva:№ 1.б s. 94-98
8. Zaynullin, M. V. (1986) Modalnost kak funksionalno-semantiçeskaya kateqoriya, Saratov: İzd-vo Sarat. Un-ta,123 s.
9. Xudyakov, A.A. (2010) Teoretiçeskaya qrammatika anqliyskoqo, Moskva:Liya, 256 s.
10. Krılova, İ. P. Qordon E.M. (2004) Qrammatika sovremennoqo anqliyskoqo. (A Grammar of Present-day English), Moskva: Knijniy dom Universitet, 442 s.
11. Yefimova, N.V. (1954) Modalnıye slova v sovremennom anqliyskom. Kand. Dissertasiya, Moskva:259 S.
12. Uşakov, D.N. (2007) Tolkovıy slovar, Moskva: AST, 912 s.
13. https://englex.ru/modal-verbs-in-english/
14. https://study-english.info/modal.php
15. https://danefae.org/pprs/vvv0/biblio.htm

Göndərildi: 24.03.2022 Qəbul edildi: 27.04.2022

DOI: https://www.doi.org/10.36719/2663-4619/78/17-23

**Emin Gündüz oğlu Babayev**
Bakı Dövlət Universiteti
dissertant
emin.babayevvv@gmail.com
**Məleykə Nəsib qızı Bayramova**
Bakı Dövlət Universiteti
hüquq üzrə fəlsəfə doktoru
maleyka-bdu@mail.ru

# XARİCİ ÖLKƏLƏRİN CİNAYƏT QANUNVERİCİLİK TARİXİNDƏ SEKSUAL XARAKTERLİ ZORAKILIQ HƏRƏKƏTLƏRİNƏ GÖRƏ MƏSULİYYƏT MƏSƏLƏSİ

**Xülasə**

Seksual cinayətlərə görə məsuliyyət məsələsi barədə xarici ölkələrin qanunvericiliyinin tarixi araşdırılaraq müqayisə edilmişdir. Belə məlum olur ki, seksual xarakterli cinayət əməllərinə görə məsuliyyət məsələsi müxtəlif dövrlərdə müxtəlif dövlətlərdə müxtəlif qaydada nəzərdə tutulmuşdur. Fransanın, İspaniyanın, Almaniyanın nəzərdən keçirilmiş cinayət məcəllələrindən fərqli olaraq, İsveçrə Cinayət Məcəlləsi zorlama və seksual xarakterli zorakılıq əməllərini nəzərdə tutan cinayətləri aydın bir şəkildə fərqləndirir. İngiltərə qanunvericiliyində seksual xarakterli zorakılıq hərəkətlərinin müstəqil anlayışı yoxdur, belə hərəkətlər zorlama anlayışı ilə əhatə edilir. Müttəfiq respublikalar içərisində yalnız Ukrayna (118-ci mad.), Moldoviya (103-1-ci mad.) və Estoniya (115-ci mad.) respublikalarının CM-lərində cinsi cinayətlər konkretləşdirilərək uşaqbazlıq müstəqil tərkib kimi nəzərdə tutuldu. Məlum olur ki, seksual xarakterli cinayət əməllərinə görə məsuliyyət məsələsi müxtəlif dövrlərdə müxtəlif dövlətlərdə müxtəlif qaydada nəzərdə tutulmuşdur. Lakin belə hal hər bir dövlət daxilində bu qisim cinayət əməlləri ilə səmərəli mübarizə işinə xələl gətirmir.
***Açar sözlər:*** seksual cinayətlər, homoseksual münasibətlər, zorlama, uşaqbazlıq, zorakılıq

**Emin Gunduz Babayev**

**Responsibilty for sexual violence in the history of foregin criminal law**

**Abstract**

The history of foreign legislation on liability for sexual crimes has been studied and compared. It turns out that the issue of liability for sexual offenses has been considered differently in different countries at different times. Unlike the criminal codes of France, Spain, and Germany, the Swiss Criminal Code clearly distinguishes between crimes of rape and sexual violence. There is no independent definition of sexual violence in English law, such acts are covered by the concept of rape. Among the Allied republics, only the CCs of Ukraine (Article 118), Moldova (Article 103-1) and Estonia (Article 115) specified sex crimes and considered child molestation as an independent component. It turns out that the issue of liability for sexual offenses has been considered differently in different countries at different times. However, this does not affect the effective fight against this type of crime within each state.
***Key words:*** *sexual crimes, homosexual relations, rape, child molestation, violence*

## Giriş

İlk öncə qeyd etmək lazımdır ki, nəzəri ədəbiyyatın təhlili göstərir ki, müxtəlif dövlətlərin cinayət qanunvericiliyi tarixində seksual cinayətlərə görə məsuliyyət məsələsi eyni qaydada nəzərdə tutulmamışdır. Bu, əsasən, bu və ya digər hakim təbəqənin cinayətlərin bu kateqoriyasına baxışlarının dəyişkənliyi və dünyəvi qanunvericiliyə (xüsusilə orta əsrlərdə) güclü təsiri olan dini baxışların müxtəlifliyi ilə bağlıdır. Ən çox yayılmış cinsi cinayət homoseksuallıq olub. "Homoseksuallıq" sözü yunan mənşəlidir və ümumi mənada eyni cinsdən olan insanlar arasında cinsi əlaqəni ifadə edir. "Homoseksuallıq" termininin özü ilk dəfə 1869-cu ildə macar həkim Benkkerverth tərəfindən istifadə edilmişdir.

Qədim Yunanıstanda homoseksual münasibətlərə baxışlara nəzər salarkən bəlli olur ki, qadınlar arasında cinsi əlaqə Yunan akut adından sonra lezbiyan sevgisi lesbos adlanırdı və bu cür münasibətləri e.ə.7-6-cı əsrlərdə yaşamış şairə Sapponun adı ilə də sapfizm adlandırırdılar.

Pederastiya (uşaqbazlıq) bir sosial hadisə kimi qədim Romada da mövcud idi, baxmayaraq ki, Yunanıstandakı kimi çox yayılmadı. Tarixi sübutlar var ki, e.ə. VI əsrdə romalılar oğlanları sevgi üçün alırdılar. Rəsmi olaraq belə münasibətlər yalnız romalı olanlar arasında qadağan edilirdi, qul, hərbi əsirlər, yaxud xaricilərlə isə yol verilirdi (7, 184-185).

Homoseksual münasibətlər Qədim Şərq xalqları - Finikiyalılar, Suriyalılar, Babillilər, Assuriyalılar, Liviyalılar, Hindular arasında da mövcud olmuşdur. Bununla belə, məhz zorakı üsullarla cinsi istəkləri təmin etmək qadağan edilirdi və repressiyaya məruz qalırdı (19, s.12).

Tədricən əhalinin mədəniyyətinin yüksəlməsi, monoqam ailə və nikah institutlarının inkişafı ilə homoseksual münasibətlərə baxışlar dəyişdi, onların həyata keçirilməsinin müəyyən formalarına məhdudiyyətlər qoyulmağa başladı.

e.ə. III əsrdə homoseksuallığı pozğunluğun bir növü kimi qadağan edən Skatinius Qanunu (e.ə. 226) qəbul edildi. Analoji olaraq məntiqi qadağalar Manu qanunlarında və Busido Məcəlləsində də öz əksini tapmışdır.

Xristianlığın yayılması ilə əlaqədar olaraq homoseksuallığa qarşı münasibət daha dözümsüz olmağa başladı. Hər şeydən əvvəl, bu onunla əlaqədar idi ki, kilsənin əsas kitabları nəsil vermə prinsipini, yəni "yaşamaq və nəsil artırmaq" kimi bir prinsipi elan edirdi. Nəsil artırmağa yönəlməyən hər hansı cinsi əlaqə günah sayılırdı. Belə ki, 390-cı ildə imperatorlar Valentin və Teodosiusun fərmanı ilə homoseksual münasibətlər üçün odda yandırma cəzası olaraq ölüm cəzası təyin edildi. Bu Fərmanda deyilirdi ki, "Bütün fəzilətlərin atası olan Roma qadına xas insanların doğulması və milli şücaətin zəifləməsi ilə gözdən salınmamalı və hər bir şəxs bədənin ruhun müqəddəs məbədi olduğunu unutmamalıdır" (22,s.307).

b.e. VI əsrdə Konstantinopolda İmperator Yustinian Konstantinopol vətəndaşlarına müraciətində homoseksuallığı ciddi olaraq pisləmiş və 538-ci ildə cinsi rolundan asılı olmayaraq homoseksuallığa görə məhkum olunanların hamısına cəzanı ağırlaşdırmış, qeyd olunan əməlləri törətməkdə davam edənləri isə qanunsuz və allahsız hərəkətlər etdiklərinə görə tutmağı əmr etmişdir (11, s.143). Uşağa, qadına və ya başqasına təcavüzlər, həmçinin zina da cəzalandırılırdı (4, s.39-76).

Qeyd etmək lazımdır ki, xristian doktrinası uşaqbazlıq kimi əməllərin hüquqi tənzimlənməsinə əhəmiyyətli təsir göstərdi: əsas diqqət nikah institutunun qorunmasına yönəldildi, buna görə də kilsə tərəfindən təqdir olunmayan bütün cinsi əlaqələr günahkar elan edildi. Xüsusilə cinsi zorakılıq ciddi şəkildə pisləndi və kilsə bu məsələdə barışmaz mövqe tutdu ki, bu da o dövrün qanunlarında öz əksini tapmışdır. Eyni zamanda, orta əsrlərdə, o cümlədən xristianlar arasında homoseksuallıq qədim dövrlərlə müqayisədə heç də az yayılmamışdı. Təsadüfi deyil ki, 1232-ci ildə Roma Papası IX Qriqori xüsusi müraciətində Avstriya ruhanilərini homoseksualları eretiklər ilə eyniləşdirərək, bu pisliyə qarşı mübarizə aparmağa çağırmışdı.

Almaniyada "Karolina" Cinayət Məcəlləsi "insanın heyvanla, kişinin ilə kişi ilə, qadının qadınla belə hərəkət edərsə" yandırılaraq edam edilməsini nəzərdə tuturdu. Eyni zamanda qadın homoseksuallığından ayrıca bəhs edilərək ilk dəfə olaraq buna görə qanunnamədə məsuliyyət müəyyən edildi (20,s.68).

Bu qisim əməlləri məhdudlaşdırmaq cəhdlərinə baxmayaraq, daha çox şəxslər, hətta ruhanilər arasında yayılmağa başlamışdı. Belə ki, Fransada, 1581-ci ilin statistik məlumatlarına görə, kilsə nazirləri ilə birlikdə ruhanilərin ümumi sayı 1018.782 idi ki, onlardan 39.583-ü sodomitlər (homoseksuallar) olmuşlar (21,s.605).

XVII əsrdən başlayaraq, bəzi ölkələrdə homoseksual münasibətlərin hüquqi tənzimlənməsində repressiyaların yumşaldılması müşahidə edilir, belə münasibətlərə könüllü olaraq daxil olanlara qarşı isə cəzalandırmaya yol verilmirdi. Belə ki, 1887-ci il Avstriya Məcəlləsi homoseksuallığa görə həbsi nəzərdə tuturdu. Prussiya qanunvericiliyi könüllü homoseksuallığı dörd ildən səkkiz ilədək müddətə azadlıqdan məhrum etmə cəzası ilə cəzalandırırdı. O dövrdə dünyanın ən yaxşı hesab edilən və digər məcəllələrə nümunə olan 1810-cu il Napoleon Cinayət Məcəlləsi yalnız analoji əməllər yetkinlik yaşına çatmayanlara qarşı, yaxud zorakılıqla törədildikdə və ya "ictimai həvəsləndirməyə səbəb olduqda" məsuliyyət müəyyən edirdi. Qanunun dördüncü bölməsində "Əxlaqın pozulması" (Attentats aus moeurs) norması"zorlama" və "seksual xarakterli zorakılıq hərəkətləri" anlayışlarını bir-birindən

ayırmırdı, lakin onları əsas anlayışa - "zorlama"ya aid edirdi. Eyni zamanda, “hər hansı digər əxlaqsız hərəkətə” görə də cəza nəzərdə tutulurdu (18, s. 199-202).

Tarixin həmin dövrlərində homoseksuallığa qarşı mübarizə tədbirlərinin uyğunsuzluğu və ziddiyyətli olması hüquq sistemində böhrana səbəb oldu. Bu cür tədbirlər tədricən geniş ictimaiyyətin haqlı hiddətinə və etirazına səbəb olmağa başladı. Bunda kapitalist münasibətlərinin tərəfdarları olan humanistlərin bəyanatları mühüm rol oynadı. Onlardan biri də “Cinayət və cəza haqqında” əsərində orta əsr qanunvericiliyinin cinayət hüququ normalarının açıq şəkildə qəddar xarakterini tənqid edən və homoseksuallığın səbəblərini aradan qaldırmağın onu cəzalandırmaqdan daha yaxşı olduğunu qeyd edən Çezare Bekkariya idi (3, s.11).

Bu müddəa şübhə doğurmur, çünki hər hansı mübarizə tədbirlərinə, hətta cəzalandırıcı və repressiv tədbirlərə baxmayaraq, homoseksuallıq mövcud olmaqda davam edir və bu sosial pisliyin heç bir cəza və ya sıxışdırılması sistemi onunla bağlı problemləri həll edə bilməmişdir.

Beləliklə, sosial hadisə kimi homoseksuallığın tarixi inkişafının müxtəlif mərhələlərində ayrı-ayrı ölkələrdə ona münasibətin xüsusiyyətlərinin təhlili göstərir ki, bu fenomenlə mübarizədə amansız, ölüm hökmünə qədər, qadağanedici vasitələrdən istifadə edilməsinə baxmayaraq, ondan yaxa qurtarmağa və ya onun kəmiyyətcə hər hansı nəzərəçarpacaq dərəcədə azalmasına səbəb olmaq mümkün olmamışdır.

Hazırda qüvvədə olan kontinental hüquq ölkələrinin qanunvericiliyində yalnız seksual xarakterli zorakılıq hərəkətlərə görə məsuliyyət nəzərdə tutulur. Belə ki, Fransanın 1992-ci il Cinayət Məcəlləsində belə əməllərə görə məsuliyyət “Şəxsiyyətin fiziki və ya psixi toxunulmazlığına qarşı törədilən əməllər” adlı II fəslin “Seksual təcavüz” adlanan 3-cü bölməsində nəzərdə tutulmuşdur. Fransa Cinayət Məcəlləsinin 222-22-ci maddəsində cinsi təcavüzü təşkil edən cinayətlərdən bəhs edilir. Göstərilən normada deyilir: “Seksual aqressiya - zorakılıq, məcburiyyət, hədə və ya aldatma yolu ilə həyata keçirilən hər hansı cinsi zorakılıq nəticəsində olan seksual qəsddir” (12,s. 197).

Xarici ölkələr ədəbiyyatında seksual aqressiyaların üç qrupu müəyyənləşdirilir: a) ağırlaşdırıcı hallar olmadan və ya belə hallarla törədilən zorlama; b) digər seksual təcavüzlər; c) seksual təqib etmə (13, s. 257).

Seksual zorakılığın istənilən forması, cinayətkarın və qurbanın cinsindən asılı olmayaraq, Fransa cinayət qanunvericiliyində seksual təcavüz hesab edilir.Fransanın Cinayət Məcəlləsinə əsasən, hər hansı bir cinayətkar tərəfindən qadına və ya kişiyə qarşı “per os” və “per anum” şəklində cinsi xarakterli zorakılıq hərəkətləri seksual təcavüz olaraq zorlama kimi qiymətləndirilir. Qadının başqa qadına qarşı seksual zorakılığı, habelə davranışın seksual motivasiyası ilə bağlı hər hansı digər zorakı hərəkətlərin törədilməsi isə “digər seksual təcavüzlər” kimi qiymətləndirilir.

İspaniyanın 1995-ci il Cinayət Məcəlləsi şəxsin cinsi azadlığını müdafiə edərək, seksual cinayətlərə “Cinsi azadlığa qarşı cinayətlər” adlı VIII bölməni aid edir: 1-ci fəsil “Seksual təcavüz haqqında”, 2-ci fəsil “Seksual sui-istifadələr barədə”, 3-cü fəsil “ Seksual xarakterli təqiblər”, 4-cü fəsil “Fahişəliklə bağlı cinayətlər” və 5-ci fəsil “Əvvəlki fəsillərə dair ümumi müddəalar” adlanır (13, s.258).Cinsi aqressiyanı penetrasiya kimi izah edən İspaniya Cinayət Məcəlləsi bunu kişi cinsiyyət orqanının başqa şəxsin təbii boşluqlarına daxil edilməsi, habelə seksual məqsədlə təbii boşluqlara digər əşyaların daxil edilməsi kimi nəzərdə tutur. Belə ki, İspaniyanın Cinayət Məcəlləsinə əsasən, cinsi təcavüzün subyekti həm kişi, həm də qadın ola bilər.

Fransa Cinayət Məcəlləsi kimi, İspaniya Cinayət Məcəlləsi də “cinsi azadlıq” və “cinsi toxunulmazlıq” anlayışlarını fərqləndirmir. Bu anlayışlara 181 və 182-ci maddələrdə sadalanan şəxslər malikdirlər, yəni on iki yaşına çatmamış, ağıldan məhrum, psixi pozğunluqlardan əziyyət çəkən, xüsusilə yaşa, xəstəliyə görə psixi pozğunluqları olan şəxslər.

Almaniyanın Cinayət Məcəlləsində seksual cinayətlərə görə məsuliyyət “Cinsi özünü müəyyənlik əleyhinə olan cinayət əməlləri” adlı 13-cü bölmədə nəzərdə tutulmuşdur.

Qeyd edək ki, Almaniya Federativ Respublikasının 31 may 1994-cü il tarixli 29 saylı qanunu homoseksual hərəkətlərə görə cinayət məsuliyyətini Cinayət Məcəlləsindən çıxarmış və törədilmə formasından asılı olaraq zorlama ilə seksual xarakterli digər zorakılıq hərəkətləri arasında sərhəd çox aydın şəkildə müəyyən edilmişdir.Zorlama cinsi əlaqə və ya buna bənzər cinsi fəaliyyətlər, ilk növbədə nüfuz etmə kimi müəyyən edilir. Bu cinayətin qurbanı qadın və ya kişi ola bilər. Bu fakt həm də onu göstərir ki, kontinental ölkələrin cinayət qanunvericiliyində törədilmə formalarından asılı olmayaraq zorakı xarakterli seksual cinayətləri nəzərdə tutan tərkiblərin birləşdirilməsi tendensiyası mövcuddur.Fransa və İspaniyanın Cinayət Məcəlləsi kimi, Almaniyanın Cinayət Məcəlləsində də bu

cinayət tərkiblərinin ağırlaşdırıcı halları mövcuddur. Almaniya və Rusiya CM-ni müqayisə etsək, deyə bilərik ki, zorlama cinayət əməlinin ağırlaşdırıcı tərkib əlamətləri oxşardır.

Fransanın, İspaniyanın, Almaniyanın nəzərdən keçirilmiş cinayət məcəllələrindən fərqli olaraq, İsveçrə Cinayət Məcəlləsi zorlama və seksual xarakterli zorakılıq əməllərini nəzərdə tutan cinayətləri aydın bir şəkildə fərqləndirir. Belə ki, 189-cu maddədə əməl belə nəzərdə tutulur: şəxsi birlikdə yaşamaya bənzər hərəkətlərə və ya digər seksual hərəkətlərə məcbur etmə (14,s.70). Bu cinayətin subyektinin həm kişi, həm də qadın olduğunu müəyyən edir. 190-cı maddə isə qeyd edir ki, zərərçəkən qismində yalnız qadın çıxış edə bilər. Eyni zamanda, İsveçrə Cinayət Məcəlləsinə əsasən, zorlama seksual zorakılığın bir növü hesab edilir, lakin hər iki əmələ görə eyni sanksiyaların olmasına baxmayaraq, məsuliyyət ayrı-ayrı normalarda nəzərdə tutulur.

İsveçrə Cinayət Məcəlləsi seksual xarakterli zorakılıq hərəkətləri və zorlama tərkiblərinin ağırlaşdırıcı əlamətlərindən birini fərqli olaraq nəzərdə tutur: "Şəxs zərərçəkənin həyat yoldaşıdırsa və onunla birlikdə yaşayırsa. Şəxs qəddar hərəkət etdikdə, yəni silahdan və ya başqa təhlükəli əşyadan istifadə etdikdə" (14,s.72).

Çin və Yaponiyanın Cinayət Məcəlləsində baxılan cinayət növlərinə görə məsuliyyət məsələsinin həlli xüsusi maraq doğurur.Çin Xalq Respublikasının Cinayət Məcəlləsi 236-cı maddəsində zorlamaya görə məsuliyyət nəzərdə tutur və zərərçəkənin yalnız qadın olduğu qeyd edir. Zorakı sodomiya və lezbiyanlığa görə məsuliyyət isə bu cinayət qanununda ümumiyyətlə, nəzərdə tutulmayıb.

Çinin Cinayət Məcəlləsindən fərqli olaraq, Yaponiyanın Cinayət Məcəlləsi qadınlara və kişilərə qarşı zorakı seksual təcavüzə görə məsuliyyəti nəzərdə tutan bir sıra maddələri nəzərdə tutur. Belə ki, Yaponiya Cinayət Məcəlləsinin 22-ci maddəsi əxlaqsızlıq, zorlama və ikili evliliyə görə məsuliyyət nəzərdə tutur (15).Zorakılıqla törədilən əxlaqsız hərəkətlərdən ibarət tərkiblər müstəqil qrupda qeyd olunur. Məsələn, 176-cı maddə "Zorakılıq tətbiq etməklə əxlaqsız hərəkətlər" adlanır və göstərilir ki, zor tətbiq etməklə və ya hədə-qorxu ilə on üç yaşına çatmış kişi və ya qadına qarşı nalayiq hərəkətlər edən şəxs, altı aydan yeddi ilə qədər müddətə məcburi əməklə cəzalandırılır. On üç yaşına çatmamış hər iki cinsdən olan şəxslərə qarşı əxlaqsız hərəkətlər etmiş şəxs də cəzalandırılır. 178-ci maddədə isə zərərçəkənin köməksiz vəziyyətindən istifadə etməklə törədilən cinsi zorakılığa görə məsuliyyət nəzərdə tutulur.

Qeyd edilən normaların məzmunundan belə çıxır ki, bu cinayətlərin subyektləri və onların qurbanı həm kişi, həm də qadın ola bilər. Yaponiya Cinayət Məcəlləsinin qüsuru, fikrimizcə, onda bu əməllərin təriflərinin, anlayışının olmamasıdır.

Anqlo-sakson hüquq ailəsinə mənsub ölkələrin qanunvericiliyində seksual xarakterli zorakılıq hərəkətlərinin törədilməsinə görə məsuliyyət fərqli müəyyən edilir: belə bir cinayətlərə görə cinayət məsuliyyətinin əsasları və hədlərinin vahid tənzimləməsi mövcud deyil. Bu, ilk növbədə, həmin ölkə qanunvericiliklərinin presedent hüquq sisteminə əsaslanan xüsusiyyətləri ilə bağlıdır. Lakin bu ölkələrdə insan həyatının cinsi sferası cinayət qanunvericiliyi ilə ən ciddi şəkildə mühafizə edilir.

İngiltərə qanunvericiliyində seksual xarakterli zorakılıq hərəkətlərinin müstəqil anlayışı yoxdur, belə hərəkətlər zorlama anlayışı ilə əhatə edilir. Beləliklə, 1956-cı il tarixli Qanunun 1-ci maddəsinə (1994-cü il Qanunu ilə dəyişdirilmiş) əsasən kişinin qadına və ya kişiyə təcavüz etməsi (zorlama) cinayətdir. 1994-cü il tarixli qanuna görə kişinin zorlanması cinayət hesab edilir (Maddə 142). Uşaqbazlıq isə yalnız on altı yaşına çatmamış kişiyə qarşı törədildikdə cinayət məsuliyyətinə səbəb olur.

Bu barədə ABŞ-ın hüquq sistemi də maraqlıdır. Belə ki, Amerika cinayət hüququna xas olan ənənəyə uyğun olaraq seksual zorakılıq tərkibləri ayrı-ayrı ştatların cinayət qanunvericiliyində, ümumiləşdirilmiş müddəaları isə ABŞ-ın Model Cinayət Məcəlləsində formalaşdırılır. Məcəllədə cinsi sferada bütün cinayətlər 213-cü bölmədə "Cinsi qəsdlər" adı altında birləşmişdir (6,s.338). Belə ki, 213.1-cü maddədə həm zorlama, həm də onunla yaxın olan cinayətlərə görə - seksual xarakterli zorakı hərəkətlərə görə məsuliyyət nəzərdə tutulur.

Türkiyənin qüvvədə olan Cəza Məcəlləsinin 102-ci maddəsində cinsi təcavüz əməli belə müəyyən edilmişdir:(1) Cinsi davranışla bir şəxsin bədən toxunulmazlığını pozan hər hansı bir şəxs, qurbanın şikayəti ilə beş ildən on ilədək həbs cəzası ilə cəzalandırılır. Cinsi davranış zərər səviyyəsində qalsa, iki ildən beş ilədək həbs cəzası tətbiq edilir. (2) Bu hərəkət orqan və ya başqa bir cəsədin bədənə daxil edilməsi ilə həyata keçirildiyi təqdirdə, ən azı on iki il müddətinə azadlıqdan məhrumetmə cəzası verilir. Bu hərəkət həyat yoldaşına qarşı edilirsə, istintaq və məhkəmə istintaqı zərərçəkmişin şikayətindən asılıdır.(3) hissədə digər ağırlaşdırıcı hallar nəzərdə tutulmuşdur. 103 -cü maddəsində uşaqlara qarşı

cinsi istismar əməli, 104-cü maddəsində isə yetkinlik yaşına çatmayan şəxslə cinsi əlaqə - on beş yaşını tamamlamış bir uşaqla zor tətbiq etmədən cinsi əlaqədə olan şəxs, zərərçəkmişin şikayəti əsasında iki ildən beş ilə qədər həbs cəzasına məhkum edilir. Maddə 105 – (1) Bir şəxsə qarşı cinsi zorakılıq edən şəxs zərər çəkmiş şəxsin şikayəti üzrə üç aydan iki ilədək müddətə azadlıqdan məhrum etmə və ya məhkəmə qaydasında cərimə, əməl uşağa qarşı törədildikdə isə altı aydan üç ilədək müddətə azadlıqdan məhrum etmə ilə cəzalandırılır.

Seksual xarakterli zorakı hərəkətlərə görə Rusiyada əvvəlki dövrlərdə tonqalda yandırma kimi cəza nəzərdə tutulmasına baxmayaraq, 1716-cı ildə I Pyotr belə cəzanı qadağan etdi və bədən xəsarəti cismani əzab kimi müəyyən edildi. Əgər belə əməllər zorakılıqla törədilirdisə, ölüm cəzası və ya ömürlük sürgün etməklə cəzalandırılırdı (8, s.358).

Rusiyanın 1845-ci il Qanunnaməsində eyni cinsdən olan şəxslər arasında seksual münasibətlərə görə məsuliyyət nəzərdə tutulmuşdu. 1903-cü il Qanunnaməsində də 516-cı maddədə könüllü uşaqbazlıq əməllərinə, həmçinin də maddənin 2-ci hissəsində belə əməlin yetkinlik yaşına çatmayanlara qarşı zorakılıqla törədilməsinə, 3-cü hissədə isə digər məsuliyyəti ağırlaşdıran hallara görə məsuliyyət nəzərdə tutulmuşdu (16, s. 290).

RSFSR-in 1922-ci il CM-i uşaqbazlığa görə xüsusi norma nəzərdə tutmurdu. Lakin bu o demək deyildi ki, belə əməllər cəzalandırılmırdı. Belə ki, zorakı yolla uşaqbazlıq CM-nin 169-cu maddəsində zorlama kimi qiymətləndirilirdi. Könüllü olaraq törədilən bu qisim əməllər isə CM-nin 167-ci maddəsinə əsasən yalnız cinsi yetkinliyə çatmamış şəxslərlə cinsi əlaqədə olma və ya əxlaqsız formalarda cinsi ehtirasın təmin edilməsinə görə məsuliyyət nəzərdə tutulurdu (9,mad.153).

RSFSR-in 1926-cı il CM-i də eyni mövqedə oldu. Həmin illərdə digər ittifaq respublikalarında, yəni Ukrayna, Belorusiya, Gürcüstan, Özbəkistan, Türkmənistan, həmçinin də Azərbaycan respublikasında qəbul edilən CM-ə nəzər yetirdikdə bəlli olur ki, yalnız axırıncı üç respublikada bu qisim əməllərə görə məsuliyyət nəzərdə tutulmuşdur.Belə ki, Özbəkistan SSR-in 1926-cı il Cinayət Məcəlləsində zor tətbiq etməklə və ya zərərçəkmiş şəxsin köməksiz vəziyyətindən istifadə etməklə törədildikdə (maddə 277) və ya şəxs tərəfindən maddi və ya xidməti asılılıqda olan və ya himayəsində olan kişini uşaqbazlığa məcbur etmə (maddə 276) əməlinə görə məsuliyyət müəyyən edilmişdi. Türkmənistan SSR-in 1927-ci il Cinayət Məcəlləsi yalnız kişi cinsindən olan azyaşlı və ya yetkinlik yaşına çatmayanlardan istifadə etməklə cinsi ehtirası təmin etmək üstündə cinayət məsuliyyətini nəzərdə tuturdu.1927-ci il Azərbaycan SSR Cinayət Məcəlləsində isə iki hissədən ibarət 197-ci maddədə uşaqbazlıq əməlinə görə məsuliyyət nəzərdə tutulurdu: birinci hissədə fiziki zorakılıq, hədə-qorxu və ya zərərçəkmiş şəxsin köməksiz vəziyyətindən istifadə etməklə törədilmə, ikinci hissədə "qarşılıqlı razılıq əsasında", yəni könüllü surətdə törədilməyə görə məsuliyyət müəyyən edilmişdi. Digər respublikalarda isə uşaqbazlıq zorlama kimi qiymətləndirilirdi.

Yalnız 1933-cü il dekabrın 17-də SSRİ Mərkəzi İcraiyyə Komitəsi bütün Sovet İttifaqı daxilində uşaqbazlığa görə cinayət məsuliyyəti müəyyən edən xüsusi qərar qəbul etdi. Göstərilən qərarda həm könüllü, həm də zərərçəkənin asılı vəziyyətindən istifadə etməklə və ya zorakılıq, haqqı ödəməklə törədilən uşaqbazlığa görə məsuliyyət nəzərdə tutuldu (10, mad.5).

Bundan qısa müddət sonra, 07 mart 1934-cü ildə SSRİ Mərkəzi İcraiyyə Komitəsi Rəyasət Heyətinin "Uşaqbazlığa görə cinayət məsuliyyəti haqqında" Fərmanı verildi ki, bu da göstərilən cinayətə görə cəzanı artırdı və yalnız iki əlaməti - zorakılıq və zərərçəkənin asılı vəziyyətdə olmasını ağırlaşdırıcı tərkib əlaməti kimi nəzərdə tutdu (17, s.50).

RSFSR-in 1960-cı il CM-si bu normaya əlavə bir ağırlaşdırıcı halı - yetkinlik yaşına çatmayanlara qarşı törədilməsini də nəzərdə tutdu. Uşaqbazlıq hərəkətlərindən əlavə, həm zorakılıq tətbiq etməklə (zorlama istisna olmaqla), həm də onsuz (uşaqbazlıq istisna olmaqla) cinsi istəkləri təmin etməyin digər yollarına qanunverici kifayət qədər diqqət yetirməmişdi ki, bu da ittifaq və respublika qanunvericiliklərinin maddələrində məzmun ayrılığına səbəb olmuş, belə əməllərin tövsifində çətinliklər törətmişdir. Qeyd edilən hallarda əməllər ya zorlama, yaxud da Latviya SSR qanunvericiliyində olduğu kimi xuliqanlıq, əgər kişi cinsindən olan şəxslərə qarşı törədilirdisə, bəzən uşaqbazlıq, bəzən də şəxsiyyət əleyhinə (RSFSR-də) cinayət kimi, kiçik yaşlı oğlan uşaqlarına qarşı törədilirdisə, əxlaqsız hərəkətlər kimi qiymətləndirilirdi.

Müttəfiq respublikalar içərisində yalnız Ukrayna (118-ci mad.), Moldoviya (103-1-ci mad.) və Estoniya (115-ci mad.) respublikalarının CM-lərində cinsi cinayətlər konkretləşdirilərək uşaqbazlıq müstəqil tərkib kimi nəzərdə tutuldu. Rusiya Federasiyasının 29 aprel 1993-cü il tarixli Qanunu könüllü

olaraq uşaqbazlığa görə məsuliyyəti aradan qaldıraraq, zorakı xarakterdə olan, yetkinlik yaşına çatmayanlar barəsində, zərərçəkənin asılı vəziyyətindən və ya köməksiz vəziyyətindən istifadə etməklə törədilməsinə görə məsuliyyət nəzərdə tutdu.

Onu da qeyd edək ki, Rusiya Federasiyasının (RF) 1996-cı il CM-nin qəbuluna qədər qadının qadın, kişinin kişi tərəfindən qeyri-təbii yolla cinsi zorakılıq hərəkətləri müstəqil əməl olaraq cinayət-hüquq təsirindən kənarda qalırdı və belə əməllər zorlama kimi qiymətləndirilirdi (5, s.33-34).

Beləliklə, göründüyü kimi, qanunvericiliyin inkişaf etdiyi sovet dövründə məhkəmə praktikasında cinsi cinayətlərin qiymətləndirilməsində vahid nöqteyi-nəzər mövcud deyildi, bəzi hallarda isə cinsi zorakılıq hərəkətləri zorlama və ya xuliqanlıq kimi tövsif edilirdi ki, buradan da belə çıxır ki, həmin dövrdə cinayət qanunun analogiya yolu ilə tətbiqi mövcud olmuşdur.Homoseksual münasibətlərə görə məsuliyyətə dair qanunvericiliyin keçdiyi tarixi inkişaf yolu bu kateqoriyadan olan cinayətlərə görə qanunvericiliyin təkmilləşdirilməsinə xidmət edərək RF-nın yalnız 1996-cı il Cinayət Məcəlləsində öz əksini tapmışdır.

Azərbaycan Respublikasının qüvvədə olan 1999-cu il CM-də "Şəxsiyyətin cinsi toxunulmazliği və cinsi azadlığı əleyhinə olan cinayətlər" adlı 20-ci fəslində zorlama (149-cu mad.), seksual xarakterli zorakılıq hərəkətləri (150-ci mad.), seksual xarakterli hərəkətlərə məcbur etmə (151-ci mad.), on altı yaşına çatmayan şəxslə cinsi əlaqədə olma və ya seksual xarakterli digər hərəkətlər etmə (152-ci mad.), əxlaqsız hərəkətlər (153-cü mad.) cinayət tərkibləri konkretləşdirilərək müstəqil normalarda nəzərdə tutulur. Seksual xarakterli zorakılıq hərəkətləri adında cinayət əməli Azərbaycan Respublikasının 1999-cu il CM-də ilk dəfə müstəqil tərkib kimi nəzərdə tutulmuşdur. Belə ki, seksual xarakterli zorakılıq hərəkətləri tərkibi 150.1-ci maddəyə əsasən zərərçəkmiş şəxsə və ya başqa şəxslərə zor tətbiq etməklə və ya belə zor tətbiq etmə hədəsi ilə və ya zərərçəkmiş şəxsin köməksiz vəziyyətindən istifadə etməklə uşaqbazlıq və ya seksual xarakterli digər zorakılıq hərəkətləri etmə kimi müəyyənləşdirilmişdir (1,s.137). Lakin belə hərəkətlər əvvəlki illərdə də cinayət hesab edilərək ya uşaqbazlıq, yaxud da zorlama cinayət tərkibərinin əlamətləri kimi qiymətləndirilmişdir. Onu da qeyd edək ki, bu zaman sovet dövrünün cinayət qanunundan fərqli olaraq, 16 yaşına çatmış hər iki tərəfin razılığı ilə, yəni könüllü olaraq törədilən seksual xarakterli əməllər cinayət kimi qiymətləndirilmədi.

## Nəticə

Yuxarıda qeyd olunanlardan belə məlum olur ki, seksual xarakterli cinayət əməllərinə görə məsuliyyət məsələsi müxtəlif dövrlərdə müxtəlif dövlətlərdə müxtəlif qaydada nəzərdə tutulmuşdur. Lakin belə hal hər bir dövlət daxilində bu qisim cinayət əməlləri ilə səmərəli mübarizə işinə xələl gətirmir. Belə ki, Azərbaycan Respublikasında cinsi cinayətlər içərisində nisbətən ağır hesab edilən zorlama və zorlamaya cəhd kimi cinayət əməllərinin sayında son dövrlər azalma müşahidə olunmaqdadır: 2016-2020-ci illər ərzində bu cinayətlərin sayı müvafiq olaraq 34,37,28,22, 21 olmuşdur (www.stat.gov.az).

## Ədəbiyyat

1. Azərbaycan Respublikasının Cinayət Məcəlləsi, Bakı: Hüquq Yayın Evi, 2021. - 852 s.
2. Əliyev, Ə.İ. (2008) Cinsi cinayətlərlə mübarizədə cinayət qanunvericiliyinin yaranması və inkişaf tarixinin bəzi məsələləri // Azər bay can Res pub li ka sın da döv lət və hü quq qu ru cu lu ğu nun ak tual prob lem ləri. El mi mə qa lə lər məc muə si. 20-ci bu ra xı lış. Bakı, 2008, s. 414-420.
3. Bekkaria, Ç. O. (1987) Prestupleniii nakazanii. Moskva, 1939 q., Reşetnikov F. M. Bekkaria. Moskva: Örlit.,125 s.
4. Diqestı Östiniana : per. s latinskoqo (2005)/ otv. red. L. L. Kofanov. T. VII.Polutom 2. Moskva: Statut, 112s.
5. Dğəçenko, A. P. (1995) Uqolovno-pravovaə oxranaqrajdanv sfereseksualnıxotnoşeniy. Moskva: Akad. MVD Rossii, 68s.
6. Malinovskiy, A. A. (2002) Sravnitelğnoe pravovedeniev sfereuqolovno qoprava. Moskva:Mejdunarodnıe otnoşeniə, 2002. -202s.
7. Robber, J.N. Povsednevnaəjiznğ Drevneqo Rimaçerezprizmunaslajdeniy/ per. s fr..Levinoy T.A. Moskva: Molodaəqvardiə, 2006. -182s.

8. Rossiyskoezakonodatelğstvo X–XX vv. Moskva:Örlit.1986. T.4. -512 s.
9. Sobranieuzakoneniy RSFSR. 1922. № 15. St. 153.
10. SobraniezakonodatelğstvaSSSR. 1934. № 1. St. 5.
11. Tgnngxil, R. Seksvistorii / per. s anql. A. İ. Bleyz. M., 1995. - 400s.
12. UqolovnıykodeksFranüii (2002)/ per. s franüuzskoqoi predisloviedoü. N. E. Krılovoy. SPb: ÖridiçeskiyüentrPress, 650s.
13. Uqolovnoe pravoz arubejnıx stran (2004). Osobennaəçastğ : uçeb. pos. / podred. i spredisl. İ.D. Kozoçkina. Moskva, 30 s.
14. Uqolovnıy kodeks Şveyüarii: pers nem. (2000) Moskva
15. Uqolov nıykodeks Əponii (2000)/ podred. A. İ. Korobeeva. Vladivostok:İzd-voDalğnevost. un-ta,32 s.
16. Uqolovnoe ulojenie. SPb:Qos.tip., 1903. -1122 s.
17. Uqolovnıy kodeks RSFSR.(1952)Moskva: Örlit., 1952. -126 s.
18. Franüuzskiyuqolovnıykodeks 1810 q (1947). (sizm. i dop. na 1 iönə 1940 q. / per. N. S. Lapşinoy; podred. M. M. İsaeva.Moskva: izd-voMinöstaSSSR, 372 s.
19. Fuks,İ. B. (1910) Qomoseksuali zmkak prestuplenie. SPb,1914. -94s.; Pətniükiy B. İ. Polovıeiz vraheniəi uqolovnoepravo. Moqilev, 93 s.
20. Xrestomatiəpo istoriisrednixvekov (1963)Moskva, T. 2. -751 s.
21. Şaşkov, S. S. Sobraniesoçineniy (1898)T.1. SPb, 1898.- 590 s.
22. Əkovlev, Ə. M. (1969) Polovıeprestupleniə. Duşanbe:İrfon 453 s.

Göndərildi: 10.03.2022 Qəbul edildi: 20.04.2022

DOI: https://www.doi.org/10.36719/2663-4619/78/24-30

**Elnarə Xeyrəddin qızı Məmmədova**
Azərbaycan Dövlət Bədən Tərbiyəsi və İdman Akademiyası
pedaqogika üzrə fəlsəfə doktoru
elnara.mamedova57@gmail.com
**Fidan Rəhim qızı Əkpərli**
Azərbaycan Dövlət Bədən Tərbiyəsi və İdman Akademiyası
magistrant
fidan-gimnastika@mail.ru

# ADAPTİV BƏDƏN TƏRBİYƏSİ MƏŞĞƏLƏLƏRİNİN SAĞLAMLIĞI MƏHDUD OLAN İNSANLARIN HƏYAT QABİLİYYƏTİNƏ TƏSİRİ

**Xülasə**

Mövzunun aktuallığı ondadır ki, fiziki qusurlu insanların cəmiyyətə tam dəyərli, sağlam bir şəxs kimi daxil olması üçün, sosiallaşması üçün adaptiv fiziki tərbiyənin (AFT) metodlarından, vasitələrindən istifadə edilməsi çox vacibdir. Beləki AFT kompleks şəkildə təsir edərək sağlamlığı məhdud olan insanların orqanizmində əzələ və orqanların fəaliyyətini stimullaşdırır və həyat qabiliyyətini artıraraq sosiallaşmasına vasitəci olur. Məqalədə göstərilən metodiki eksperimentin məqsədi AFT tədbirlərinin sağlamlığı məhdud olan insanların psixoloji, sosial və həyat qabiliyyətinə təsirini müəyyən etməkdir. Beləliklə fiziki, sosial və psixoloji inkişafı nəticəsində həmin şəxsin sağalmasına şərait yaranır.

***Acar sözlər*** : *əlillər, sağlamlığı məhdud insanlar, adaptiv fiziki tərbiyə (AFT), uyğunlaşma*

**Elnara Kheyraddin Mammadova**
**Fidan Rahim Akparli**

**The influence of adaptive physical culture on the viability of people with disabilities**

**Abstract**

The urgency of the topic is that the disabled people can enter society as a full-fledged, healthy person. For this it is very important to use the methods.Means of adaptive physical education (APE) for their socialization. Thus APE stimulates the activity of muscles and organs of the disabled people in a complex way and promotes their socialization by increasing their viability. Thus as a result of physical, social and psychological development, conditions are created for the recovery of the disabled people.

***Key words*****:** *people with disabilities, adaptive physical culture (AFC), adaptation, physical culture, means, method*

## Giriş

"Fiziki tərbiyə" anlayışı yunanca φύσις (fysis-fyusis) - təbiət deməkdir və latıncadan tərcümədə insan əməyi ilə torpağın, bitkilərin becərilməsi kimi başa düşülür. (Məcidov N.B., İdman nəzəriyyəsi,2009, 20-43 s.)Adaptiv fiziki tərbiyə (AFT) əlilliyi olan insanların sağlamlığı üçün təhlükəsiz və uğurlu təcrübə kimi tətbiq edilən bədən tərbiyəsidir.Adaptiv bədən tərbiyəsi bədən tərbiyəsinin ümumi nəzəriyyəsi və metodologiyasına əsaslanır.Burada tədqiq olunan obyekt həyata təkcə fiziki deyil, həm də cəmiyyətdə sosial adaptasiyaya ehtiyacı olan əlillər və fiziki və əqli imkanları məhdud şəxslərdir. Onlarla işləmək üçün bədən tərbiyəsi tapşırıqlarının və üsullarının onlara uyğunlaşdırılması lazımdır. Bu səbəblərə görə bədən tərbiyəsinin bu forması adaptiv fiziki mədəniyyət (AFT) adlanır və ümumi insan mədəniyyətinin tərkib hissələrindən biridir.AFT metodları əlilliyi olan hər bir şəxsə öz potensialını reallaşdırmağa, müəyyən zirvələrə çatmağa və arzularını həyata keçirməyə imkan verir (Vahidov F., Ağayev T., Sosiologiya, Bakı, 2013, 37, 121-134.)

Adaptiv bədən tərbiyəsinin növləri (komponentləri) bir tərəfdən müstəqil xarakter daşıyır, çünki onların hər biri öz vəzifələrini həll edir, öz quruluşuna, formalarına və məzmun xüsusiyyətlərinə malikdir; digər tərəfdən onlar bir — biri ilə sıx əlaqəlidir. Belə ki, adaptiv fiziki tərbiyə prosesində

müalicəvi bədən tərbiyəsi elementlərindən təkrar pozuntuların korreksiyası və profilaktikası məqsədi ilə istifadə olunur; rekreativ məşğələlər —oyun fəaliyyətinə olan tələbatı inkişaf etdirmək, dəyişmək, ödəmək üçün istifadə olunur; elementar idman yarışları.(Castnıye metodiki adaptivnoyfiziceskoy kulturı Moskva " Sovetskiy sport"shapkova-l.v.-chastnye-metodiki-adaptivnoj-fizicheskoj-kultury.pdf 55s.)

Bir çox əlil idmançılar stasionar şəraitdəfiziki reabilitasiyadan rekreativ idmana, ali nailiyyətlərin (adaptiv idman) idmanına ardıcıl yol keçirlər. Əgər sağlam insan üçün hərəki fəallıq gündəlik həyata keçirilən təbii tələbatdırsa, əlil üçün yaşamaq üçün mövcud olan üsul, obyektiv həyat qabiliyyəti şəraitidirHəşimov Ə. Ş, Sadıqov F. B. Pedaqoqika /Tərbiyə nəzəriyyəsinə aid mühazirələr/, 1995, 245 s). O, öz gücünə müstəqillik və əminlik verir, bilik və ünsiyyət dairəsini genişləndirir, dəyər istiqamətlərini dəyişir,mənəvi aləmi zənginləşdirir, hərəki imkanlarını yaxşılaşdırır, həyat tonusunu, fiziki və psixi sağlamlığını artırır, deməli, bioloji və sosial statusun müsbət dəyişməsinə imkan yaradır. Beləliklə, adaptiv bədən tərbiyəsi və bütün növləri səmərəli şəkildə təşkil olunan hərəki fəaliyyətinin köməyi ilə nəzərdə tutulmuşdur, həyat fəaliyyətinin təbii stimulu qorunub saxlanılan funksiyalardan, qalıq sağlamlıqdan, təbii resurslardan və mənəvi qüvvələrdən istifadə edərək sağlam insanların cəmiyyətə inteqrasiyası, özünütəsdiq və yaradıcılıq, sosial fəallığın və tamdəyərli həyat üçün orqanizmin və şəxsiyyətin imkanlarını maksimum dərəcədə reallaşdırmaq imkanına malikdir.

## Əsas hissə

Adaptiv fiziki tərbiyə (təhsil) – adaptiv fiziki mədəniyyətə müsbət və fəal münasibətin formalaşdırılmasında, sağlamlıq imkanları məhdud olan insanın həyata, məişət və əmək fəaliyyətinə hazırlığına olan tələbatını ödəyən adaptiv bədən tərbiyəsidir.(Bayramov, Əlizadə, 2002: 626 s.)Adaptiv fiziki tərbiyə ilə məşğələlər zamanı xüsusi biliklər, həyati və peşəkar zəruri hərəki bacarıq və vərdişlər kompleksi formalaşdırılır, əsas fiziki və psixi keyfiyyətlər inkişaf etdirilir, müxtəlif orqan və sistemlərin funksional imkanları artırılır, inkişaf etdirilir, saxlanılır və yeni keyfiyyətdə istifadə olunur bədən - hərəkət xarakteristikası mövcuddur.

Adaptiv fiziki tərbiyənin əsas məqsədi məşğul olanlarda öz qüvvələrinə şüurlu münasibət, onlara möhkəm inam, cəsarətli və qətiyyətli hərəkətlərə hazırlıq, subyektin tamdəyərli fəaliyyəti üçün zəruri olan fiziki yüklənmələrin aradan qaldırılması, habelə fiziki hərəkətlərlə müntəzəm məşğuliyyətlərə olan ehtiyac və valeologiyanın tövsiyələrinə uyğun olaraq sağlam həyat tərzinin həyata keçirilməsidir. Aktiv adaptiv fiziki tərbiyə prosesində, hansı ki, uşağın doğuluşundan başlanmalıdır bu və ya digər patologiyanın aşkarlanmasından başlayaraq, birinci dərəcəli diqqət əsas qüsurun, müşayiət olunan xəstəliklərin və ikinci dərəcə yaranmış vəziyyətlərin korreksiyası, düzəlişin mümkün olmadıqda, həyati fəaliyyətin həyata keçirilməsinin kompensasiya mexanizmlərinin işlənib hazırlanması vəzifələrinə verilir. Məhz burada fənlərarası əlaqələr xüsusiəhəmiyyət kəsb edir, fiziki məşqlər zamanı əqli, sensor – perseptiv, hərəkət və anlayışların mənimsənilməsi həyata keçirilir, əqli, əxlaqi, estetik, əmək və digər tərbiyə növləri baş verir. Adaptiv bədən tərbiyəsinin bu komponenti və əldə edilmiş patologiya və ya əlillik halında, insanın həyati və peşəkar cəhətdən əhəmiyyətli bacarıq və vərdişlərə ( protezlərdə yerimə, görmə itkisi halında məkana yönəlmə və s . ) yenidən yiyələnməsi vacibdir.

Adaptiv idman - adaptiv bədən tərbiyəsinin komponentidir, şəxsiyyətin özünütaktuallaşmaya, öz qabiliyyətlərinin maksimum mümkün şəkildə özünü reallaşdırılmasına, onları digər insanların bacarıqları ilə tutuşdurmağa tələbatını,kommunikativ fəaliyyətə və sosiallaşmaya olan tələbatı ödəyir.(Hüseynov F.O. Igidlik və gözəllik oyunları, 1966, 78 s.)Bir çoxxəstəliklərdə və əlillik növlərində adaptiv idman insanın ən əsas tələbatlarından biri-özünü aktuallaşdırmaya olan ehtiyacın ödənilməsi üçün demək olar ki, yeganə imkandır. Adaptiv idmanın məzmunu, ilk növbədə, əlillərdə yüksək idman ustalığının formalaşmasına və onun müxtəlif növlərində insanlarla yarışda ən yüksək nəticələrə nail olunmasına, adaptiv bədən tərbiyəsinin idmana malik komponentinə, şəxsiyyətin özünü aktuallaşdırmaya, öz qabiliyyətlərini maksimum dərəcədə özünü realizə etməyə, onları digər insanların bacarıqları ilə tutuşdurmağa , kommunikativ fəaliyyətə və sosiallaşmaya olan tələbatına yönəldilmişdir. Bir çox xəstəliklərdə və əlillik növlərində adaptiv idman insanın ən əsas tələbatlarından biri olan özünü aktuallaşmaya olan tələbatın ödənilməsi üçün demək olar ki, yeganə fürsətdir.

Adaptiv idmanın əsasını rəqabət fəaliyyəti və ona məqsədyönlü hazırlıq, əlverişli bioloji səviyyədə maksimal adaptasiya- təcrübə imkanlarına nail olmaq, fərdi idman texnikasının saxlanma funksiyaları hesabına təkmilləşdirilməsi təşkil edir. İdmançının fiziki, intellektual, emosional - psixi potensialınınreallaşdırılmasını təmin edən, estetik, etik, mənəvi tələbatı, fiziki təkmilləşməyə can atan müalicə və pedaqoji vasitələrin optimal nisbətdə işlədildiyi həkim-pedoqoji proses kimi yarışlara hazırlıq görülür. Adaptiv idman hazırda əsasən ən böyük Beynəlxalq Paralimpiya, Xüsusi və Surdlimpiya hərəkəti çərçivəsində inkişaf edir.Adaptiv idmanın əsas məqsədi əlil insanda idman mədəniyyətinin formalaşdırılması, bu sahədə ictimai-tarixi təcrübəyə yiyələnməsi, texnoloji, intellektual və digər bədən tərbiyəsi dəyərlərinin mənimsənilməsidir. Adaptiv idmanı cəmiyyətdə əlillərə və sağlamlıqı məhdud vəziyyətində olan şəxslərə qarşı aksioloji münasibət konsepsiyasının obyektiv qiymətləndirilməsinə imkan verən lakmus kağızı ilə sosial hadisə kimi müqayisə etmək olar: əlillər, həqiqətən, bərabər, müstəqil yol seçmək hüququna malik olan kimi qəbul edilir.

Adaptiv hərəkət rekreasiyası - istirahətdə, əyləncədə, asudə vaxtın maraqlı keçirilməsində, fəaliyyət növünün dəyişdirilməsində, zövq alınmasında, ünsiyyətdə sağlamlıq vəziyyətində pozuntularla insanın ehtiyaclarını qarşılamağa imkan verən adaptiv bədən tərbiyəsinin komponentidir.Adaptiv hərəkət rekreasiyasının məzmunu hər hansı fəaliyyət növü (əmək, təhsil, idman) zamanı əlilliyi olan insanların fiziki qüvvələrin fəallaşmasına,saxlanılmasına və ya bərpasına, yorğunluğun profilaktikasına, əyləncəyə, istirahətin maraqlı keçirilməsinə və ümumiyyətlə sağlamlaşmaya, konsentrasiyanın yaxşılaşdırılmasına, zövqlə və ya həvəslə həyat səviyyəsinin yüksəldilməsinə yönəldilib. Adaptiv hərəkət rekreasiyasından ən böyük effekt,əsas ideyası vasitələrin, dərs üsullarının və formalarının tam sərbəst seçimi hesabına məşğul olanların psixoloji rahatlığını və marağını təmin etməkdən ibarətdir. Adaptiv hərəkət rekreasiyasının əsas məqsədi fəlsəfə (hedonizm prinsipləri, əlilliyin əsas qəbullarının və rekreasiya üsullarının mənimsənilməsi) təbliğ edən Epikurun dünyagörüşünün tarixi praktikası ilə yoxlanılmış xarici şəxsiyyəti qəbul etməkdən ibarətdir. Digər fəaliyyət növlərinə keçid, əlaqə genişliyi, özünüidarəetmə, oyun fəaliyyəti, hərəkət zövqü deməkdir.

Sağlamlıqı məhdud insanlar üçün adaptiv hərəkət rekreasiyası - təkcə bioloji cəhətdən əsaslandırılmış özünütənzimlədən, emosional vəziyyəti, sağlamlığı və iş qabiliyyətini dəstəkləyən hərəkət fəallığı deyil , həm də qapalı məkanın qət edilməsi üsulu, psixi müdafiə, ünsiyyət imkanı, şəxsi maraqların, zövqlərin, məşğuliyyət növlərinin və formalarının seçilməsində arzuların ödənilməsidi. Əldə edilmiş əlillik və ya ağır xəstəlik halında adaptiv hərəkət rekreasiyası birinci mərhələ, stressin aradan qaldırılmasıvə adaptiv bədən tərbiyəsinə ( adaptiv fiziki tərbiyəyə,adaptiv idmana və s. ) qoşulmaq istiqamətində ilk addım ola bilər və olmalıdır.

Fiziki hərəkət, tənəffüs hərəkətləri əsas spesifik vasitədir ki, onun köməyi ilə məşğul olanlara yönəldilmiş təsir əldə edilir, korreksiyaedici, kompensasiyaedici, müalicə və profilaktik, təhsil, sağlamlıq, tərbiyəməsələləri həll edilir. Hərəkətlərin xüsusiyyətlərinin təkmilləşdirilməsi, hərəki bacarıqların mənimsənilməsi, fiziki keyfiyyətlərin inkişafı tapşırıqların dəfələrlə təkrarlanması hesabına əldə edilir. Bununla yanaşı, hərəki fəaliyyəti bioloji strukturlarda və funksiyalarda bütöv bir dəyişiklik kompleksi ilə müşayiət olunur. Fiziki tapşırıqlar istənilən yaşda sağlamlığı məhdud imkanlı insanın orqanizminə müsbət təsir göstərir, xüsusilə qeyd etmək lazımdı ki inkişafda pozuntuları olan artan orqanizmə. Onlar:

1) dayaq-hərəkət aparatını möhkəmləndirir və inkişaf etdirir, sümüklərin böyüməsini stimullaşdırır, oynaqları və bağları gücləndirir, əzələlərin gücünü, tonusunu və elastikliyini artırır; 2) qan dövranını və limfa dövranını, maddələr mübadiləsini yaxşılaşdırır; 3) mərkəzi sinir sisteminə əlverişli təsir göstərir, beyin qabığının fəaliyyətini və güclü stimullara qarşı müqavimətini artırır; 4) mərkəzi sinir sisteminin analitik-sintetik fəaliyyətini və iki siqnal sisteminin qarşılıqlı təsirini yaxşılaşdırır; 5) sensor sistemlərinin funksiyalarını yaxşılaşdırır.

2) Fiziki tapşırıqlar düşünülmüş məqsədyönlü hərəkət olmaqlabirsıra psixi proseslərlə (diqqət, yaddaş, nitq və s.), hərəkətlər haqqında təsəvvürlərlə, düşüncə işi, emosiyavə həyəcanlarla və s. əlaqəlidir., maraqları, inancları, motivləri, ehtiyacları inkişaf və iradə, xarakter, davranış formalaşdırmaq və beləliklə, insan mənəvi inkişaf vasitələrdən biridir; yəni bədən və şəxsiyyətə eyni zamanda təsir göstərir.

3) Problemin aktuallığı ondan ibarətdir ki, AFT əlilliyə baxmayaraq yeni şəraitdə insanın həyata nikbin baxışını təmin edib dəstəkləyərək , cəmiyyətə normal inteqrasiyasına yardım etsin. Bunun üçünxəstənin daha müstəqil və aktiv olması vacibdir. AFT-nin bir insanın gündəlik həyatına daxil edilməsi vacibliyi ondadır ki, o xəstə şəxsin gündəlik həyatına daxil olaraq həyati bacarıqlar əldə etməsinə kömək edir, fiziki adekvatlığı stimullaşdırır, inkişaf etdirir və möhkəmləndirir. AFT insanın cəmiyyətdə daha da sosiallaşması üçün nəzərdə tutulan tədbirlər kompleksidir. AFT-nin tətbiqi təbii amillərə, hərəkətə, sağlam həyat tərzinə, rasional qidalanmaya və s. əsaslanır. Bu onların həyatının tərkib hissələrindən birinə çevrilir. (Məcidov: 171-204). Əlilliyi olan insanlar söhbətlər, hobbilər, aktiv istirahəti əhatə edən istirahət fəaliyyətləri prosesində xəstəliklərindən və məhdudiyyətlərindən yayınırlar. Beləliklə AFT müasir cəmiyyətdə reabilitasiya və uyğunlaşma, müstəqil həyata vərdişləri əldə etməyə yönəlmiş idman və istirahət məşqlərinin məcmusudur. İnsanın müstəqil həyata başlaması üçün o sağlamlaşdırıcı, rekreasion hərəkətlər, idman-sağlamlaşdırıcı hərəkət kompleksini icra edir , ünsiyyət qurur.Müəyyən bir mərhələdə hərtərəfli həvəs yaranır və bu onu müstəqil qərarlar qəbul etməyə sövq edir. Sağlamlaşdırıcı və istirahət kompleksi icra edir , öz növbəsində, aktivlik və hərəkətlərin keyfiyyət və kəmiyyətinin yüksəlməsini təmin edirki, bu da onun müstəqil olmaq istəyinin inkişafında mühüm rol oynayır. Nəzərə almaq lazımdır ki, bu cür hərəkət kompleksləri əlilliyi olan bir insanın gündəlik həyatına möhkəm daxil edilməlidir. Bu fəaliyyətlər bədənin əzələ, morfo-funksional sistemini inkişaf etdirir və tonuslayır, bununla da həm fiziki, həm də mənəvi - psixoloji rifahı təmin edir. Dərslərin gedişində əlilliyi olan şəxsin varlığının, ünsiyyətinin, cəmiyyətdəki yerinimüəyyən dərəcədə itirmiş bir şəxsdən öz istəkləri olan, özünü tapmağa hazır bir insana tədricən çevrilməsi baş verir. Beləliklə belə şəxslərcəmiyyətdə sosiallaşaraq öz fiziki məhdudiyyətlərini qismən unudur. Burada biz AFT-nin əlilliyi olan şəxsə faydalı təsir göstərdiyini və sosiallaşma vasitəsi kimi çıxış etdiyini görürük.

AFT-də əlillərin bütün reabilitasiya sisteminin ən mühüm hissəsini təşkil edən adaptiv bədən tərbiyəsi, adaptiv rekriasiya, adaptiv fiziki reabilitasiya kimi növləri vardır. Bu növlər əlilliyi olan şəxsin həyatının bütün sahələrində mövcuddur, həyat qabiliyyətinə birbaşa təsir göstərir, həmçinin tibbi və psixoloji reabilitasiya vasitələri və metodları kimi istifadə olunur.Sağlamlığı məhdud insanlar 4 nozoloji qrupu üzrə bölünür (Axundova, 1980:59 ):

1. Əzələ-hərəkət sistemi.2. Görmə.3. Eşitmə.4. Əqli gerilik.

Möhkəm iradəli, məqsədyönlü xarakterə malik olan bir çox sağlamlığı məhdud insanlarınhəyatda uğur qazandığı bir çox hallar məlumdur. Bu əsasən insanın özünə inamından, gücündən, keçməli olduğu psixoloji baryerdən asılıdır. Adaptiv fiziki mədəniyyətin bütün növləri fərdin öz gücünü səfərbər edə bilməsi üçün bir növ incə mexanizm kimi istifadə olunur.( Məmmədova, Əliyev, Əsədullayeva vəb. 2012: 45-52)

Sağlamlıqlarında müxtəlif məhdudiyyətləri olan insanlar həyat fəaliyyətlərinə mane olan əlilliklə yanaşı, mövcud statusları ilə bağlı psixoloji travma da alırlar. Onlar bu vəziyyətdə olduqları üçün daim narahat olur, hətta bəzən depressiyaya düşürlər.Bununla əlaqədar daimi sinir gərginliyi müşahidə olunur. Bupatoloji vəziyyətin dərinləşməsinə və hətta digər xəstəliklərin yaranmasına yol açır. Bildiyimiz kimi daimi stresli vəziyyət və depressiya öz mənfi təsiri ilə orqanların funksional vəziyyətini zəiflədir. Sağlamlıq məhdudiyyətləri kimi stress faktorlarına uzunmüddətli və müntəzəm məruz qalma onu fiziki cəhətdən yorur, iş qabiliyyətinin azalmasına səbəb olur. Beləliklə sağlamlığında məhdudiyyətlər olan bir insan üçün düzgün istirahətin təşkili vacib məsələlərdən biridir.Belə ki, sağlamlığında məhdudiyyətlər olan, düzgün istirahəti olmayan, ünsiyyəti olmayan (Kazımov,2005:476 s) insanda stress xroniki formaya keşir. Onun bədəni daimi gərginlikdədir və orqan sistemləri artan stress altındadır. Bu apatiya vəziyyətində olan insanın ictimailəşməsi çətindir. Müvafiq olaraq adaptiv fiziki mədəniyyətin köməyi ilə AFT növlərinin (adaptiv bədən tərbiyəsi, adaptiv rekriasiya, adaptiv fiziki reabilitasiya) bu insanları bu psixoloji və fiziki vəziyyətdən çıxarmağa, uyğunlaşmaya və davamlılığını artırmağa yönəldilmişdir. Belə tədbirlərin keçirilməsi sağlamlığı məhdud olan insanların sosiallaşmasına öz töhfəsini verir.

Bu dissertasiyanın məqsədi AFT vasitələrinin və metodlarının əlilliyi olan insanlara təsirini onların sosiallaşması və həyat qabiliyyətinin artmasında bir vasitə olaraq nəzərdən keçirməkdir. Bu sistemin fəaliyyətinin təkmilləşdirilməsi üçün praktiki metodologiyanın yeni və səmərəli tətbiq formalarının

yaradılmasına ehtiyac var. Əlilliyi olan insanlara əvvəllər qeyri-mümkün hesab etdikləri arzularına çatmaqda kömək etmək üçün hər il AFT üçün təkmilləşdirilmiş üsullar hazırlanır. Bu fiziki və psixoloji reabilitasiya ilə yanaşı, həmçinin apatiya və depressiya vəziyyətindən çıxmağa və ünsiyyətə başlamağa imkan verir. Əlil şəxsin qabiliyyətlərinin bərpası onun sosial, müstəqil bir vətəndaş kimi formalaşmasına və bir sıra hallarda ailə həyatı qurub yaşamasına imkan verir.

Təsvir edəcəyim metodologiya və təcrübə əsasında sağlamlığı məhdud olan insanların həyat qabiliyyətini və sosiallaşmasını artırmaq üçün AFT-nin təsirini və effektivliyini nəzərdən keçirək. Təcrübədə 10 nəfər sağlamlığı məhdud olan şəxs iştirak edəcək. Otaq bitkilərinin bədənə faydalı təsirləri haqqında hamımız bilirik. Bütün məlum kaktuslar zərərli elektromaqnit şüalarını öz səthindən keçirərək zərərsizləşdirir. Onlar istiliyi və parlaq işığı sevirlər. Məsələn, Rozmarin havadakı zərərli bakteriyaları öldürür, dərinin və saçın vəziyyətini yaxşılaşdırır, elektromaqnit şüalarının təsirindən qoruyur, baş ağrılarında, metabolik pozğunluqlarda istifadə olunur. Ətirşah həm də havaya patogen bakteriya və virusları öldürən fitonsidlər buraxır ki, bu da hazırkı pandemiyada mühüm rol oynayır. Sitrus meyvələri bakteriya və virusları öldürür,bədəni tonuslaşdırır, sakitləşdirir,diqqəti yaxşılaşdırır, tərkibindəki fitonsidlərin sayəsində patogenləri öldürür. ( Şabanov, Məmmədova, 2006: 8-118) Digər tərəfdən bəzi bostan bitkiləri sortlarının ev şəraitində becərdilə bilməsini nəzərə alaraq praktik fəaliyyətdə tətbiq etmişik. Bu təcrübədə müəyyən nozoloji qrupdan olanSİM şəxslər gündəlik 5-dən 10-a qədər otaq bitkilərinin becərdilməsi ilə məşğul olur. Bununla yanaşı, hər bir bitkinin eksperimentdə iştirak edən əlilliyi olan bir şəxsə müvafiq nozoloji qrupdakı məhdudiyyətlər və patologiyalar nəzərə alınmaqla sağlamlaşdırıcı və reabilitasiyaedici təsirləri istifadə edilmişdir . İştirakçılar AFT hərəkətləri etməklə yanaşı, hər bir bitkiyə qulluq, gübrə, müalicəvi xüsusiyyətləri barədə bir-biri ilə məsləhətləşir, bağbanlardan peşəkar məsləhətlər alırlar. Onlar bitkinin tədricən necə böyüməsini, çiçəklənməsini və bəhrə verməsini izləyirlər. Bütün bu proses bu şəxslərin psixoloji vəziyyətinə və sosiallaşmasınamüsbət təsir göstərir. Məşqin təsviri və miqdar, həmçinin bitkinin müalicəvi xüsusiyyətləri haqqında məlumat becərdilən qabın üzərində göstərilir. Təcrübədən əvvəl iştirakçıların nəbzinin, qan təzyiqinin, bədən istiliyinin,saturasiyası,yəniqanın oksigenlə doyma səviyyəsikimi özünə nəzarət məlumatları qeydə alınır. Təcrübənin əvvəlində və sonunda psixoloji test-sorğu keçirilmişdir. Təcrübənin nəticələri riyazi statistika üsulu ilə hesablanmışdır. Eksperimentin məqsədi AFT-nin əlilliyi olan insanların reabilitasiyası və sosiallaşmasına, habelə onların həyat qabiliyyətinin artırılmasına təsirini öyrənməkdir.

## Nəticə

Aparılan eksperementin nətisində məlum oldu kitəklif olunan metodologiya idrak fəaliyyətini, yaradıcılığını, ünsiyyət bacarıqlarını inkişaf etdirməyə kömək edəcək, əlilliyi olan şəxsin sosial uyğunlaşmasına və cəmiyyətə inteqrasiyasına töhfə verəcək, əmək bacarıqları ilə yanaşı, həyat keyfiyyətinin yaxşılaşdırılmasına yönəlmiş gündəlik fiziki məşqlərin formalaşdırılmasına kömək edəcəkdir. Metodologiya ilə yanaşı, kompleks tədbirlər təkcə orqanizmin funksiyalarının reabilitasiyasına deyil, həm də əlilliyi olan şəxslərin cəmiyyətdə dolğun yaşamaq qabiliyyətinin gücləndirilməsinə, hətta bəzən yenilənməsinə də kömək edəcək. Həyatın təcəssümü olan bu metodika əlilliyi olan insanların reabilitasiyasını daha uğurla həyata keçirməyə imkan verəcək, insanın bitki aləmi ilə köməyi ilə əlaqədar digər imkanlarını açacaq, bununla yanaşı, insanın sosial adaptasiyasını yaxşılaşdıracaqdır, həmçinin emosional və iradi sfera daxil olmaqla. Əlil bir insanın təbiətlə işləməsi zamanı empatiya, iştirakçılıq və başqa bir insanın problemlərini yaşamaq qabiliyyətinin inkişafı prosesi baş verir. Texnika gizli imkanları aktivləşdirmək, özündə yeni resursları kəşf etmək və bunun əsasında insan həyatının keyfiyyətini yaxşılaşdırmaq üçün nəzərdə tutulub. Aşağıdakı istiqamətlərdə də inkişaf var: intellektual (müxtəlif tipli yaddaşın inkişafı, diqqətin, müşahidənin təkmilləşdirilməsi, planlaşdırma və qərar qəbul etmək bacarığı, yeni bacarıqların mənimsənilməsi), idrak (yeni şeylərin dərk edilməsi, öyrənilməsi, xəbərdarlığı, yadda saxlama, bilik.), sosial (ünsiyyət bacarıqlarının təkmilləşdirilməsi , ümumi məqsədə çatmaq üçün qarşılıqlı əlaqə.), emosional, psixoloji (özünə hörmətin artması, özünə inam, uğurdan qürur, məsuliyyət) və fiziki (hərəkət bacarıqlarının inkişafı, əzələ koordinasiyası). V.A. Suxomlinski yazırdı: "Qabiliyyətlərin və istedadların mənşəyi barmaqlarınızın ucundadır. Obrazlı desək, yaradıcı düşüncənin mənbəyini qidalandıran barmaqlardan ən nazik axınlar axır. Təbiət hiss

sistemlərinin (eşitmə, görmə, qoxu, toxunma, dad alma) inkişafı üçün ən zəngin mühitdir.Bundan əlavə, iştirakçılar başa düşürlər ki, bu bitkinin həyatı onlardan asılıdır, ona görə də bitkilərə qulluq prosesi özünə nəzarəti yaxşılaşdırır. Yuxarıda göstərilənlərə əsaslanaraq, tədqiqatın nəticələrinin əlilliyi olan insanlarla işin təşkilində, onların reabilitasiyasında və sosiallaşmasında (Abbasov, 1966: 63) istifadə oluna biləcəyini güman edirik.

Beləliklə, AFT-nin vasitə və metodlarının köməyi ilə insanın həyat qabiliyyətinin inkişafı, psixofiziki vəziyyətinin təmin edilməsi hər bir əlilliyi olan şəxsin sağlam insanlar kimi yaxşı nəticələr göstərməsinə, hətta bəzən daha üstün olmasına səbəb olur.(Ağayev,1982: 48) Bizim gənclərimiz onlara gələcəkdə ehtiyac duyduqları bacarıq və bacarıqları əldə etməyə kömək edəcək adaptiv bədən tərbiyəsindən faydalanmalıdır.

**Elmi fərziyyə**. Tədqiqatın və keçirilən eksperimentin nəticələrinin gələcəkdə əlilliyi olan insanlarla işin təşkilinə, onların reabilitasiyasına və sosiallaşmasına kömək edəcəyi güman edilir.

Eksperiment zamanı təklif olunub ki, proqrama gündəlik AFT dərslərinin daxil edilməsi, nozoloji qrupla bağlı xüsusi məşqlərin yerinə yetirilməsi, işlənib hazırlanmış metodologiyaya uyğun vəsaitlərin istifadəsi ümumi fiziki hazırlığın optimallaşdırılmasına, onun gündəliklə yüklənmə səviyyəsinə müsbət təsir göstərəcək.Bu isə nəticədə stressin,psixoloji baryerin aradan qalxmasına, SIM şəxslərin sosiallaşmasına və reabilitasiya olunmasına, müstəqil və cəmiyyətin tamhüquqlu üzvü kimi inkişafına imkan verir.

Tədqiqatın elmi yeniliyi ondan ibarətdir ki, əlilliyi olan insanlar üçün adaptiv bədən tərbiyəsi vasitələrindən istifadə etməklə metodika işlənib hazırlanmışdır.

**Praktik əhəmiyyəti**. Adaptiv bədən tərbiyəsi dərslərinin metodikasını müxtəlif yaş qruplarından əlilliyi olan şəxslərə tətbiq olunması onların reabilitasiya olunmasına, sosiallaşmasını həyata keçirəməyə, psixoloji maneəni dəf etməyə, həyat qabiliyyətini artıraraq və cəmiyyətin tamhüquqlu üzvünə çevrilməyə kömək edə bilər.

Tədqiqatın nəticələrinin nəzəri əhəmiyyəti AFT sahəsindəolan elmi biliklərəfiziki məşqlərin vasitələri, metodları və formaları haqqında yeni məlumatların əlavə edilməsindədir.

## Tədqiqatın məqsədi

1. AFT fəaliyyətinin insanların həyat qabiliyyətinə təsiri problemi ilə bağlı məsələnin vəziyyətini müəyyən etmək.
2. Əlillərin AFT-yə münasibətini öyrənmək.
3. Əlillərlə AFT məşğələləri zamanı iş təcrübəsini öyrənmək və ümumiləşdirmək.
4. Əlilliyi olan şəxslərin reabilitasiyası və sosiallaşması üzrə metodika və tövsiyələr hazırlamaq.

**Tədqiqat obyekti.**Müxtəlif nozoloji qruplardan 8 nəfər əlilliyi olan şəxstədqiqata cəlb edilib.

**Tədqiqatın predmeti**. Adaptiv bədən tərbiyəsi reabilitasiya və sosiallaşma vasitəsi kimi.

Tədqiqatın nəticəsi iştirakçılar arasında adaptasiya prosesində ünsiyyət zamanı xeyirxahlıq və mehribanlığın, həmçinin verilən hərəkətlərin icrasında müsbət dinamika qeydə alınmışdır. Beləliklə, əlilliyi olan insanların adaptiv bədən tərbiyəsinə münasibətini öyrənmək üçün sorğunun sualları üzrə aşağıdakı məlumatlar əldə edilmişdir:

Riyazi statistikanın nəticələrinə əsasən özünü idarə etmə məlumatlarındakı göstəricilər(nəbz, qan təzyiqi, bədən temperaturu, qanın oksigenlə doyma) təcrübənin normal olması qeydə alındı.

Əlilliyi olan insanlar üçün bitkilərə qulluq zamanı həyata keçirilən fiziki məşqlər və adaptiv bədən tərbiyəsi meyarları yaxşılaşmağa kömək etdi:

1. Ünsiyyət və sosial bacarıqlar - həm qrupda, həmdə ictimai fəaliyyətdə iştirak yolu ilə.
2. Fiziki məşqlərin yerinə yetirilməsi və bitkilərə düzgün qulluq - optimallaşdırılmış gündəlik fiziki fəaliyyət, hərəki bacarıqlarının təkmilləşdirilməsinə töhfə verdi.
3. Güvən inkişaf etdi - bitki baxımı bir sıra yeni bacarıqların inkişafına kömək etdi.

Bitkilərə aktiv və məsuliyyətli qulluq şəklində məqsədyönlü fəaliyyətlə insanların bitkilərlə qarşılıqlı əlaqəsi, eləcə də təbiətə passiv qiymət verməsi əlilliyi olan insanlar üçün bir çox cəhətdən müalicəvi təsir göstərmişdir.

Birincisi, bitkilərə qulluq stressi aradan qaldırır, psixi simptomları azaldır, əhval-ruhiyyəni sabitləşdirir, sakitlik, mənəviyyat və həzz hissi verir.

İkincisi, dərslər diqqəti və idrak qabiliyyətlərini bərpa etməyə imkan verdi.

Üçüncüsü, respondentlərin özünə hörməti və həyat keyfiyyəti yüksəldi, qrupda birliyin və mənsubluq hissinin inkişafı üçün əlverişli atmosfer yaradıldı.

Beşincisi, sağlamlığı məhdudolan insanlar məqsədyönlü fəaliyyətlə məşğul olmağa başladılar və onlarda nailiyyət, məhsuldarlıq və məsuliyyət hissi formalaşdı. Əlilliyi olan respondentlərdən 2 nəfəri bağçılıqda davamlı peşəkar bacarıqlarını inkişaf etdirməyə başladı, digər 2 nəfər stolüstü tennis oynamaq arzusunu bildirdi, respondentlərdən 1-i təbiət rəsmləri çəkməyə başladı, 3 nəfər basketbol və atıcılıq bölməsinə yazıldı, 2 nəfər ünsiyyəti davam etdirmək və gündəlik nümayiş etdirmək qərarına gəldi.

Yuxarıda göstərilənlərə əsaslanaraq belə nəticəyə gələ bilərik ki, bu metodika effektivdir və AFT dərsləri reabilitasiyaya, psixoloji maneəni dəf etməyə, sağlamlıqı məhdud olan insanların həyat qabiliyyətinin yükəlməsinə və sosiallaşmasına kömək edir.

**Ədəbiyyat**


1. Abbasov, T.T. (1966) Idman və mütəhərrik oyunlar. Bakı: Maarif, 63 s.
2. Ağayev, H. (1982) Uşaq idman oyunları. Bakı: Gənclik, 48s.
3. Axundova, S. A. (1980) Azərbaycan uşaq oyunları. Bakı: Gənclik, 59 s.
4. Bayramov ,Ə.S. Əlizadə Ə.Ə. (2002) Psixologiya. Bakı: Çinar, 626 s.
5. Həşimov, Ə. Ş, Sadıqov F. B. (1995) Pedaqoqika /Tərbiyə nəzəriyyəsinə aid mühazirələr/, Bakı: Təbib, 245 s.
6. Hüseynov, F.O. (1966) Igidlik və gözəllik oyunları. Bakı: Azərnəşr, 78 s.
7. Kazımov, N. M. (2005) Məktəb pedaqogikası. Bakı: Çaşıoğlu, 476 s.
8. Məcidov, N.B. (2009) İdman nəzəriyyəsi, Bakı : Nərgiz, 20-43 s.
9. Məcidov, N.B. (2018) Bədən tərbiyəsinin nəzəriyyəsi və metodikası, Bakı: Müəllim, 171-204
10. Məmmədova, Ş.A., Əliyev S A., Əsədullayeva N.T., Əlibəyova S.S. (2012) Gimnastika ilə məşğul olan idmançıların morfofunksional göstəricilərin tədqiqi. Bədən tərbiyəsi və idman sahəsində aparılan elmi-tədqiqat işlərinə həsr edilmiş konfrans materialları, Bakı, Propolis, 2012, səh. 45-52
11. Şabanov, H.M., Məmmədova E. X. (2006) Məşq prosesinin təşkilati- metodiki xüsusiyyətləri Bakı , 8-118 s.
12. Vahidov, F., Ağayev T. (2013) Sosiologiya, Bakı, Zərdabi LTD, 2013, 37, 121-134.
13. Castnıye metodiki adaptivnoyfiziceskoy kulturı Moskva “ Sovetskiy sport”shapkova-l.v.-chastnye-metodiki-adaptivnoj-fizicheskoj-kultury.pdf 55s.


Göndərildi: 01.04.2022 Qəbul edildi: 02.05.2022

DOI: https://www.doi.org/10.36719/2663-4619/78/31-37

**Ləman Aslan qızı Məmmədova**
Naxçıvan Müəllimlər İnstitutu
müəllim
lemanmamedovaa@mail.ru

# AZƏRBAYCANIN GÖRKƏMLİ QADIN RƏSSAMLARININ PORTRET XƏZİNƏSİ

**Xülasə**

Məqalədə Maral Rəhmanzadə, Vəcihə Səmədova, Elmira Şahtaxstinskaya kimi görkəmli Azərbaycan rəssamlarının bəzi əsərləri təhlil edilmişdir. Maral Rəhmanzadənin, mahir fırça ustasının portret əsərləri incəsənətimizin tarixinə boyakarlığın qiymətli nümunələri kimi daxil olmuşdur. Böyük rəssamın portret janrında yüksək sənətkarlıq nümunəsi sayılan əsərləri son dərəcə özünəməxsusluğu ilə səciyyələnir. Maral Rəhmanzadənin yaradıcılığında başlıca xüsusiyyətlərdən biri Azərbaycan qadınına xas gözəlliyin, zərifliyin, məğrurluğun və zəngin mənəvi aləmin parlaq vəhdətidir. Azərbaycanın görkəmli rəssamı Vəcihə Səmədovanın tablolarında isə biz maraqlı rəng çalarları, milli kolorit, kompozisiyanın dinamikliyini və böyük ustalıq görürük. Görkəmli rəssamın belə xüsusiyyətləri ilə seçilən tabloları dünya muzeylərində layiqli yer tutur. Elmira Şaxtaxtinskaya isə daha çox plakat və dəzgah rəsmlərinin müəllifi kimi şöhrət tapmışdır. Rəssamın Azərbaycanın elm, ədəbiyyat və incəsənət xadimlərinin portretlər qalereyası yüksək sənətkarlığı ilə fərqlənir: Üzeyir Hacıbəyovun portreti, Hüseyn Cavidin portreti, Qara Qarayevin portreti, Əcəmi Naxçıvaninin portreti, Sultan Məhəmmədin portreti, Məhəmməd Füzulinin portreti, Məhsəti Gəncəvinin portreti və b.

***Açar sözlər:*** *qadın rəssam, portret, XX əsr təsviri sənəti, rəssam, rəngkarlıq, bədii obraz, rəsm qalereyası*

**Leman Aslan Mamedova**

## Portrait treasury of great Azerbaijan female artists

**Abstract**

The article analyzes some of the works of such outstanding Azerbaijan artists as Maral Rahmanzade, Vajiha Samadova, Elmira Shahtakhstinskaya. The portraits of the great master of the brush Maral Rahmanzade entered the history of our art as valuable examples of painting. The works of the great artis, considered an example of high skill in the genre of portraiture, are distinguished by high originality. One of the main features of Maral Rahmanzade's creativity is a bright unity of beauty, fragility, pride and rich spiritual world of Azerbaijan women. In the paintings of the outstanding Azerbaijan artist Vajiha Samadova, we see interesting shades of colour, national color, dynamism of composition and great skill. The painting s of the famous artist, characterized by such features, a worthy place in museums around the world. Elmira Shahtakhstinskaya is best known as the author of posters and picturesque paintings. Elmira Shahtakhstinskaya has created a portrait gallery of Azerbaijan culture and science figures, which is distinguished by high skill of execution: portrait of Uzeyir Hajibeyov, portrait of Huseyn Javid, portrait of Gara Garayev, portrait of Ajami Nakhchivani, portrait of Sultan Muhammad, portrait of Muhammad Fizuli, portrait of Mehseti Ganjavi, etc.

***Key words:*** *artist, portrait, 20th century fine art, artist, painting, artistic image, art gallery*

## Giriş

Azərbaycan incəsənətində rəssamlıq sənəti dərin tarixi köklərə malikdir. Hər dövrün özü ilə bərabər gətirdiyi qanunauyğunluqlar ilə əlaqədar olaraq Azərbaycan sənətkarları uzun əsrlər boyu insan simasının, bu simadakı zənginliklərin təsvirinə öz duyğu və düşüncə prizmasından yanaşmışlar. Bu baxımdan, Azərbaycan rəssamlıq tarixində bir çox yaradıcı rəssam-qadınlarda incəsənətimizi əvəzsiz əsərlər ilə zənginləşdirmişlər (Allahverdiyeva, 2022: 67). Onların əsərləri incə zövqdən xəbər verən koloriti ilə daha gözəl və maraqlıdır.Görkəmli qadın rəssamlar xüsusilə kompozisiyada işıq və kölgənin işlənməsinə, rənglərin ahəngdarlığına böyük əhəmiyyət verərək, əsərlərində simanın gözəlliyi ilə yanaşı insanın daxili aləminə, psixoloji, fərdi xüsusiyyətlərinə də böyük fikir verirdilər (Məmmədova, 2017: 71).

Maral Rəhmanzadənin adını çəkərkən, bu böyük rəssamın Azərbaycan incəsənətini zənginləşdirən sənət əsərlərindən bəhs etməmək qeyri-mümkündür (Kadjar, 2011: 42). Maral Rəhmanzadə daha çox müxtəlif müəlliflərin əsərlərinə çizdiyi illüstrativ rəsm əsərləri ilə məşhurdur. Onun Azərbaycan Milli İncəsənət muzeyində saxlanılan 1958-ci ildə çəkdiyi "Şah İsmayıl Xətai" və "Natəvan" əsərləri öz gözəlliyi ilə tamaşaçını valeh edir ("Sərvət" albomlar silsiləsi, 2013: 15). Bu əsərlər bir-birini tamamlayan vahid süjet xəttinə malikdirlər. Hər iki rəsmdə rəng seçimi, fon gözəlliyi, obrazların vücudunu oxşayan rüzgarın səsi, onların özlərinin də gözəlliyi inanılmazdır. Burada külək bir tərəfdə duraraq öz ilhamını vərəqlərə tökən Xətainin əlindəki vərəqi uçuraraq, digər tərəfdə olan Natəvana təslim edir. Bu sanki Azərbaycan incəsənətinin nəsildən-nəsilə ötürülməsi və daha böyük əzəmətlə inkişaf etdirilməsi mərhələsini canlandırır. Hər iki rəsmdə külək arxa fonda görünən ağacların budaqlarını, modellərin saçlarını və libaslarını böyük zərifliklə yellədir. Hər iki obraz incə və gözəl üz cizgilərinə malikdirlər. Onların geyimlərindəki milli ornamentlər sarı, mavi, qırmızı rəng çalarları ilə fərqlənir. Lakin bu fərq tablonun ümumi gözəlliyini daha da məftunedici edir.

Maral Rəhmanzadənin öz obrazını canlandırdığı avtoportreti isə xüsusi olaraq vurğulanmağa dəyər bir sənət əsəridir. Portretdə rəssam özünü ağ köynəkdə, çiynində palto, başında şlyapa, saçları çiyninə tökülmüş halda masaya söykənərək təsvir edib. Portret olduqca poetik və ecazkardır. Onun boynundakı mavi şərf geyiminin ümumi gözəlliyi ilə həmahənglik yaradır. Obrazın üz cizgiləri dolğun və cazibədardır. Bu obrazın həm mənəvi, həm də zahiri gözəlliyini əks etdirir. Portretdə bizə baxan qadının incə burnu, nazik dodaqları, bir az çatılmış qaşları, uzaqlara dikilən baxışları rəssam tərəfindən böyük məharətlə verilmişdir. Obrazın ümumi gözəlliyi onun aristokrat kimliyini vurğulayır.

Naturanın bütövlükdə mənimsənilməsi nəticəsində estetik baxımdan gözəl əsərlər yaratmaq, bu əsərlərdə təsvir olunan obrazları vahid harmoniyada canlandırmağa çalışmaq Azərbaycan təsviri sənətinin ən mühüm vəzifələrindən biridir, belə bir mühüm problemin həlli ilə isə biz rəssam Vəcihə Səmədovanın yaratmış olduğu tablolarda qarşılaşırıq. Vəcihə Səmədova zəngin koloriti ilə müxtəlif xarakterli, dünyagörüşlü insanların maraqlı simalarını canlandırır ("Sərvət" albomlar silsiləsi, 2013: 24).



**Maral Rəhmanzadə. Avtoportret. 1948**

Vəcihə Səmədovanın lirik planda işlədiyi əsərlər daha təqdirəlayiqdir. Rəssamın "Aktrisa Leyla Bədirbəylinin portreti" tablosunda istedadlı aktrisanın xəyala dalmış ifadəli baxışları, üz cizgiləri olduqca gözəldir. Milli rəssamlıq sənətinin şedevrlərindən hesab edilən bu əsərdə aktrisanın mənəvi dünyası, onun hiss və emosiyaları sanki portretin ümumi həcmində yerləşdirilən güzgüdə əks olunmuşdur. Modelin bu formada təsviri tabloya xüsusi emosionallıq qazandırmışdır. Bu səhnədə hər hansı bir əsərin növbəti epizodunu ifa etməyə çıxacaq aktrisanın ifa qabağı hazırlıq anlarını canlandırır. Aktrisa və onun portretdəki təsviri olduqca gözəldir. Bu gözəllik onun silahıdır. Və o, əmindir ki, gözəlliyi ilə onu izləyən hər kəsi valeh edəcəkdir. Portretdə də bu əminlik böyük reallıqla əks olunub. Rəssam tərəfindən aktrisanın şəffav libasda təsvir olunması onun vücud gözəlliyini bir daha vurğulayır.

Gözəl sima, bu simadakı incə cizgilər, burun və ağız formalarının mütənasibliyi, həyat eşqi ilə aşıb-daşan qara gözlər insanın gözəllik haqqında düşüncələrinin bütün normalarına uyğundur.

Vəcihə Səmədovanın yaradıcılığında qrup portretlərində təsvir olunan obrazların hər birinin daxili aləminin məharətlə açılmasının şahidi oluruq (Məmmədova, 2017: 123). Qrup portretlərində adətən bir peşədən və yaxud müxtəlif peşədən olan insanlar bir yerdə təsvir olunur. Bu insanların hər birinin xarakterik cəhətlərini vahid bir məkanda verə bilmək olduqca çətindir. Lakin sənətkar bu problemin öhdəsində gəlməyi bacarır. Onun yaratdığı Azərbaycan bəstəkarlarının bir qrupunu təsvir edən "Azərbaycan bəstəkarları" maraqlı əsərlərdəndir. Əsərdə dahi bəstəkar Üzeyir Hacıbəyov öz gənc məsləkdaşlarının əhatəsində canlandırılıb. Onun simasında belə böyük bəstəkarlar nəslinin yetişdirilməsində oynadığı rolun əzəməti hiss olunur. O, ilk başda ətrafında duran gənclərin müəllimidir. Bu gənclərin hər birinə bəstəkarlıq sənətinin sirlərini öyrədib. İndi də zəhmətinin bəhrəsindən zövq almağın vaxtı yetişib. Dahi sənətkar da bu hisslə əlaqədar məğrurdur. O, böyük zövqlə gənclərin birinin royalda ifa etdiyi melodiyanı dinləyir. Onun simasında heyranlıq və qürur hisslərinin qarışıq ifadəsi var. Portretdə obraz dərinliyinə nail olmaq üçün qara və boz rəng çalarlarından istifadə edilmişdir. Portretdə yer alan hər bir obrazın simasında onun həmin andakı əhval-ruhiyyəsi əks olunmuşdur. Dahi sənətkarı əhatə edən bu gənc simalar öz yaradıcılıq təxəyyüllərinin tükənməzliyi ilə fəxr edirlər. Onların hər biri royalda ifa olunan melodiyanın inkişaf xəttinə valehdirlər. Bu simalar ifadəli və realdırlar. Onlar rəssam fırçasından həyat alaraq, daxili dünyalarının gözəlliklərini ifa olunan melodiyadakı gözəl nyuanslarla tamaşaçıya təqdim edirlər.

Vacihə Səmədovanın əsərlərində əmək mövzusu, zəhmətkeş insanların təsviri əhəmiyyətli yerlərdən birini tutur. Onun 1955-ci ildə çəkdiyi "Pambıqçı qız" portretində əmək insanının əzəmətli obrazı yaradılıb. Portretdə gənc qız önlüyündəki pambığı boşaldarkən təsvir olunmuşdur. Bu obraz halal zəhmətin verdiyi qürur hissini yaşayan əmək insanının ümumiləşdirilmiş obrazıdır. Bu portretdə diqqəti əsas cəlb edən cəhət gənc insan simasında aşıb-daşan həyat sevgisidir. Rəssamın bu qəbildən olan bir sıra əsərləri var. Onlar arasında "Qız kitab ilə" (1953-cü il), "Tələbə qız portreti" (1958-ci il), "Gənc memar Solmaz Səmədova" (1960-ci il) və başqaları diqqətəlayiq əsərlərdir ("Sərvət" albomlar silsiləsi, 2013: 36).

"Qız kitab ilə" portretində rəng çalarlarının ziddiyyətindən, işıq və kölgə oyunundan bəhrələnən sənətkar obrazın daxili dünyasını sadə elementlərlə tamaşaçıya çatdırır. Portretdə dizləri üstündə kitab olan gənc qız oturmuş vəziyyətdə təsvir olunmuşdur. Onun vücudunun zərifliyi üz cizgiləri ilə həmahəngdir. Kompozisiyada interyer olduqca sadədir. Qızın oturduğu stul, əlindəki kitab fonla ümumi ahəng daşıyır. Fonun verilməsində rəssam qara, boz, açıq rəngin müxtəlif çalarlarından istifadə etmişdir. Bu portretdə təsvir olunan qızın sadəliyini, mənəviyyatının zənginliyini, düşüncələrinin aliliyini daha da qabarıq formada ifadə olunmasına şərait yaradır.



**Vəcihə Səmədova. Pambıqçı qız. 1955**

Qeyd edim ki, qadın obrazı Tokay Məmmədov yaradıcılığında aparıcı mövzulardan biridir. Sənətkar bütün yaradıcı imkanlarından məharətlə istifadə edərək öz əsərlərində qadın gözəlliyini, onun simasının incə cizgilərini, bu cizgilərdə gizlənən mənəvi dünyanın şıltaqlığını, bəzən məsum, bəzən saf, bəzən melanxolik duyğularını açmağı bacarır. Qadın, onun vücud gözəlliyi, mənəvi dünyası sənətkarın əsərlərində özünün maraqlı plastikası, zərifliyi, aydınlığı ilə yadda qalır. Həmin əsərlərdə olan bu ümumiləşmiş harmoniya sanki şair qələmindən qopub gələn misralardakı qüdrət ilə öz həllini tapıb. Sənətkarın rəssam Vəcihə Səmədovanın obrazını canlandırdığı heykəl-portretində qadın simasının ülviliyi əsərin ümumi plastikası ilə zəngin nyuanslar meydana çıxarır. Onun bu obrazda gördüyü qadın siması məftunedici və zərifdir. Əsərdə sənətkarın istedadlı həmkarının yaradıcılıq təxəyyülünə duyduğu hörmət hissi böyük məhəbbətlə tərənnüm olunub. Onun Vəcihəsi səmimiliyi, gözəlliyi, poetik duyğuları özündə yaşadan qadın, eyni zamanda da mahir sənətkardır. Portretin baxışlarında onun ilham mənbəyinin əsasını təşkil edən yüksək zövqü, yaradıcılıq təfəkkürü birmənalı olaraq əks olunub. Bu intelektual səviyyəsi, zəngin dünyagörüşü ilə hamını valeh edən qadın şəxsiyyətinin ümumiləşmiş obrazıdır. Müəllif böyük məharətlə əsərində qadın ucalığı, mənəvi zənginlik, zahiri gözəlliyi vahid harmoniyada verməyi bacarmışdır.

Portret janrında olan əsərlərin spesifikasını və konsepsiyasını dünyaya və insana olan sevginin etirafı, gözəlliyin, qəlb ağrısı və ya zövqün, iztirab və ya sevincin ifadəsinin təsviri formalaşdırır (Axundzadə, 2011: 94). Bu formalaşmanın düzgün ifadəsi üçün sənətkar müxtəlif yollar yeni axtarır. Onun portretdə yaratdığı obraz bütün bu affektləri dolğun əks etdirməlidir. Bu baxımdan portret janrında rəngarəng obrazlar yaradan rəssam Elmira Şahtaxtinskayanın yaradıcılğı maraqlıdır.

Elmira Şahtaxtinskaya təbiət və insan gözəlliyini ətraf mühitdən, insanlarla gündəlik münasibətindən aldığı təəssüratlar əsasında canlandırır. Əsərlərində həyatiliyin olduqca güclü təzahürü duyulan sənətkar bu həyatiliyi və ondakı gözəlliyi üzvü surətdə tamaşaçıya təqdim edir. Onun “Turan Cavid”, “Məhsəti Gəncəvi”, “Nigar Rəfibəylinin portreti” əsərlərində gözəl Azərbaycan qadınının ümumiləşmiş obrazı yaradılmışdır (“Sərvət” albomlar silsiləsi, 2013: 36). Bu portretlərdə zahiri və mənəvi gözəlliyin həmahəng uyğunlaşması hiss olunur. “Məhsəti Gəncəvi portreti” lirik və poetik cəhətlərə malik sənət əsəridir. Kompozisiyada şairə profildən əlindəki kitabı bağrına basaraq təsvir olunmuşdur. Onun digər əli dizinin üzərindədir. Obrazın simasında onun şair poetikasının incəliyi əks olunmuşdur. Təsvirdə boz, qəhvəyi, narıncı rənglərin tonlarından istifadə edilmişdir. Şairənin söykəndiyi masanın üzərində kağız və qələm görünür.



**Elmira Şahtaxtinskaya. Məhsəti Gəncəvinin portreti. 1984**

O, yazdığı yeni şerində təcəssüm olunan hiss və emosiyalar haqqında düşünür. Fondakı ağacın budaqları interyerə dolğunluq qazandırır. Rəssam interyeri zəngin boyalarla işləmişdir. Şairənin oturuşu, geyim tərzi və obrazı ziyalılığından, zəngin mənəvi dünyasından xəbər verir. Onun siması olduqca gözəldir. Bu simada qəhrəmanın yaşadığı həyat tərzinin izləri görünür. Bu həyat mübarizəsində qazanılan illərin təcrübəsi şairənin mənəvi dünyasını zənginləşdirərək, onun simasına alicənablıq qazandırmışdır. Obrazın məftunedici gözləri, simmetrik qaşları, zərif burnu, dodaqları olduqca gözəldir. Milli geyim tərzi bu gözəlliyi daha da füsünkar edir.

Elmira Şahtaxtinskayanın bütün portretlərində yaratdığı qadın obrazları xüsusilə məlahətəli və gözəldirlər. Rəssam bilərəkdən incə üz cizgilərinə, zərifliyə və zəngin mənəviyyata malik Azərbaycan qadınlarını özü üçün model olaraq seçir (Allahverdiyeva, 2017: 207). Onun “Nigar Rəfibəylinin portreti”ndə hamı tərəfindən sevilən bir sima bizə boylanır. Nigar Rəfibəyli Azərbaycan qadınının bütün gözəl cəhətlərini özündə yaşadan incə ruhlu şairədir. Onun portretində bu cəhət xüsusi olaraq vurğulanmışdır. Portretdəki sima olduqca zərif və məlahətlidir. Ondakı hərəkətlilik naturanın pozasında da hiss olunur. Belə ki, portretin qəhrəmanı xüsusi incəliklə əlini çənəsinə dayayıb. Onun zərif biləkləri, qol əzələlərinin nəcibliyi olduqca gözəl təsvir olunub. Rəssam qəhrəmanını sadə geyimdə tamaşaçıya təqdim edir. Lakin bu sadə geyimdə belə şairə məftunedici zənginliklərə malikdir. Onun üz cizgilərindəki təbii gözəllik mənəviyyatındakı incə duyğuların əks-sədasıdır. Obraz romantik xüsusiyyətlər daşıyır. Bu romantizm tabloya lirik xarakter verir. Sanki şairənin təxəyyülündən süzülən misralardakı nəcib duyğular obrazın simasına hoparaq, ümumi ahəngdarlıq, xüsusi harmoniya yaradır.

Elmira Şahtaxtinskayanın rəssam təfəkküründəki gözəllik anlayışı zəngin koloriti ilə öz həllini tapır. Rəssam yaratdığı portretdə interyeri, obrazın ümumi görünüşünü olduqca maraqlı rənglərlə cilalayır (Məmmədova, 2018: 39). Onun rəng çalarlarında həyatın özü, onun rəngarəngliyi hiss olunur. Bu baxımdan rəssamın Şəki Rəsm qalareyasında saxlanılan “Uzaq gəmilərin kapitanı” portreti olduqca maraqlıdır. Portretdə qara libasda, boynunda mavi şarfı ilə gözəl qadın təsvir olunmuşdur. Portretin adı konkret olaraq onun qəhrəmanının peşəsi haqqında məlumat verir. Bu qəhramanın peşəsi, o cümlədən həyatı dənizlə bağlıdır. Obrazda da dənizə, onun ənginliklərinə heyranlıq hissi təcəssüm etdirilmişdir. Fonda mavi dalğalar şıltaqcasına sahildəki daşlara çırpılır. Dənizin sularının maviliyi obrazın boynundakı şarfın rəngi ilə harmoniya yaradır. Sanki bu mavilik şarfın rəngindən ilham alaraq bu qədər cazibədardır. Obrazın saçları bir qədər ağarmışdır. Bu onun simasına ali hiss qazandırır. Simanın gözəl üz cizgiləri qəhrəmanın peşəsinə, dənizə vurğunluğundan xəbər verir. Bu sima rəssamın digər portretlərində təsvir etdiyi simalar kimi gözəl və alicənabdır. Bu gözəllikdə rəssam özünün gözəllik anlayışına heyranlığını nümayiş etdirir. Rəssamın təfəkküründə qadın gözəlliyi özünün zərifliyi, incəliyi, məlahəti ilə gözəllik qavramının idealına çevrilir. Əsas o deyil ki, təsvir olunan obrazda cizgilərin zahiri gözəlliyi düzgün verilsin, əsas olan odur ki, bu zahiri gözəllik mənəvi gözəlliyin izlərini öz üzərində daşısın. Çünki üz cizgiləri nə qədər gözəl olursa olsun, zəngin mənəviyyata malik olmayan heç bir sima əsla gözəllik idealı kimi qəbul edilmir. Bu gözəllik mənəvi çirkinliklərin təsiri ilə əzilir və nəhayətdə eybəcər görünür. Lakin təsvir olunan gözəl simada mənəvi gözəlliyin nuru əks olunmuşsa, bu sima həqiqi mənada gözəl görünür və gözəllik idealını təcəssüm etdirir. Bu baxımdan da Elmira Şahtaxtinskayanın “Uzaq gəmilərin kapitanı portreti”ndən bizə boylanan obraz daxili və zahiri gözəlliyə malikdir.

Elmira Şahtaxtinskayanın rəsm qalereyasında tarixi şəxsiyyətlərin portretləri özünün rəngarəng obrazlılığı ilə diqqəti cəlb edir. Bu portetlərdə Nizami, Əlişir Nəvai, Bəhmənyar, Səfiəddin Urməvi, Əbdülqadir Marağai, Əcəmi Naxçıvani, Füzuli, Şah İsmayıl Xətai, Qara Qarayev kimi dahi sənətkarların obrazlarında onların mükəmməl sənət dünyalarının əzəməti gözlər önündə canlandırılır (Məmmədova, 2022: 162). Azərbaycan Milli İncəsənət muzeyində saxlanılan bu əsərlər milli mədəniyyətimizin zəngin nyuanslara malik şedevrlərindəndir. Bütün sadalanan portretlərdə rəssama xas yaradıcılıq dəsti-xəttinin şahidi olursan. Belə ki, tabloların işləndiyi rəssamlıq texnikası onların müəllifinin konkret ünvanını nəzərə çarpdırır. Demək olar ki, eyni yaradıcılıq təxəyyülü ilə yaradılmış bu portretlərin hamısında mənəvi gözəllik, daxili dünyanın zənginlikləri obrazın ümumi simasında mütləq şəkildə əks olunmuşdur.

Dahi söz ustası Nizaminin portretində şairin üz cizgiləri ilahi gözəlliyin izlərini əks etdirir. Onun qartal baxışları, azacıq çatılmış qaşları, üzünə xüsusi yaraşıq verən saqqalı, bir-birinə sıxılmış dodaqları incəliklə işlənmişdir. Bütün bunlar portretə lirik nyuanslar qazandırmışdır. Portretdən tamaşaçını izləyən obraz mükəmməllik abidəsidir. Şairin fəlsəfi təfəkkürü, əsərlərində təbliğ olunan ideya ümumi cizgilərlə

obrazın simasında canlandırılıb. Portretə baxarkən ordakı obrazın mənəviyyatının malik olduğu ali keyfiyyətlərə əsla şübhə duymursan. Hiss edirsən ki, yalnız bu qədər gözəl sima daşıyan biri o qədər mükəmməl poeziya yarada bilər.

Elmira Şahtaxtinskayanın "Füzulinin portreti" digər rəssamların bu mövzuda olan əsərlərindən dərin lirizmi ilə fərqlənir. Rəssamın portretindəki Füzuli məhz "məhəbbət şairi" olaraq təqdim olunur. Portretdə şair dizləri üstündə kitab, bu vəziyyətdə oturaraq təsvir edilib. İnteryeri canlı verə bilmək üçün rəssam ağ, mavi qara rənglərinin müxtəlif tonlarından istifadə etmişdir. Şairin bəyaz saqqalı arasından görünən dodaqları, bir az aşağı əyilmiş qaşları altından baxan gözləri onun şeir-sənət dünyasının əzəmətindən danışır. Füzuli bəlkə də ölməz "Leyli Məcnun"unun hər hansı bir hissəsini daha əzəmətli misralar çilalamaq haqqında, bəlkə də "Salam verdim, rüşvət deyil deyə almadılar" deyə üsyan etdiyi "Şikayətnaməsi"nin fəlsəfi ideyası haqqında düşünür. İlk halda şairin mənəviyyatı nə qədər romantik əhval-ruhiyyə daşıyırsa, ikinci halda o, həyata realist münasibət bəsləyir və bu gerçəkliyin acısı onun simasında əks olunur. Rəssam tərəfindən də bu iki hiss obrazda məharətlə vurğulanıb. Onun Füzulisi iki hissin məngənəsində özünün zəngin mənəviyyatı ilə yaşayır. Portretdəki obraz da bu baxımdan gözəldir. Burada zahiri gözəllikdən çox mənəvi zənginliklər ön planda işlənmişdir. Bu zənginliklərdə Füzuli dühasının əzəməti gizlənir.

Böyük Azərbaycan bəstəkarı Qara Qarayevin portreti Elmira Şahtaxtinskaya tərəfindən qeyri-adi formada tamaşaçıya təqdim olunur (Məmmədova, 2019: 55). Bəstəkarın saçları fondakı ağacın budaqlarına qarışıb. Daha doğrusu bəstəkarın siması əzəmətli ağacın gövdəsində təsvir edilib.

Ağac və onun budaqları bir çox halda yaradıcı insan fəaliyyətinin, onun yaratdığı obrazlar sferasının çoxşaxəliliyindən xəbər verir. Portretin də məhz bu formada işlənilməsi Qara Qarayev yaradıcılığının çoxşaxəliyini vurğulayır. Bəlkə də bu çoxşaxəliyi daha əzəmətli göstərməyin ən doğru yolu obrazı bu cür təqdim etməkdir. İnteryerdə bəstəkarın obrazı ağacın gövdəsi ilə harmonik əlaqə yaradır. O, yan profildən çəkilib. Obrazın simasının hər bir cizgisi bizə tanışdır. Bəstəkar yenə öz əsərlərindəki obrazlar dünyasına qərq olub. O, yenə əzəmətli və məftunedicidir. Portretdə rəng çalarlarının yuxarıya doğru tədricən açılması fonda görünən buludların hərəkətliliyi ilə ümumi uyğunluq yaradır. Bu təsvirə hərəkətlilik qazandıraraq, bir növ bəstəkarın fitri istedadının tanrı lütfkarlığı olduğunu diqqətə çatdırır.

Elmira Şahtaxtinskaya tərəfindən yaradılan Səfiəddin Urməvi və Əbdülqadir Marağai portretləri demək olar ki, eyni texnika ilə işlənmişlər. Hər iki portretdə zəmanələrinin böyük müsiqişünas alimləri öz sənətlərinin onlara verdiyi ilhamdan vəcdə gəlmişlər. "Səfiəddin Urməvinin portreti"ndə fonda "Əbdülqadir Marağainin portreti"ndə isə obrazın əlində təsvir olunan ud aləti interyerin zəngin nyuanslarla doldurulmasında əsaslı rol oynayan ünsürlərdir. Hər iki portretin kontur xətləri obrazların sevimli sənətləri ilə məşğul olma anlarını ustalıqla təsvir edir. Səfiəddin Urməvinin yanında, Əbdülqadir Marağainin isə arxasında duran kitab dəsti və ətrafa səpələnmiş vərəqlər fonu dolğunlaşdırır. Obrazların geyim tərzləri bənzər elementlərə malikdirlər. "Səfiəddin Urməvinin portreti"ndə rəssam qara, ağ, mavi, "Əbdülqadir Marağainin portreti"ndə isə sarı, narıncı, qırmızı rənglərin müxtəlif tonlarından istifadə etmişdir. Portretdəki simalara gözəllik qazandıran onların sənət eşqidir. Bu sənət eşqi zəngin mənəvi dəyərlərdən, dahilikdən xəbər verir. Xüsusilə Əbdülqadir Marağai əlindəki ud alətini o qədər incə tutmuşdur ki, sanki bu dəqiqə onun pərdələrindən milli muğamların ecazkar ahəngini duyacaqsan, Səfiəddin Urməvi isə bu muğamların elmi sirlərini qələmə alacaq. Sənətkarlıq baxımından hər iki portretdə ifadə olunan ideya özünün aktuallığı ilə diqqətəlayiqdir. Bu ideya sönməz sənət eşqi, elmə duyulan hədsiz ehtirası tərənnüm edir.

Elmira Şahtaxtinskaya sarı, qırmızı, narıncı rəng çalarlarından daha çox istifadə edərək, yaratdığı rəsm əsərlərində həyat eşqi ilə dolu işıqlı obrazlar yaradılr. Böyük özbək şairi "Əlişir Nəvainin portreti"ndə də rəssam bu rəng tonlarının zəngin çalarlarından istifadə etmişdir. Digər portretlərində olduğu kimi bu portretdə də istedadlı söz ustasının misralarından doğulan əzəmətli şeir dünyasına qədəm basırsan. Şair əlindəki kitabla öz dünyasının sirlərinə qərq olub. Sanki ətrafda nə baş verirsə versin, bu əsla şairi bu sehirli aləmdən qopara bilməyəcək. Obrazın üz cizgiləri, onun keçirdiyi hisslər tamamilə canlı verilmişdir. Arxa fonda görünən fiqurlar şairin yaratdığı sənət əsərlərindəki obrazları xarakterizə edir. Obrazın üz xətlərinin konturu simanın gözəl cizgilərini məharətlə əhatələmişdir. Müdriklik timsalı olan ağ saqqal, ifadəli baxışlar tabloya incə məlahət aşılayır. Obrazın siması qeyri-adi təmizlik və əzəmətli yaradıcılıq eşqi ilə nəfəs alır. Rəssam yaradıcılığına xas olan elementlərin incə nəvazişlə işlənməsi bu tabloda da özünü hiss etdirir.

"Şah İsmayıl Xətainin portreti", "Qətran Təbrizinin porteti" də eyni baxış tərzi ilə yaradılmışlar. Bu tablolarda da obrazlar kitabların göründüyü interyerdə təsvir edilmişlər. Rəssam yenə də bu incə detalda qəhrəmanlarının sənət eşqini təcəssüm etdirir. Hər iki obrazın dövrünə görə zövqlü geyimi, üz konturlarının itiliyi, simalarına çökmüş alicənablıq hissi onların mənəvi zənginliklərindən xəbər verir. Bu səpgidə olan bütün tablolar kimi bu iki portretdə də milli ornamentlər obrazların təsvir olduğu interyerdə deyil, onların mənəviyyatının zənginliklərində hiss olunur. Bu insanlar Şərq dünyasının dahi sənətkarlarıdırlar. Və bu cür tablolar Elmira Şahtaxtinskayanın yaradıcılığında silsiləvi xarakter daşıyaraq, rəssamın gözəllik haqqında təsəvvürlərinin ümumiləşmiş ifadəsi kimi ortaya çıxır.

## Nəticə

Hər bir dövrə aid qanunauyğunluqlar bu mövzunun incəsənətdə işlənməsini fərqli istiqamətlərə yönləndirmiş və hər bir dövr özünəməxsus xüsusiyyətlərlə bu mövzunun işlənməsinə zənginliklər qatmışdır. Azərbaycanda rəssamlıq sənəti və onda təsvir olunan obrazların çoxşaxəlilik qazanması XX əsrdə Azərbaycanda yeni həyat şərtlərinin, yaşayış tərzinin meydana gəlməsi ilə əlaqədardır. Belə ki, zəngin bazaya əsaslanan rəssamlıq məktəblərinin formalaşması incəsənətdə obraz seçiminə fərqli münasibətlə yanaşmağı tələb edirdi. Bu dövrdə Azərbaycanda yaranan rəngkarlıq nümunələrində fərdi və ya konkret şəxsiyyətlərin obrazları canlandırılırdı və bu zaman həmin obrazların xarıci gözəllikləri ilə yanaşı, onların mənəvi aləmi, fəaliyyəti də daha qabarıq əks olunmağa çalışılırdı.Azərbaycanda son illərdə də rəssamlıq sənəti ilə məşğul olan sənətkarlar, görkəmli rəssamlarımızın sənət ənənələrinə müraciət edərək, öz əsərlərində yeni obraz və onun gözəlliyinin təsviri üçün daim yaradıcı axtarışlar aparır, bu sənətə yeni nəfəs gətirməyə çalışırlar. İnsanın həyata keçirdiyi böyük yeniliklər, kəşflər, yaradıcı cəsarətin görünməmiş vüsəti bizim günlərdə bu gerçəkliyə elə bir sürət və həyat gücünün dolğunluğunu vermişdir ki, incəsənətdə insanın daxili aləminin obrazı daha çox hərtərəfli və mükəmməl sima qazanmışdır. Portretdə xarici gözəllik nədəsə ideal və müstəsna olmaqdan əl çəkərək, reallıqla daha möhkəm qovuşdurulur, lakin gündəlik həyatda azalmır, əksinə ondan özünün yeni səslənməsinin bütün dərinliyini və gələcəyə can atmaq pafosunu qavrayır. Azərbaycan milli-mənəvi dəyərləri, qədim, zəngin ənənələri, ulu tarixi ilə dünyada və Şərq ölkələri arasında özünəməxsus yeri olan və inkişaf etmiş ölkələrdən biridir. Xalqımızın mədəniyyəti uzun əsrlər boyu yüksək inkişaf etmiş, böyük təkamül yolu qət edərək, bu günlərə gəlmişdir. Bu gün biz fəxrlə deyə bilərik ki, Azərbaycan milli-mənəvi dəyərləri, yüksək mədəni nailiyyətləri ilə həqiqi mənada qürur hissi keçirməkdə haqlıdır.

## Ədəbiyyat

1. Allahverdiyeva, H. (2022), Rəngkarlığın əsasları, Naxçıvan: Əcəmi.
2. Allahverdiyeva, H. (2017), Naxçıvanın Türk-İslam mədəniyyəti abidələrin təsviri səhnəqrafiyada, Axtarışlar, cild 7, № 3.
3. Axundzadə, L. (2011), XX əsr dünya təsviri incəsənəti, Bakı: Azərnəşr.
4. Məmmədova, L., Əliyev, H. (2017), Təsviri sənət nəzəriyyəsi, Naxçıvan: Əcəmi.
5. Məmmədova, L., Əliyev, H. (2017), Heykəltəraşlıq və rəngkarlıqda insan gözəlliyinin təcəssümü, Naxçıvan: Əcəmi.
6. Məmmədova, L. (2018), Miniatür sənəti, Naxçıvan: Əcəmi.
7. Məmmədova, L. (2019), İncəsənət tarixi fənni üçün tədris-metodik vəsait, Naxçıvan: Əcəmi.
8. Məmmədova, L. (2022), Təsviri sənət məbədi – muzeylər, Naxçıvan: Əcəmi.
9. "Sərvət" albomlar silsiləsi. Vəcihə Səmədova. (2013), Bakı: Şərq-Qərb.
10. "Sərvət" albomlar silsiləsi. Elmira Şaxtaxtinskaya. (2013), Bakı: Şərq-Qərb.
11. "Sərvət" albomlar silsiləsi. Maral Rəhmanzadə. (2013), Bakı: Şərq-Qərb.
12. Kadzhar, G. (2011), Natsionalnoe dostoyanie. Lichnost, № 2 (50

**Rəyçi: s.ü.f.d. Həbibə Allahverdiyeva**

Göndərildi: 02.03.2022 Qəbul edildi: 24.04.2022

DOI: https://www.doi.org/10.36719/2663-4619/78/38-43

**Arzu Ağanəhməd qızı Mirzəyeva**
Azərbaycan Tibb Universiteti
müəllim
mrs.arzu1960@gmail.com

## BƏDƏN DİLİMİZ NƏLƏR DANIŞIR

**Xülasə**

"Bədən dili" insanın emosional vəziyyətinin xarici təzahürüdür. Bu özünü mimika və jestlərdə ifadə edir. İnsani qaməti də, yerişi də jestikulyasiyaya daxildir. "Görünüş" adlandırdığımız bu obraz öz sahibi, onun emosional xüsusiyyətləri haqqında informasiya ötürür. Sifətin diaqnostikası zamanı insanın emosional vəziyyətini,sağlamlığını, psixoloji durumunu müəyyən etmək olur. Qaşlar, gözlər, burun, çənə və qulaqlara görə insanın xarakteri müəyyənləşdirilir. İnsanın təbəssümünün və gülüşünün öz möcüzəsi və mənası var. Gözlərin quruluş və formasından başlamış, baxışların növlərinə qədər insanın fikirlərini, danışığını və davranışını idarə edir. Başın, qolların, əllərin, ayaqların duruşu da insan haqqında informasiya ötürür. Beyinlə əllər arasındakı bağlar, digər orqanlar arasındakı bağlardan çoxdur. Sual olunur: Siz görüşdüyünüz adamın əlini necə sıxırsınız? Hakimiyyət, nüfuz, itaət - hamısı buradan başlayır, yəni ilk görüşdən. Məşhur Xəfiyyə Şerlok Holmosun təbirincə desək, insanın hansı peşə sahibi olduğunu onun dırnaqlarına, paltosunun, köynəyinin qollarına, ayaqqabılarına, şalvarının dizlərinə, barmaqlarındakı döyənəklərə, üzünün ifadəsinə baxan kimi bilmək olur. "Bədən dili"ni öyrənmək nəyin niyə baş verdiyini dərk etməyimizə kömək etdiyi üçün, yaşamağı asanlaşdırır. Ünsiyyət zamanı daha gözüaçıq olmaq başqalarını və nəticədə özümüzü daha dərindən, yaxşı anlamağı öyrətməkdir.

***Açar sözlər:*** *bədən dili, emosiya, nitq, mimika, jestikulyasiya*

**Arzu Aganahmad Mirzayeva**

## What our body language tells

**Abstract**

"Body language" is an external manifestation of a person's emotional state. It manifests itself in facial expressions and gestures. Gesticulation include both posture and gait. This image, which we call "appearance", conveys information about its owner, its emotional characteristics. During the diagnosis of the face, it is possible to determine the emotional state, health and psychological state of the person. Eyebrows, eyes, nose, chin and ears determine a person's character.

A person's smile and laughter have their own miracle and meaning. It controls a person's thoughts, speech, and behavior, from the structure and shape of the eyes to the types of views. The position of the head, arms, hands and feet also convey information about a person.The connections between the brain and the hands are greater than the connections between other organs. The question is: How do you shake the hand of the person you meet? Power, authority, obedience - it all starts here, that is, from the first meeting.

According to the famous detective Sherlock Holmes, it is possible to know a person's profession by looking at his nails, coat, sleeves, shoes, knees of his pants, bruises on his fingers, facial expressions.

Learning body language helps us to understand why things happen and makes life easier. It is to teach us to be more open in communication, to understand others and, as a result, ourselves better.

***Key words:*** *body language, emotion, speech, mimicry,pantomime, gesture*

### Giriş

Yolla gedərkən gözümüzə dəyən işarələrdən biri də yol nişanlarıdır. Eləcə də insan davranışı barədə söz açarkən iki əsas nişanı qeyd edirlər: Verbal və qeyri-verbal. Verbal nişanları tapmaq və müəyyən etmək hər birimizə öyrədilib. Bu nişanlar dayaqlara vurulur və biz tanımadığımız şəhərin küçələrilə

hərəkət edərkən aydın görünür. Qeyri verbal nişanlar da var və onlar hər zaman mövcud olub. Ancaq onları axtarmağı, mənalandırmağı bizə heç kəs öyrətməyib.

Təcrübələr göstərir ki, insanların dedikləri onların demək istədikləri, ya da hiss etdikləri ilə heç də həmişə üst-üstə düşmür.

Hamı bilir ki, siyasətçilər özlərini olduqlarından fərqli aparır, nəyəsə inanmadıqları halda inanırmış kimi davranırlar. Onlar vaxtlarının çoxunu sözdən yayınmağa, söhbətin istiqamətini dəyişməyə, cavabdan qaşmağa, uydurmağa, maska və güzgülərdən istifadə edərək, emosiya və hisslərini gizlətməyə kütlə arasındakı xəyali dostlara əl yelləməyə sərf edirlər. Şübhəsiz belələri bir gün büdrəyir - bədən dilinin işarələri onları ifşa edir.

İnsanların nitqi formalaşana qədər onlar hiss və həyəcanlarını bədən hərəkətləriylə, boğazdan çıxan səslərlə ifadə ediblər. Danışıq dili 2 milyon il əvvəldən başlayaraq, 500 min il əvvələ qədər formalaşıb. Bu zaman ərzində insanların beyninin ölşüsü 3 dəfə artıb. Beləliklə, nitq təkamül dövrünün sonlarında ünsüyyət repertuarının bir hissəsi olub, əsasən faktları və rəqəmləri ötürmək üçün istifadə olunur. Sadəcə sözlərə fokslandığımız üçün bədən dilindən çoxlarının xəbəri yoxdur və onun əhəmiyyətini nəzərə almırlar.

Çarli Çaplin kimi səssiz film aktyorları bədən dilində danışmağı bacaran pionerlər idi axı o zamanki ekranda mümkün olan yeganə ünsiyyət vasitəsi bu idi. Aktyorun qabiliyyəti, onun istifadə edə bildiyi bədən dili işarələri və jestlərin sayı ilə ölçülürdü. Film səsli olandan sonra aktyorluğa baxış dəyişdi və səssiz film qəhrəmanlarının çoxu yaddan çıxdı, yalnız yaxşı nitqi olanlar qaldılar.

Maraqlıdır ki, şifahi nitq bədən dilinin ünsiyyət üçün həmişə əhəmiyyətli olmuşdur. Çox istifadə olunan ifadələri xatırlayaq: "*Gözümün içinə bax", "Başını dik tut","Dilini dinc saxla", "Ürəyini boşalt", "Qoy əlindən gələni eləsin", "Ailənin yükü onun çiynindədir", "Burnun girməyən yerə başını salma"* və s. Elə sözlər var ki, onları yazmaq, eşidəndə isə udmaq olmur, amma etiraf edək ki, bu cür ifadələr bizim gözümüzü açır. Dediklərimizi qulaqardına vura, ideyaya ağız büzə bilərik. Ancaq bu ifadələrin sizə toxunacağına inanırıq.

Bədən diliylə bağlı XX əsrə qədərki araşdırmaların ən nüfuzlusu Çarlz Darvinin "İnsan və heyvanda emosiyaların ifadəsi" əsəridir. Bu kitab 1872-ci ildə nəşr olunub. Mimikalar və Jestlərlə bağlı araşdırmaların əsası məhz bu əsərlə qoyulmuşdur.

İnsanın inkişaf etdiyi min illər ərzində bədən dilinə əhəmiyyət verilməyib. Bu dil 1950-ci illərdən sonra öyrənilməyə başlayıb. Bədən dilini öyrənməyə başlayan Albert Mehrabian hələ 1950-ci ildə yazırdı ki, məlumatın təsirinin 7 %-i sözün, 38%-i səsin (danışıq tonu, intonasiya və başqa səslərin), 55% - i sözsüz informasiyanın payına düşür. Yəni "Məsələ sizin dediyiniz sözdə deyil, sözü deyərkən necə görünməyinizdədir".

Sözsüz ünsiyyət haqda ilk dəfə danışanlardan biri də antropoloq Rey Bördvistel idi. Onun araşdırdığı sahə kinesika (bədən hərəkətlərinin dili) idi. Onun hesablarına görə bir adam gündə orta hesabla 10-11 dəqiqə danışır və 1 cümlə cəmi 2,5 saniyə vaxt aparır. Biz insanlar 250 min mimikanı canlandıra və anlaya bilərik. Bördvistel aşkar etmişdi ki, üzbəüz ünsiyyətin söz payı 35%-dən aşağıdır, 65%-i sözsüzdür.

Təcrübələr və müşahidələr göstərir ki, işgüzar görüşlərdə danışıq masası ətrafında əyləşənlərə təsirin 60-80% -i bədən dilinin üzərinə düşür. Yəni şəxs barəsində ilkin təəssüratın 60-80% -i 4 dəqiqədən də az müddətə formalaşır. Telefon danışıqları zamanı kimin arqumenti daha güclüdürsə o udur. Üzbəüz söhbətdə isə şərtlər tamamilə dəyişir, çünki çoxumuz eşitdiklərimiz yox, gördüklərimiz əsasında qərar veririk.

Tədqiqatçıların çoxu razılaşır ki, sözlər informasiyanı ötürmək üçün istifadə olunur. Bədən dili isə birbaşa insanlararası münasibətlərin dilidir və bəzən şifahi nitqi əvəz edir. Məsələn, qadın kişiyə bircə "oğrun" baxışıyla elə mesaj göndərə bilər ki, sözə ehtiyac qalmaz.

İnsan psixikasında ayrıca bir sahə emosional sahə mövcuddur. Emosional sahə mürəkkəb psixi hadisələrin təsiri ilə dəyişə bilir. Emosiyaların başlıca funksiyası insanların qarşılıqlı anlaşması, bir-birini başa düşməsi yalnız nitqin deyil, bədən dili öz düşüncələrini ötürməsi, mühakimə yürütməsi, ünsiyyətdə əlverişli əlaqələr qura bilməsi üçün lazımdır. Bu baxımdan emosiyalar insanı sosial psixoloji cəhətdən xarakterizə edir.

İnsan öz emosiyalarını ifadə etmək üçün müxtəlif vasitələrdən istifadə edir. Mədəni, intelektual, yaş, cins, peşə xüsusiyyətləri həm emosiyaların modallığının tanınmasının dəqiqliyinə həm də, onların təzahürünün intensivliyinin qiymətləndirilməsinə təsir göstərir. Bu insanın mənsub olduğu xalqın milli xüsusiyyətlərindən daha çox asılıdır. Hər bir xalqın milli rəqslərini müşahidə edərək onlarda bədən hərərkətlərinin stereotipliyini aydın şəkildə görə bilərik.

İnsanlar özlərinin emosional vəziyyətini iki yolla təzahür etdirir. Verbal və qeyri verbal. Emosiyaların başlıca ifadə vasitələri nitq, mimika, pantomimika, jestkuliyasiyadır. Bu mənada "Emosiya nədir" sualı elmdə müxtəlif şəkildə cavablandırılmışdır (İzard, 2008: 460)

İnsanın emosional vəziyyətini başa düşməyin vacib vasitəsi onun nitqidir. Lakin insanın yalnız səslər çıxardığı körpəlik dövrü var. Bioloji baxımdan əhəmiyyətli olan bu siqnallar dəqiq qiymətlədirilir. İnsanın emosiya və hisslərinin fəaliyyətinə ikinci siqnal sistemi təsir göstərir. İnsan nəinki əşya və fiziki təsirdən, sözdən də təsirlənə bilir. İkinci siqnal sisteminin fəaliyyəti nəticəsində insanda əxlaqi, intelektual və estetik hisslər formalaşır.

Bu mənada psixologiyada iki uyğun anlayış formalaşmışdır. Bədənin mimika və jestlərini ifadə edən bədən dili və nitqdə emosional balın məzmununu ifadə edən "emosional ton" yaxud nitqin emosionallığı (Vilyunas,1984: 403)

Bədən dili mimika və jestlərdə özünü göstərir. İnsanın qaməti və yerişi jestikulyasiyaya aiddir. "Görünüş" adlandırdığımız bu obraz öz sahibi haqqında bizə onun emosional xüsusiyyətləri barədə informasiya ötürür. Bir sözlə münasibətlərin, eləcə də bir sıra şəxsi keyfiyyətlərin xarakteri insanın qamətində, yerişində, davranışında təzahür edir. (Drujinin 2003: 114)

Bədən dili adamın emosional vəziyyətinin xarici təzahürüdür. Məsələn, artıq çəkisindən utanan kişi çənəsinin altındakı dərini dartmağa çalışır, budlarının çox yoğun olduğunu bilən qadın donunu aşağı çəkir. Qorxu hissi olan ehtiyatlanan adam ya qollarını sinəsində çarpazlayır, yada ayağını ayağının üstünə aşırır, yaxud hər ikisini edir.

Bədən dilini anlamaq üçün adamların dediklərinə qulaq asmaqla yanaşı, onların hansı şəraitdə danışdıqlarını nəzərə almaq, adamın emosional vəziyyətini qiymətləndirmək lazımdır.

Biz nə vaxtsa *"Ürəyimə nəsə damıb"* ya da "mənə yalan dediklərini hiss edirəm" kimi ifadələr işlədiriksə deməli qarşımızdakının dedikləriylə bədən hərəkətləri arasında bağlılıq görmürük. Əslində qadınlar kişilərdən daha perspektivdirlər və biz bunu çox vaxt "*qadın intiusiyası*" deyə ifadə edirik. Qadınlar sözsüz işarələri tutmaq və şifrələməkdə fitri istedada malikdirlər, eləcə də kiçik detalları görməkdə sərrastırlar.

Harvard Universitetinin tədqiqatları göstərir ki, qadınlar bədən dilinin işarələrinə kişilərdən daha çox diqqət edirlər. Onlar qadın və kişinin söhbət etdiyi bir neçə kiçik filmi nümayiş etdirib, sonra baxanlardan film qəhrəmanlarının nə haqda danışdıqlarını soruşublar, Qadınların 87%-i filmdəki situasiyanı dəqiqliklə ifadə edib, kişilərin göstəricisi 42% olub. Kişilər arasında bəzi peşə sahiblərinin məsələn, rəssamların, aktyorların, xəstələrə qulluq etməklə məşğul olanların, bir də homoseksualların göstəricisi yuxarı olub.

Qadınların çoxunun beyni elədir ki, söhbətdə planetin istənilən kişisini üsələyərlər. Maqnit Rezonans Tomoqrafiya (MRT) aydın göstərir ki, qadın beynində başqalarının davranışını qiymətləndirməyə xidmət edən 14-16 zona var, kişi beynində bu zonaların sayı 4-6-dır. Qadınların bircə ziyafətə getməklə masadakı cütlüklərin münasibətləri haqda mülahizə yürütməsinin səbəbi bununla izah olunur. Yəqin buna görədir ki, qadınların fikrincə kişilər çox danışmağı sevmir, kişilərin fikrincə qadınlar heç susmurlar (2, 20)

Sifətin dioqnostikası zamanı insanın emosional vəziyyətini, sağlamlığını, psixoloji durumunu müəyyən etmək mümkün olur. Qaşlar, gözlər, burun, çənə və qulaqlara görə insanın xarakteri müəyyənləşdirilir.

Dəyirmi (yumru) sifət xeyirxah qəlbdən, xoş, yumuşaq xasiyyətdən xəbər verir. Bu insanlar başqaları tərəfindən sevilmələrinə baxmayaraq şöhrətə can atmırlar.

Uzun sifət - həssaslığı, tarazlığı, nizam-intizamı bildirir. Bu insanlar yaxşı təşkilatçılıq qabiliyyətinə, məqsədyönümlü xarakterə malikdirlər.

Üçbucaqlı sifət - yüksək həssaslığı və yüksək istedadı bildirir. Belə adamlar da hiyləgər, bədrəftar, qılıqsız olurlar.

Kvadrat formalı sifət - qəddar (kəskin), amansız, kobud, münasibətlərdə qeyri-sabitdirlər. Uğurlara, liderliyə hərisliklə can atır, öz fəaliyyətini daim ona doğru yönəldirlər.

N. Proxorov *"baxışların dili"* nə xüsusi önəm verir. Belə ki, tam açılmış gözlər, yüksək həssaslıq, həyatsevərlik, mühakiməlilik əlamətidir. Həddindən artıq geniş açılmış gözlər ətraf mühitə bağlılıq hissi yaradır. Qapalı və ya yarımqapalı gözlər, ətraf aləmə qarşı laqeydliyin, biganə münasibətin, yorğunluğun simvoludur.

Dar və qıyılmış baxışlar, ya mərkəzləşmiş diqqət, ya da yanakı baxmaqla nizamlanırsa, mənfi münasibəti, düşmənçiliyi, hiyləgərliyi, simvolizə edir. Düz və aydın baxış partnyora birbaşa açıq münasibəti, maraqlılığı, inamı, birbaşa qarşılıqlı münasibətlərə hazırlığı bildirir. Yanakı, gözünün ucu ilə baxmaq tam cavab verməyə hazır olmamaq, etibarsızlıq bildirir.

Başaşağı əyilərək aşağıdan baxmaq, ya aqressiv münasibətə hazırlığı, ya da baş çiyinə sıxılmış vəziyyətdə baxmaq tabe olmağı, sakitliyi ifadə edir.

Aşağıdan yuxarıya, geriyə əyilmiş baş və bu vəziyyətdə baxmaq özünüöymə, eqoizm, nifrət, hakimiyyət axtarışı ifadə edir. Baxışlarda qaşlar, onun təbii quruluşu, ünsiyyət zamanı vəziyyəti, gözlərlə mimik koordinasiyası mühüm əhəmiyyət kəsb edir. Qaşlar isə ümumilikdə əsəb sisteminin funksiyasını ifadə edir.

Masa arxasına oturub boyunbağısı ilə oynamağa başlayan qadının bu hərəkəti onun gərgin olmasından xəbər verir.

Üzə toxunma və ya tumarlama, alnı ovuşdurma, dodağı yalama, dodağa toxunma və sürtmə, baş və şəhadət barmağı ilə qulaq və mərcəyini (sırğa taxılan yumuşaq hissə) dartma və ya masaj etmə, üzü və ya saqqalı sığallama, saçla oynama kimi davranışların hamısı stresli halla üzləşən şəxsin sakitləşməsinə xidmət edir. Fit çalmaq da sakitləşdirici davranışdır. Bəzi insanlar qaranlıq və tanış olmayan yolda addımlayarkən sakitləşmək üçün fit çalırlar. Stress hallarında sakitləşmə məqsədilə özlər ilə danışanlara da rast gəlinir.

Bəzən stress altında olan insanların həddən artıq əsnədiyini görürük. Stress zamanı ağız quruyur əsnəmə tüpürcək vəzilərini işə salır. Gərginlik halında ağızın daxilində və çevrəsində olan müxtəlif "strukturlar" tüpürcək vəzilərinin qurumuş ağıza nəmlik buraxmasına səbəb olur. Bu halda əsnəməyə səbəb yuxusuzluq yox, stress olur (Carlins, 2004: 48)

Bloklama davranışı iş adamının gözlərini qapaması və ya ovuşdurması, həmçinin əli ilə üzünü örtməsi formalarında da təzahür edə bilər. Göz bloklaması çox güclü narahatlıq, inamsızlıq, və ya narazılığın təzahürüdür (Carlins, 2004: 34)

Boyun batığını (yaxasını) qapamaq, güvənsizlik, emosional diskomfort, qorxu və narahatlıqdan xəbər verən sakitləşdirici davranışdır.

Əli ilə boyuna toxunma emosional diskomfort, şübhə və güvənsizlik hallarında müşahidə olunur.

Əli ilə yanağa və üzə toxunma gərgin olarkən sakitləşdirmənin bir yoludur.

Dərindən nəfəs aldıqdan sonra həmin havanı yavaş-yavaş buraxmaq stressdən qurtulmanın ən geniş yayılmış vasitələrindəndir.

Qalstuku qaydaya salma güvənsizlik və diskomfort əlamətidir.

Burnuna toxunmaq Çikaqoda Qoxu və Dadbilmə orqanlarının Müalicəsi və Araşdırılması Mərkəzindəki alimlər aşkar ediblər ki, insan yalan danışan vaxt burnunda katexolamin adlanan maddə burnun içindəki toxumaların şişməsinə səbəb olur. Alimlər yalan danışan adamın qan təzyiqinin artdığını, burnunu genişləndirdiyini, böyüdüyünü müəyyən etmişlər. Buna "Pinokio effekkti" deyilir (Allan, Barbaar, 2004:147)

Adətən, uşaq bir şeydən qorxanda nəyisə görmək istəməyəndə əlləri ya da bir əli ilə gözlərini bağlayır. Böyüklər də nəyəsə baxmaq istəməyəndə gözlərini ovxalamağa, qaşımağa başlayırlar. Bununla beyin gözləri bağlamağa cəhd edir, yalanı, pisliyi, onu aldadanı görmək istəmədiyini bildirir.

Qulaqdan yapışmaq eşitmək istəməmək cəhdidir. Adətən valideynlərinin danlağından təngə gələn uşaq əllərilə qulaqlarını yumur. Eşitdiyi sözlərə qulaqlarını yummaq istəyən böyük isə əlini qaldırıb qulağının ətrafında, üzərində gəzdirir, sırğalığından yapışır.

Danışanda bəzən boynumuzu yazan əlimizin şəhadət barmağıyla sırğalıqdan aşağı hissəsini qaşıyırıq. Bu jest şübhə və tərəddüdün ifadəsidir. Məsələn, "əmin deyiləm", "inanmıram" deyən adama xasdır.

İnsanın təkamülü boyu əl ən vacib alət olub və beyinlə əllər arasında bağlar çoxdur. Belə ki, açıq əllər tarix boyu düzlüyün, dürüstlüyün, sədaqət və itaətin əlaməti olub. "Açıq əl" jesti hər yerdə istifadə olunur, siyasətçilər bununla açıq və səmimi olduqlarını göstərmək istəyirlər. Gecəni harada keçirdiyini demək istəməyən kişidən izahat istəyəndə əllərini ya cibində saxlayır, ya da qoynunda gizlədir. Amma duruşu onu ələ verir, qadın bu vəziyyətdə danışan kişiyə inanmır. Nəsə gizlətməyə çalışan qadın isə mövzunu dəyişir, məsələyə dəxli olmayan "əlli" şey haqda danışır, eyni zamanda müxtəlif işlərlə məşğul olur.

Ən güclü bədən siqnallarından biri də adamın ovucunun içindən gəlir - əmr və göstəriş verəndə, əl sıxanda. Əllə üç əsas əmr jesti var: əlin içi yuxarı; əlin içi aşağı, işarə edən barmaq.

"Əlin içi yuxarı", itaəti, təhlükəsizliyi ifadə edən jestdir. Açıq əllər qədim zamanlarda silahın olmadığını göstərib. Xahiş edəndə əliniz bu vəziyyətdədirsə, qarşınızdakı rahat olacaq, nədə və ya təzyiq hissi olmayacaq.

"Əlin içi aşağı" dadırsa siz bilavasitə hakimiyyət göstərirsiniz. Qarşınızdakı sizinlə eyni statusa malikdirsə, birinci halda ("Əlin içi yuxarı") sizin dediyinizi edər, amma ikinci halda ("Əlin içi aşağı") istəyinizi yerinə yetirməkdən imtina eləyə bilər.

İşarət barmağı edən: Burda şəhadət barmağı dəyənəyin – özünüzə tabe etmək istədiyiniz adama vurduğunuz dəyənəyin rəmzidir. Bu jest neqativ hisslər yaradır və ən xoşagəlməz jestlərdən biridir. Malaziyada və Fleppində insanı barmaqla göstərmək onu təhqir etməkdir, çünki yalnız heyvanı belə göstərmək olar. Malaziyalılar insanı, eləcə də istiqaməti baş barmaqları ilə göstərirlər.

Əllə salamlaşma qədimdən qalıb. İndi də bir-birimizin ovucunu bağlayıb sıxırıq. Çox yerdə əl sıxandan sonra 5-7 dəfəyə qədər silkələyirlər.

Dünyada ən çox əl sıxanlar fransızlardır, həm salamlaşmada, həm də sağollaşmada əl sıxır, bu jestə xeyli vaxt sərf edirlər. Əl sıxaraq salamlaşan qadın dünyagörüşlü adam kimi müsbət təsir bağışlayır. İşgüzar qadınlar vaxtında özləri əllərini uzadırlar ki, qarşısındakı kişinin əlləri havada qalmasın.

İkiəlli salamlaşma siyasətçilərin ən çox istifadə etdiyi jestdir. Bu cür salamlaşma sanki qucaqlaşmanın kiçik formasıdır. Ona görə də yalnız qucaqlaya bildiyiniz adamı ikiəlli salamlaya bilərsiniz. Buna "əlcək" də deyirlər.

Qolları sinədə çarpazlamaq, xoşlamadığınız əşya və ya adamla öz aranızda sədd çəkmək cəhdidir. Dünyanın hər yerində narazılığın ya da müdafiənin göstəricisidir. İnsan qollarını sinəsində nə qədər çox saxlayarsa, bir o qədər neqativ düşünər. Sıxılmış yumruq, çarpazlanmış qol ədalətin göstəricisidir.

Zaponka taxan kişilər səhnəyə çıxanda onu düzəldirmiş kimi hərəkət edirlər. Bu şahzadə Çarlizin ən çox istifadə etdiyi jestlərdəndir, o da hamının gözü qarşısında, yeriyəndə əlini zaponkasına atır. Onun əlini biləyindən saxlaması narahat olduğunu göstərir.

Narahat və utancaq kişilər tez-tez saatın bağın düzəldir, portmanatının içinə baxır, əllərini bir-birinə sürtür ya sıxır, köynəyinin qoluyla "oynayır "Yəni bütün hallarda qol bədənin qarşısına sədd çəkir. Qadınlar utananda, özlərinə əmin olmayanda pul kisəsi və ya əl çantası kimi əşyaları sıxa bilərlər. Kraliça Yelizavetanın qızı şahzadə Anna xalq arasına çıxanda özü ilə ya gül, ya da çanta götürür, Kraliça çantadan ona rahatlıq verən bir əşya kimi, ya da mesaj göndərmək üçün istifadə edir (Allan, Barbaar, 2004:100). Əllərini bir-birinə sürtən adam pozitiv nəticə gözlədiyini, ümid ediyini bildirir.

Pərçimlənmiş əllər ehtiyatı, narahatlığı, neqativ münasibəti göstərir. Danışıqlar üzrə mütəxəsislər - Niyerenberq və Kaleronun araşdırmaları göstərir ki, pərçimlənmiş əllər danışıqlar zamanı məyusluğu ümidlərin boşa çıxdığını, planların pozulduğunu bildirir (Allan, Barbaar, 2004:129)

Əlləri arxada birləşdirmək üstünlük, arxayınlıq və hakimiyyət deməkdir. Əllərini arxada birləşdirərək, başını dik, çənəsini irəli tutub gəzmək Edenburq Herseqonun və Britaniya kral ailəsinin bir neçə başqa kişi üzvlərinin vərdişidir (Allan, Barbaar, 2004:133)

Baş barmaq cibə girmir: bu jest özünü başqalarından artıq hesab edən, üstünlüyünü hiss edən adama məxsusdur. Şahzadə Çarlizin sevimli jestlərindəndir, onun özünə arxayınlığını göstərir (Allan, Barbaar, 2004:136)

Baş barmaqlar bəzən şalvarın arxa cibindən çıxır, sanki danışan dominantlığını gizlətməyə çalışır.

keçirmək istəklərinə qarşı çıxış edərək bütün müharibələrə qarşı etiraz səsini ucaldır. O, sözü gedən əsərdə Sokolov obrazını yaratmaqla müharibədə əzizlərini, doğmalarını itirmiş bütün insanlara təsəlli verir. Əsərin baş qəhrəmanı sayılan Sokolov bütün ailə üzvlərini itirməsinə baxmayaraq, müharibədən sonra tək qalmış Vanyanı himayəyə götürərək yaşamaq üçün özünə səbəb tapa bildi. Müharibənin çətin dönəmindən keçərək övladlarını itirən atalar atalarını itirmiş vanyalar üçün öz ataları əvəz etməlidir. Yazıçı müdrikcəsinə müharibənin insanları ayırdığı kimi, həm də onları birləşdirmək bəşəri ideyasını oxucularına sənətkarlıqla çatdırmışdır.Tanrı bütün itkilərin müqabilində Sokolova Vanyanı bəxş edir. Sokolov Vanyanın öz bəxtəvər uşaqlığını yaşaması üçün sonrakı həyatını ona həsr edir.

Qeyd etmək lazımdır ki, M.Şoloxov Sokolov obrazında rus milli xarakterinin ən mühüm cizgilərini vermişdir. Sokolov faşistlərlə münasibətdə itaətkarlığa yox, təmkinliliyə üstünlük verməklə, rus insanının zəngin, sadə, insanlıq və şəxsi keyfiyyətlərini əks etdirmişdir ki, bu xüsusiyyətlər onun xarakterik cizgiləri kimi diqqəti cəlb edir (8).

Elə Vanyaya sahib çıxmaqla Andrey Sokolov müharibənin vurduğu yaraları bir fərd olaraq sağaltmaq istəyir, bu yolda özü nümunə olur. Çünki müharibənin törətdiyi dağıntılar xalqların tarixi taleyində dərin iz buraxır və bu yaraları sağaltmaq üçün uzun bir zamana ehtiyac yaranır. Şəhərlər dağılırsa, insan nəsli budanır, şikəst edilir, ruhi-mənəvi sarsıntılar insanların sonrakı həyatına təsir göstərir. Arxa cəbhədə sağ qalanlar da mənən yaralanmış insanlardır. Əsərdə müharibə bəşəriyyətin rifah içində yaşaması üçün bir maneə hesab olunur və yaşamaq, var olmaq üçün bu təhlükəni dəf etməyin lazım olduğu vurğulanır.

Don kazaklarının bəxtinə düşmüş məhrumiyyətlər, kataklizmlər Mixail Şoloxovun qələmində ədəbiyyat faktına çevrildi. "İnsanın taleyi" isə konkret olaraq bir fərdin və ya fərdlərin deyil, bütöv şəkildə insanlığın taleyini özündə ehtiva edir. Ədəbiyyatın başlıca predmeti insandır və Şoloxov bu əsərdə iki rus insanının timsalında həyatın əbədi qanunu olan doğuluş və ölümü bir hadisə kimi gerçəkləşdirir. Bu əsərdə insanın ölümü birbaşa təsvir edilmir. Ölümlə mübarizə aparan insanın tədricən ölümə məğlub olmasını, məhv olma prosesini ağrılı şəkildə göstərir. Amma bu ölüm həyatın sonu deyil, bütün itkilərə rəğmən insan yaşamağa məhkumdur. Ölənlərin yarımçıq qalan ömrünü qalanlar davam etdirir. Həcmcə kiçik olsa da əsərin mərkəzində mahiyyət etibarilə böyük bir məqsəd dayanır. Elə əsərlər var ki, əhatə dairəsi genişdir, amma dərin deyil. Amma "İnsanın taleyi" özündə həm genişliyi, həm də dərinliyi birləşdirir, oxucunun yaddaşında dərin iz buraxır. Bu əsərdə insanın məğlubedilməzliyi, həyat dözülməz olanda da özündə güc tapıb yaşamaq üçün bir səbəb tapa bilməsi xüsusiyyətidir (4).

Şoloxovun "Sakit Don" romanı dünya ədəbiyyatının ən qüdrətli əsərlərindən, şedevrlərindən biridir. Bu əsərin ən başlıca qəhrəmanlarından biri, bəlkə də lap elə baş qəhrəmanı zamandır. Sözü gedən əsərdə yazıçı həmin dövrün müharibə şəraitini və onun insanların həyatına, taleyinə təsirini dövrün bütün reallıqları çərçivəsində təsvir etmişdir. Şoloxovun "Sakit Don" əsərində konkret siyasi və tarixi şəraitdən asılı olmayaraq əbədi (ümumbəşəri) dəyərlərin əsas mənəvi imperativolduğu da oxucuya çatdırılır. Yəni əsərin problematikası milli problematikanın hüdudlarından kənara çıxır. M.Şoloxov bunu Qriqori Melexov obrazında bir-birinə qarşı ideologiyaların mübarizəsi ilə açıqlayır.Mərhum tərcüməçi Cahanbaxş Soloxovun "Sakit Don" əsərini dilimizə çox yüksək səviyyədə tərcümə etməklə, müəllifin insanlara çatdırmaq istədiyi dəyərləri bütün incəlikləri ilə təsvir etmişdir (1).

Mixail Şoloxovun "Sakit Don" roman - epopeyasında kapitalizmin yayılması- nın, Birinci Dünya müharibəsinin, rus inqilablarının və vətəndaş müharibəsinin kazakların həyatına və tarixi talelərinə təsiri əksini tapmışdır. Sadə əsgərdən diviziya komandiri vəzifəsinə, general rütbəsinə qədər yüksəlmiş Qriqori Melexovun obrazında çarizm, kapitalizm və sosializm tərəfdarına xas xüsusiyyətlər verilir. Lakin sonra isə bütün bu ideyalar qəhrəmanın içində öldürülür. Sonda müharibənin hər üzünü görmüşQriqori Melexov bir kazakkimi nə yaranmış sovetlərə qarşı çıxır, nə də ki, onun qurulması üçün mübarizə aparır. Arzusu ailəsinin başına keçib əkin əkmək, torpaq becərmək olmuşqəhrəman mübarizədən imtina edərək neytral mövqedə dayanır. Yaxınlarını,doğmalarını itirmiş Qriqori Melexov «həyatda onu torpaqla və bütün bu nəhəng, soyuq günəş altında parıldayan dünya ilə bağlayan yeganə yadigarı» oğlu Mişatka ilə qalır.

Qeyd etmək lazımdır ki, "Sakit Don"da yazıçı həmçinin milli mənsubiyyət probleminə də toxunur. Lakin, yazarlar bu problemi müxtəlif şəkildə əksetdirirlər.M.Şoloxov kazakların milli mənsubluğu sualına konkret cavab verir. Milli mənsubiyyətləri mübahisə doğuran kazaklar gah rus millətinin subetnik qruplarına aid edilir, gah da türk xalqları ilə qarışıqdan formalaşdığı iddia edilir. Kazaklar isə özlərini heç bir subetnosa və ya qarışığa aid etməyərək, özlərini ayrıca xalq hesab edirlər. M.Şoloxov "Sakit Don" roman-epopeyasında kazakların mənşələrinə necə yanaşması faktına komissar Ştokmanın kazakların rusların törəməsi olması replikasına cavabı ilə toxunur: "Kazaklar kazaklardan əmələ gəlib" (9).

M.Şoloxov "Sakit Don" roman-epopeyasında kazak etnosunun taleyini göstərir. "Sakit Don"un problematikası ənənəvi milli həyat tərzinin və dəyərlərin sosial kataklizmlər nəticəsində dəyişməsi ilə əlaqəlidir. Bu əsərdə xalqın keşməkeşli taleyi, müharibə və inqilabın mənəviyyatda əmələ gətirdiyi köklü dəyişikliklər realist üslubda göstərilir.Şoloxovun əsərlərindəki kazaklar rus ədəbiyyatında olan digər kazaklardan əsaslı şəkildə fərqlənir. "Sakit Don"da epoxal kolliziyalar təhlil və təsvir olunaraq təkcə bir nəfərin yox, bütöv bir sosial təbəqənin taleyi ön plana çəkilir.

Mixail Şoloxovun müharibənin təbiətə, insanlığa olan dağıdıcı təsirlərin, əsərdəki baş qəhrəmanın keçirdiyi hiss və həyəcanların gözəl, məxsusi bir üslubla təsvir olunduğu "Nifrət dərsi" əsərində göstərilir: Müharibə vaxtı ağacların da taleyi insanların taleyinə bənzəyir. Mən bizim topların atəşindən, güllələrindən kəsilib məhv olan böyük bir meşə sahəsi görmüşdüm. Həmin meşələrdə bu yaxınlarda Sş kəndindən qovulub çıxarılmış almanlar özləri üçün istehkam düzəltmişdilər. Onlar burada dayanmaq fikrində idilər, lakin ölüm ağaclarla bərabər onları da kökündən biçmişdi. Kəsilmiş şam ağaclarının gövdələri altında alman soldatlarının cəsədləri tökülüb qalmışdı. Parça-parça olmuş bu cəsədlər yaşıl pöhrəlikdə çürüyürdü. Çürüyən cəsədlərin kəskin, boğucu üfunətini mərmilərin qırıb parçaladığı şam ağaclarının qatranlı ətri də dağıda bilmirdi (Şoloxov,1975: s. 186). Əsərin obrazlarından olan leytenant Gerasimovun sözləri insanı düşündürür: Biz əsil döyüşçü kimi vuruşmağı da, nifrət etməyi də, ürəkdən sevməyi də öyrənmişik. Müharibə kimi məhəng daşında insanın bütün hissləri billurlaşır. Adama elə gəlir ki, sevgi və nifrəti heç vaxt yan yana qoymaq olmaz... Faşistlərin mənim vətənimə və şəxsən mənim özümə vurduqları zərərə görə mən onlara dərindən nifrət bəsləyirəm, eyni zamanda öz xalqımı bütün varlığımla sevirəm, onun faşizm əsarəti altında əzab çəkməsini istəmirəm. Məni də, bizim hamımızı da bu cür amansızcasına, misilsiz bir qəzəblə vuruşmağa vadar edən də məhz budur (Şoloxov,1975:210).

Şoloxovun oşerkləri tək oxucular deyil, həm də yazıçılar tərəfindən etimad və maraqla qarşılanırdı.

Özünün "Hərbi əsirlər" oçerkində Şoloxov qeyri-standart bir yol seçmişdi – o sadəcə vuruşan xalqın qəhrəmanlığını göstərmir, o bunu faşist hərbi əsirlərinin dili ilə diqqətə çatdırmışdır.

Müharibə mövzusu Şoloxov üçün yeni deyildi. O, artıq bir dəfə bu janra müraciət etmişdi. Şoloxovun "Sakit Don" roman-epopeyasının ikinci cildi vətəndaş müharibəsinə həsr olunmuşdu. Buraya Şoloxovun "Sakit Don"dan əvvəl yazmağa başladığı "Don hekayələri" kitabından Kornilov qiyamına aid fəsillər də daxil edilmişdi. Əsərin bu hissəsinin dəqiq tarixi vardır: 1916-cı ilin sonu – 1918-ci ilin əvvəli.

Bolşeviklərin şüarları öz torpaqlarına sərbəst ağalıq etmək istəyən kasıbları cəlb edirdi. Ancaq vətəndaş müharibəsi baş qəhrəman Qriqori Melexovun qarşısına yeni suallar çıxarır. Hər iki tərəf, ağlar da, qaralar da bir-birini qıra-qıra öz həqiqətini axtarır. Qırmızıların yanına düşən Qriqori düşmənlərin qəddarlığını, barışmazlığını, qana susamışlığını görür. Müharibə hər şeyi dağıdır: ailələrin öz axarına düşmüş həyatını, dinc əməyi, ən axırıncı şeyini alır, məhəbbəti öldürür. Şoloxovun qəhrəmanları Qriqori və Pyotr Melexovlar, Stepan Astaxov, Koşevoy, praktik olaraq bütün kişi əhalisi mənasını anlamadıqları döyüşlərə sürüklənmişlər. Kimin və nəyin üçün onlar ömrünün baharında ölməlidirlər? Xutordakı həyat onlara xeyli sevinc, gözəllik, ümidlər, imkanlar bəxş edir. Müharibə isə - ancaq məhrumiyyətlər və ölüm.

Müharibənin yaratmış olduğu məhrumiyyətlər, insanları dərd-kədəri ilə bağlı əsərin səhifələrindən oxuyuruq: "...Günlər bir-birindən qüssəli, üzüntülü keçir,həmişə əndişə və təlaş içində, işdə-gücdə, ehtiyac içində, sevinci yarıtmaz, davaya gedənlərin insanlara verdiyi dərdi-sər içində itib-batırdı, ömrün necə gəldiyi, necə getdiyi bilinmirdi" (Şoloxov, 2006: 64).

Əsərin müəllifinin müharibəyə olan nifrət və etirazları qəhrəmanların danışığında da diqqətə çatdırılır. 44-cü polkun nümayəndəsinin çıxışı bu baxımdan diqqətçəkicidir. O deyir: "-Qardaşlar, qurultayımız bu ciddi işə elə yanaşmalıdır ki, xalqın qəlbinə toxunulmasın və hər işimiz əmin-amanlıqla qurtarsın! Biz qanlı müharibəyə yol verməməliyik. Onsuz da bizi üç il yarım səngərlərdə çürüdüblər" (Şoloxov, 2006: 239).

Müharibənin yaratmış olduğu aclıq və səfalətin izlərinin bədii əksi oxucunu M.A. Şoloxovun istedadlı qələminin əsiri edir. İstedadlı yazıçı bu dəhşətləri oxucusuna çatdıraraq onlarda amansız müharibələrə nifrət hissi aşılamaq üçün bütün bədii detallardan istifadə edir. Əsərin obrazlarından olan Bunçukun aşağıdakı sözləri dediklərimizin sübutudur: "Deməli, sən, qardaş, gör nə qədər aclıq çəkmisən ki, bircə dəfə adamın üzünə baxmaqla toxu acdan seçə bilirsən. Gör nə qədər müsibət və dəhşətə düçar olmusan ki, saçının hər çəngəsi bir cür ağarmışdır" (7, s. 217).

Müharibə ən yaxşılarını öldürür. Bunu dərk etdikdən sonra Qriqori silahı tullayır və doğma xutoruna qayıdır ki, doğma torpaqda işləsin, uşaqlarına gün ağlasın. Qəhrəmanın hələ heç 30 yaşı yoxdur, ancaq müharibə onu qocaldıb, ruhunun ən yaxşı hissəsini əlindən alıb, oda yaxıb.

Əsərin baş qəhrəmanı Qriqori Melexovun aşağdakı xəyalları ilə müəllif müharibə anlayışının məzmununu tam şəkildə açıqlayır: "Evə çataram, bir az dincələrəm, yaram sağalar, sonra da... – o belə düşünür və xəyalən əlini də yellədirdi. – sonra da işə baxaram. İş özü neyləmək lazım olduğunu göstərər" (Şoloxov, 2006:. 276).

Özünün ölməz əsərində Şoloxov tarixin şəxsiyyət qarşısında məsuliyyəti sualını ortaya qoyur. Yazıçı həyatı korlanan qəhrəmanının halına yanır.

Müharibə insanları kinli edib bir-birindən uzaqlaşdırır. Qriqori fikir verir ki, şüurdan "qardaş", "şərəf", "Vətən" sözlər, düşüncələr kimi ayrılır. Əsrlərlə möhkəm olan kazakların birliyi süquta uğrayır. İndi hər biri özünə və öz ailəsinə cavabdehdir. Öz hakimiyyətindən istifadə edən Koşevoy yerli var-dövlət sahibi Miron Korşunovu edam etmək qərarına gəlir. Mironun oğlu Mitka atasının qısasını almaq üçün Koşevoyun anasını öldürür. Koşevoy Pyotr Melexovu qətlə yetirir, onun arvadı Darya İvan Alekseyeviçi güllələmişdir. Koşevoy anasının ölümünə görə artıq bütün Tatarski xutorundan intiqam alır: gedərkən "dalbadal yeddi evə od vurur". Qan qan axtarışındadır.

Yazıçı göstərir ki, ölüm olan yerdə həqiqət ola bilməz. Həqiqət birdir, onun "qırmızısı" yaxud da "ağı" olmur.

**Nəticə**

Bədii əsərlərin cəmiyyətə təsirini dəyərləndirərkən Azərbaycan xalqının görkəmli mütəfəkkiri Mirzə Fətəli Axundzadənin fikirlərini xatırlatmaq yerinə düşərdi. O yazırdı: "Əgər insanları əsərlə qandırmaq, ağıllandırmaq, cahillikdən qurtarmaq mümkün olsaydı, onda İran xalqı Sədi Şirazinin əsərlərindən sonra dünyanın ən sivil xalqı olmalı idi" . Bədii – elmi fikrimizə Vurğun yadigarı olan Vaqif Səmədoğlunun da bu mövzuda maraqlı fikirlərinə nəzər salaq. O deyirdi: "Əgər yazıçının yazması ilə müharibə olmasaydı, Lev Tolstoyun "Hərb və sülh" əsərindən sonra iki dünya müharibəsi olmazdı" . Yəni bizim nə etməyimizdən asılı olmayaraq, ədəbiyyatın müharibə məsələsinə gücü çatmır.

**Ədəbiyyat**

1. Mustafa, F. (2019) "Bu əsərin qəhrəmanı zamandır", https:// www. yazyarat. com/yazi/ bu-eserin – bas – qehremani -zamandir-2019-12-13-201117
2. Qurbanov, Q. V. (2000) Şoloxov: mqnoveniya jizni, Rostov na Donu, Çvetnaya peçat
3. Xəlilov, B. (2016) Əbədiyaşar ədəbiyyat". – Bakı: Adiloğlu¸202 s.
4. Şərifova, S. M. (1987) Şoloxovun "Sakit Don" roman-epopeyası və F.Kərimzadənin "Qarlı aşırım" romanı: tarixi və bədii paralellər
5. Şoloxov, M.A. (2007) Povest və hekayələr. /tərcümə edənlər : Abbasov, Musayev B, Beyd, Hüseyn Şərif. – Bakı: Avrasiya Press, 360 s
6. Şoloxov M.A. (1975) İnsanın taleyi. ( Hekayələr), Bakı: Azərnəşr, 255 s.
7. Şoloxov, M.A. (2006) Sakit Don: İkinci kitab, Bakı: Avrasiya press, 408 s
8. sckoolessay.ru.
9. https://sites.udel.edu/britlitwiki/the-first-world-war-and-literature/

DOI: https://www.doi.org/10.36719/2663-4619/78/58-63

**Dilbər Vətən qızı Camali**
AMEA Nəsimi adına Dilçilik İnstitutu
doktorant
dilber.mehdiyeva@gmail.com

# KÜL TARXAN, DOLODOYN VƏ BÖMBÖGÖR ABİDƏLƏRİNİN LİNQVİSTİK VƏ KULTUROLOJİ TƏHLİLİ

**Xülasə**

Orxon-Yenisey abidələrinin kəşf olunan ilk nümunələrindən üzü bu yana ilbəil yeniləri tapılmaqda davam edir. Abidələrin dili-üslubu və daşıdığı kulturloji dəyərlər türkologiya üçün çox önəmlidir. Qədim türk yazılı abidələri Azərbaycanda araşdırılsa da son illərdə tapılan yeni abidələr hələ tədqiq edilməmişdir. Kül tarxan abidəsi, Bömbögör abidəsi və Dolodoyn abidəsi indiyə kimi Azərbaycanda tərcümə və nəşr edilməmişdir. Bu məqalədə abidələr haqqında məlumatlar verilmiş və mətnləri linqvistik və kulturoloji baxımdan araşdırılmışdır.

***Açar sözlər**: Kül Tarkan, Bömbögör, dolodoyn, abidələr, dil, kulturoloji*

**Dilber Vatan Jamali**

## Linguistic and cultural analysis of Kul tarkhan, Dolodoyn and Bombogor monuments

**Abstract**

From the first discovered specimens of the Orkhon-Yenisei monuments, new ones continue to be found every year. The language and style of the monuments and the cultural values they carry are very important for Turkology. Although ancient Turkish written monuments have been studied in Azerbaijan, new monuments found in recent years have not yet been studied. The Kul Tarkhan monument, the Bombogor monument and the Dolodoyn monument have not yet been translated and published in Azerbaijan. This article provides information about the monuments and examines the texts from a linguistic and cultural point of view.

***Key words**: Kul Tarkhan monuments, Bömbögör monuments, Dolodoyn, monuments, language, cultural.*

## Giriş

Qədim türk yazısı abidələri Azərbaycanda araşdırılsa da son illərdə tapılan yeni abidələr hələ tədqiq edilməmişdir. Kül tarxan abidəsi, Bömbögör abidəsi və Dolodoyn abidəsi indiyə kimi Azərbaycanda tərcümə və nəşr edilməmişdir. Bu məqalədə abidələr haqqında məlumatlar verilmiş və mətnləri ilk dəfə oxunub Azərbaycan dilinə uyğunlaşdırılmışdır. Son dövrlər yeni-yeni abidələr Orta Asiyanın müxtəlif bölgələrindən tapılmağa davam edir. Bu sahədə monqol türkoloqlar yeni tədqiqat üsulu seçərək yeni abidələrin tapılması, oxunması və qorunması istiqamətində işlər görməkdədirlər.

**Kül Tarxan abidəsi:** Abidə Monqolustanın Bulqan vilayətinin Xışıq-Ondor sumunda Arxanan təpəsinin 40 kilometirliyində qaya üzərində həkk olunub, Bulqan oymağında tapılmışdır. Hazırda tapıldığı yerdədə qalmaqdadır. Abidə qranit qaya üzərindədir. Üç sətirdən ibarətdir.

O. Namnandorx 1966-cı ildə şəkilləri və əlyazma nüsxələrini əldə etmişdir (8). Yazının kağız nüsxələrini Monqolustan Elmlər Akademiyasının Dil və Ədəbiyyat İnstitutunun alimi H. Luvsanbalda hazırlamışdır. Sonra E.Tryiarski, S.G.Klyashtorny, S.Karjaubay tədqiqatlar aparmışlar Qazaxıstan alimləri isə 2001 və 2004-cü illərdə tədqiqatlar aparmışlar (8). Abidədəki damğa işarələrinin və leksik vahidlərin quruluşu və yazı tərzi Orxon abidələrinə daha çox bənzəyir. Bu abidə indiyə kimi Azərbaycanda və Türkiyədə tərcümə və nəşr olunmamışdır. 2005-ci ildə monqol tədqiqatçı Ç.Battulqa özünün çəkdiyi fotolar əsasında oxumuş və monqol dilinə tərcümə etmişdir.

Abidə uzun qranit qaya üzərində iti iynə ilə həkk olunmuşdur. Üzərində 3 sətir qədim türkcə yazı vardır. Yazının çox da böyük bədii dəyəri yoxdur. Abidə Oroxn abidələri sırasına daxil edilsə də Yenisey abidələrinə bənzərliyi ilə diqqəti cəlb edir. Qısa sətirlər abidəni qoyan şəxsin dilindən verilib. Digər Yenisey abidələrindəki kimi, "qutlu bolzun", "bedizdim" və s. ifadələr bənzərlik təşkil edir.

Tapılan abidələr Göytürk dövləti dövründə və ondan sonrakı dövrlərdə yaşamış şəxslərə aid abidələrdir. Onların içərisində sıravi şəxslərə aid olanlarla yanaşı xaqanlara, yabqulara, tutuklara və s. titul və rütbə sahibi tarixi şəxsiyyətlərə aid abidələr də yetəri qədər çoxdur. Bəzən abidələr aid olduğu şəxslərin adları ilə adlansa da, çox vaxt onlar tapıldıqları yerə görə adlandırılıb.Tatbar xaqan abidəsi, Bilgə xaqan abidəsi, Kül tigin abidəsi, Tonyukuk abidəsi və s. Həsr olunduqları şəxslərin adı ilə adlandırıldığı halda Tepsey abidələri, İymə abidəsi, Elegest abidələri, Təle abidəsi, Kejilik Xovu abidəsi, Bay Bulun və s. abidələr isə tapıldığı yerlərin adı ilə adlandırılmışdır (9).

**Kül tarxan abidəsinin oxunuşu və tərcüməsi:**

1. *Teŋriken kunçuy : Yegen butur Erkin eki yılqı kün ... yaŋı Kül Tarkan kü edgü er erikten bui ....ar.... an ... kaya ak edgü bolzun*

**Tərcüməsi:***tanrısifət şahzadə Yegən igid Erkin iki ilxı gün .... yeni Kültarxan yaxşı adam ..... ..... ... qaya ağ yaxşı olsun*

*2. b...bitiçü bitidim : kaya Teŋiriken : kutluğ bolzun*

**Tərcüməsi***: yazı yazdım, qaya tanrısifət, qutlu olsun*

*3. k...kulçuk .. kutluğ er ara bolzun bedizdim*

***Tərcüməsi:*** *k.... qutlu adam arasında olsun yazdım*

**Teŋiriken:** Bu sözlə Kül tarxan abidəsindən başqa Ongin abidəsinin 5, 6, 8-ci sətirlərində və III Orxon abidəsində qarşılaşırıq. Ə.Ə.Rəcəbli sözü *"tanrıyabənzər, tanrının kölgəsi, tanrının yerdəki nümayəndəsi və tanrının elçisi*" mənalarında tərcümə edir (Rəcəbli, 2009:443). Əlavə olaraq *teŋirilik* sözü isə yanlız İrk Bitig abidəsində işlənmiş, "*dindar, allah adamı"* mənalarında işlədilmişdir. Aydındır ki, hər iki söz tanrı sözündən gəlməkdədir. Divani-Lüğət-it-Türk əsərində M.Kaşğari sözü "müsəlman olmayan türklərdə bilikli şəxslərə verilən addır" deyə qeyd edir (DLT, III, 1988: 377). G.Klason isə "allaha ibadət edən müdrik, dindar, uzaqgörən şəxs" mənalarında vermişdir [Klason, 1972:525]. S.Göməç sözü abidələrdə həm qadınlar üçün, həm də kişilər üçün işlədilən rütbə və ya titul olduğunu bildirir (Göməç, 2010: 13).

**Itug** : Ç. Battulqa birinci sətirdə bu sözü oxusa da biz belə söz görmürük. Ola bilsin ki, bu söz pozulmuşdur. Lakin Ç. Battulqanın oxuduğu bu söz digər abidələrdə rast gəldiyimiz itguçi sözünə bənzəyir. *İguçi bənna, tikən, edən* deməkdir. Kül tigin abidəsinin şimal tərəfinin 13-cü sətirində işlədilmişdir.

**Bedizçi:** Bu sözü Orxon-Yenisey abidələrində adətən abidəni yazan adamın dilindən işlədilən söz kimi qarşımıza çıxır. Bəzək vuran, naxış vuran mənalarında işlədilir. Bu sözlə kökdaş olan *bedizçi, bedizlə, bediz* sözləri ilə digər abidələrdə də qarşılaşırıq.



**Şəkil 1. Kültarxan abidəsi**

**Bömbögör abidəsi:** Bömbögör abidəsi Monqolustanda kəşf olunan Yenisey abidələrindəndir. Monqolustanın Bayanxongör aymağında tapılmışdır. Abidə qarluq boyuna aiddir. Türk xaqanı qızını qarluq boyuna gəlin vermiş və ona abidə həsr etmişdir. Abidə beş sətirdən ibarətdir. Abidəni monqol alimlərindən ilk dəfə T. Battulqa 2005-2006-cı illərdə və yapon alimi S. Kosetu tərəfindən 2010-cu ildə tədqiq edilmiş və nəşr etdirilmişdir. Daha sonra Türkiyədə də H.Ş.User tərəfindən (2010) türk dilinə oxunub tərcümə edilmişdir. Abidəni digərlərindən fərqləndirən yeganə məqam onun bir xanıma həsr olunmasıdır. Bildiyimiz kimi digər abidələrdə bu hal müşahidə edilmir. Qədim türk dilində xaqan qızı kunçuy adlanır. Mətndən məlum olur ki, abidə xan və ya xaqan qızının və ya həyat yoldaşının dəfninə həsr edilmişdir. Abidə üzərində basmıl və karluq türk tayfalarının adlarının işlənməsindən demək olar ki, abidə bu tayfalara mənsubdur. Sətirlərdə bir çox damğalar olsa da bəziləri silinmiş haldadır.

H.Ş.User abidədə basmıl və qarluk tayfalarının adlarının qeyd olunmasını abidənin qoyuluş tarixini müəyyən etməyə kömək etdiyini bildirir. Tarixi qaynaqlarda bu sahədə məlumatlar az olsa da, A.Taşağılın əsərinə əsaslanaraq VII basmıllarla qarluqların adlarının tarixi qaynaqlarda Xaqanlığın dağıldığı (741-742) illərdə işləndiyini yazır (User, 2010: 67). Çin qaynaqları əsasında qədim türk boyları haqqında dəqiq məlumatlar verən A.Taşağıl qarluqların Altay dağlarının qərbində yaşadığını lakin bunun onların ilk məskənləri olmadığını qeyd etməkdədir. O əlavə edir ki, qarluqlar son dəfə Çin qaynaqlarında adları keçdikdən sonra bir də 614-cü ildə tarix səhnəsinə çıxmışlar. Qapağan xaqan öldükdən sonra azad olan bəzi türk boyları Çinin təhriki nəticəsində bir-birləri ilə vuruşmuşlar. Bilgə xaqan abidəsinin şərq tərəfinin 38-ci sətrindəki bir qeydə görə 720-ci ildə göytürklərlə qarluqlar arasında döyüş olmuş və qarluqlar məğlub olmuşdur (Taşağıl, 2004: 63). VIII əsrdə uyğurlarla dəfələrlə döyüşə girən basmıl və qarluq boylarının adları Şine Usu və Qarabalasaqun abidələrində yazılmaqdadır. Belə olduğu halda abidənin qoyuluşunu təxmini hesablamalara görə VIII əsrin ortalarına aid etmək olar.

**Abidənin ön tərəfi**

1. *l...................ŋ*
2. *Ilbilgə kunçuyuŋ*
3. *T lt n l....? k(a)rl(u)k*
4. *Kubr(a)p tult(u)nl(a)dı*

**Tərcüməsi:**

1. *Qutlu şahzadənin*
2. *Ilbilgə şahzadənin*
3. *Qəbri ....? qarluq(lar)*
4. *Birləşib dəfn etdilər*



**Şəkil 2. Bömbögör abidəsi. (foto: N. Bazılxan)**

Abidənin birinci sətrində bəzi damğalar pozulduğu üçün oxuma təxmini gəlinən qənaətdir. Abidələrin çoxunda birinci sətirdə məzar daşı qoyulan şəxsin kim olması, adı yazılmaqdadır.

**Dolodoyn abidəsi:** Orxon abidələrinə daxil edilsə də ancaq dili və üslubu Yenisey abidələrinə daha yaxındır. Abidə indiyə qədər Azərbaycanda tərcümə və nəşr olunmayıb. Yazı qırğız dövləti dövrünə aiddir. Yazının mətni Yenisey yazılarına çox oxşardır. Abidə Monqolustanın Uves bölgəsi Turgen məntəqəsinin, Har Us rayonunda tapılmışdır. Abidə VIII-IX əsrlərə aid edilir. Hazırda Stele Uves oymağında, Ulaangom məbədinin yerli tarixi muzeyində saxlanılır. Qırmızı-qəhvəyi qranit daş üzərinə həkk olunmuşdur. Abidə dörd sətirdən ibarətdir. 61 runik işarə oxunaqlı vəziyyətdədir. Burada istifadə olunan damğa işarələrin bəziləri Talas və Yenisey abidələrindəki versiyaları ilə üst-üstə düşür. İncə *“ək”* damğasını göstərən işarənin variantı isə Yenisey və Orxon abdələrindəkilərlə üst-üstə düşür. “K” səsinin bu versiyası isə Talas abidələrində görülmür. Xüsusilə “at” damğasının nisbətən ilkin versiyası olan qrafik işarəsi işlədilmişdir. Dolodoyn abidəsində sözləri ayırmaq üçün işlədilən qoşa nöqtəyə rast gəlinmir. Təxmini 30 runik işarə oxunmaz vəziyyətdədir. Ümumiyyətlə qeyd etmək lazımdır ki, abidələrin orfoqrafiyasında fərqlər var və bəzən də qrafik işarələrin müxtəlif versiyalarına rast gəlinir. Dolodoyn abidəsinin tapıldığı yerə və damğa işarələrinin səliqəsizliyi və çoxversiyalılığına əsasən demək olar ki, bu abidə Yenisey abidələri silsiləsinə daxildir.

Yenisey abidələri işarə qrafikası və ya dil xüsusiyyətlərinə görə Orhon, Talas və digər qədim türk yazılarından ciddi şəkildə fərqlənmir. Bu yazılarda türk, turgeş, qırğız, az, çik, tolberi və s. etno adlarına rast gəlinir. Yenisey yazıları tarixi baxımdan türk dünyasına, əski türk dövlətlərinə, daha doğrusu “Qırğız dövləti” dövrünə aiddir. Ən böyük Yenisey yazılı abidəsində 400-ə yaxın işarə var. Mətnlərin mənaları müxtəlifdir, lakin əsasən epitafik mətnlər üstünlük təşkil edir. Epitafik mətndə əvvəlcə şəxsin adı çəkilir, daha sonra onun tərcümeyi-halı və qəhrəmanlıq yürüşləri qısa şəkildə gətirilir və sonda onun qohumlarının yanında qala bilməməsi (vəfat etməsi), elindən obasından qohum qardaşından doymamasından duyduğu kədər mərhumun dilindən yazılır.

Monqol arxeoloq 1955-ci ildə T. Dorsjsuren kəşf etmişdir. İlk dəfə monqol tədqiqatçı Ç. Battulqa oxumuşdur (14). Abidə haqqında bu gün də geniş tədqiqat aparılmamışdır.

**Dolodoyn abidəsinin oxunuşu və tərcüməsi:**

**Transkripsiya:**

1. Ər atım Bilgə Çu (r) ap at
2. q... tən üg e ata ayi ərdəm
3. uluy kü nüg e. Çu (r)
4. ...gti... ...sü s..di l...u

**Tərcümə:**

1. Ər adım müdrik Çor,....
2. Ipək və xəzinə
3. Böyük.....çor
4. Qoşun yeritdi

Abidə haqqında danışılan şəxs igidlik adının Bilgə Çur olduğunu qeyd edir. Yazıdan məlum olur ki, abidənin aid olduğu şəxs sərkərdədir. Qoşun yeritmiş və çoxlu ipək və xəzinə əldə etmişdir.





**Şəkil 3. və 4. Dolodoyn abidəsi. (foto : N. Bazılxan)**

## Nəticə

Müasir türk dillərinin əsasında dayanan qədim türk dilinin əsaslandığı qədim abidələrin dilinin öyrənilməsi hər xaman türkoloji ədəbiyyatda öz aktuallığı ilə seçilir. Bu üç yeni abidə Azərbaycan dilində ilk dəfə oxunmuş və tədqiq edilmişdir. Araşdırmaların nəticəsində Kül Tarxan abidəsi Orxon, Bombogörvə Dolodoyn abidələri qrafik işarələrin yazılma qaydası baxımından və tapıldığı yerlərə əsasən Yenisey abidələrinə aid edilmişdir. Buradakı leksik vahidlər linqvistik və kulturoloji cəhətdən tədqiq edilmişdir.

## Ədəbiyyat

1. Atalay, B. (1988). Kaşgarlı Mahmud Divanü Lûgat-it-Türk Tərcüməsi III. Ankara, 2. baskı.
2. Battulga, Ts. (2006), Bömbögöriyn Biçees, Mongol Sudlal, XXVI, Ulaanbaatar, 26-30
3. Clauson G., (1972). An Etymological Dictionary of Pre-Thirteenth-Century Turkish. Oxford
4. http://turkoloji.cu.edu.tr/pdf/sadettin_gomec_terken_unvani.pdf
5. https://bitig.kz/pdf/mongol1.pdf
6. https://bitig.kz/pdf/mongol1.pdf
7. https://bitig.kz/pdf/mongol1.pdf
8. https://bitig.kz/pdf/mongol2.pdf
9. https://bitig.kz/pdf/mongol2.pdf
10. https://bitig.kz/pdf/mongol3.pdf
11. Rəcəbli, Ə.Ə. (2009) Qədim türk yazısı abidələri Bakı: Nurlan.
12. Taşağıl, A. (2004) Çin qaynaqlarına görə əski türk boyları, Ankara: Atatürk kultur dil, tarix yüksək türk tarix qurumu basımevi yayınları, https://turuz.com/storage/Turkologi/-Tarix/2015/1099-_Turkoloji_Tarix_Chin_Kaynaklarina_Gore_Eski_Turk_Boylari_Ahmet_Tashaghil.pdf
13. User, H.Ş. (2010) Bömbögör yazıtı: Bir Türk kunçuyunun məzar daşı, Dil araşdırmaları, s:7 Güz-2010, 62-73 ss.
14. https://bitig.kz/pdf/mongol1.pdf

**Rəyçi: fil.ü.f.d. Qətibə Quliyeva**

Göndərilib: 01.04.2022 Qəbul edilib: 05. 05.2022

DOI: https://www.doi.org/10.36719/2663-4619/78/64-68

**Parvin Aydin Karimova**
Khazar University
PhD student
pkerimova@khazar.org

# PHILOSOPHY OF LANGUAGE

## Abstract

Philosophical examinations about the idea of language have become increasingly convincing over the most recent couple of hundreds of years. The contemplations about language are objects for different regions of logical research just as for hypothetical addressing. Philosophical investigation of language reveals insight into a wide range of fields like instruction, phonetics, humanism, legislative issues, brain science, and so forth. It could be said, where there is human life, there exists a hint of language since language is the most particular limit of man. Reasoning of language gives a profound foundation to both different fields of theory and different logical examinations. This article is both topical and chronicled; my significant point is to empower all individuals intrigued by language and theory to discover associations with their own subjects of study while presenting the field of philosophical examinations about language.

***Key words:*** *philosophy of language, idea of language, model of communication, rules of language, theory*

**Pərvin Aydın qızı Kərimova**

## Dilin fəlsəfəsi

## Xülasə

Dil ideyası ilə bağlı fəlsəfi araşdırmalar son bir neçə yüz il ərzində getdikcə daha inandırıcı olmuşdur. Dillə bağlı mülahizələr məntiqi tədqiqatın müxtəlif bölgələri üçün də obyektdir. Dilin fəlsəfi tədqiqi təlimat, fonetika, humanizm, qanunvericilik məsələləri, beyin elmi və s. kimi geniş sahələrə dair fikirlər ortaya qoyur. Demək olar ki, insan həyatı olan yerdə dilin eyhamı var, çünki dil insanın ən xüsusi sərhəddidir. Dilin əsaslandırılması həm nəzəriyyənin müxtəlif sahələrinə, həm də müxtəlif məntiqi imtahanlara dərin əsas verir. Bu məqalə həm aktual, həm də xronika xarakterlidir. Əhəmiyyətli məqam dil və nəzəriyyə ilə maraqlanan bütün fərdlərə dil haqqında fəlsəfə sahəsini təqdim edərkən öz tədqiqat mövzuları ilə assosiasiyalar kəşf etmək səlahiyyətini verməkdir.

***Açar sözlər:*** *dil fəlsəfəsi, dil ideyası, ünsiyyət modeli, dil qaydaları, nəzəriyyə*

## Introduction

Albeit a portion of the themes bantered inside philosophy of language can be followed back to traditional Greek way of thinking and the refinements of medieval rationale (see Section IX), in reality the mark 'reasoning of language' for an unmistakable part of the subject didn't pick up money until after World War II. Some time before at that point, in the early long stretches of the twentieth century, there had been an away from of accentuation in theory toward semantic examination, which gave a noticeable quality to language inside way of thinking uncommon in the eighteenth and nineteenth hundreds of years, however it was not until later that logicians directed their concentration toward an efficient investigation of characteristic language itself and its establishments. This new request concentrated on crucial inquiries concerning the idea of importance, truth, and reference. A combination of intrigue created with hypothetical phonetics, prodded on by progressively complex strategies in rationale, and the twin territories of semantics and pragmatics came to comprise a focal center of systematic way of thinking for approximately two decades (the mid 1960s to the mid 1980s). From that point forward, somewhat impacted by issues emerging from philosophy of language (on purposefulness, prepositional frames of mind, mental substance, thought), there has been a further move at the focal point of reasoning toward theory of psyche, however banter proceeds on every contested issue, particularly identifying with truth and significance. The primary reason for this acquaintance is with distinguish a portion of the fundamental zones of conflict inside way of thinking of language and point to the applicable sections in the reference book where they are taken up.

**The Language of Philosophy and the Philosophy of Language**

The idea of language is too expansive to be in any way characterized in a solitary articulation. As it sits at the core of philosophy of language, it is important to portray and clarify the idea at first. When all is said in done dialects are types of emblematic portrayal. Certain implications are spoken to using other certain images. The definition might be utilized for formal dialects just as for normal dialects. However the point of this book is to investigate human language and give a philosophical record of human language. Utilizing language to talk, compose, tune in and read is an aptitude for us, extraordinary to people. Human language thusly can't be considered without individuals and individuals' utilizing, making, creating and evolving it.

It is an instrument for us to share our thoughts, sentiments and wants. It causes us to uncover our considerations and speak with others. Human language is one of the most created and confounded intends to transmit information. Language is an unquestionable requirement for verse, exposition and dramatization. It is the thing that makes a network out of a gathering of individuals.

Language is characterized as a solidarity of multidimensional ideas that is comprised of inadvertent signs and is a framework that gives correspondence (Frege, Gottlob 1993,p.117). At the point when the definition is viewed as it is consistent with state that there is no purpose behind naming an article by utilizing the sign "table" yet not utilizing "tabe." Language is a brought together arrangement of components related with each other somehow. One of the significant points of this framework is to set up a ground for correspondence. The ideas of language are multidimensional and are thusly considered in like manner. For example, the component of significance is identified with the field of semantics and pragmatics, the element of the utilization of language, in actuality, conditions is the focal point of pragmatics, the manner in which words and sentences are built is the issue of linguistic structure, and the sounds and how they are articulated are conversations in the fields of phonetics and phonology.

In a word reference of phonetic terms, language is depicted as something empowering man to comprise a fake world separate from this present reality with its own standards. Language is a discretionary framework dependent on social show and is an entirety of metaphor reinforced with inadvertent sounds in a solidarity of sound and significance (Chomsky, 1999: 98). This definition shows a portion of the essential characteristics of language. Right off the bat, language has the property of ordinariness. To communicate a being by utilizing another being, in particular an image, is a property of human language. Language is traditional, for we talk about specific articles by utilizing a few images that are not those images themselves. A second property of language is aggregation, that is the state of comprehension or thinking a similar article or idea when single word is articulated or read. The industriousness of dialects is firmly identified with the component of aggregation. The spread of a connection between a word in a language and the being it speaks to as far as time or space will build the seriousness of language. Tone of the properties deciding precise utilization of language is found out by its being far reaching over reality. The third property of language is discretion and is adequate on measurement of jargon. The being and the name we use to speak to that being is discretionary, is of no explanation.

From the earliest starting point of all the scrutinizing about the idea of language there has been a discussion about how words have certain implications. Is the significance of a word effectively existent in the substance of that word or is it connected by people? This leads us to the subject of what started things out: the being/the information on being or the name of the being.

The field of phonetics has displayed a clarification for this significant inquiry. The jargon of a specific language is grounded on two kinds of assets: Internal components and outer components. Inner components are crucial and are shaped by including or evacuating joins inside the limits of that specific language. On account of inner components, both the being/the information on being and the name of the being are existent simultaneously. Outer components are then again shaped by obtaining from different dialects. The places of these components are unique; either the being/the information on the being or the name of the being emerge at first.

At the point when he talks about the idea of language, Ferdinand de Saussure calls attention to a triple grouping of the term being referred to: Langage, Langue and Parole. Langage is the capacity to utilize a framework for conveying thoughts and emotions utilizing sounds, motions, signs, or checks. This ability is exceptional to people. Langue alludes to the perfect unique framework made out of socially ordinary images. It is the term Saussure uses to bring up a specific characteristic language like

English, Turkish, and Russian and so on. Parole communicates the genuine utilization of language in genuine condition conditions. As indicated by Saussure language is an unmistakable organic limit of people and is a component overseeing human conduct.

Another issue of discussion has been the utilization of a language by creatures. Do creatures speak with one another? In the event that truly, how is their correspondence not the same as that of individuals? What contrasts exist between creature language and human language? The inquiries were acted like new tests set forward different ends. Creatures utilize a vehicle of correspondence which is non-verbal. The correspondence of creatures is natural, intrinsic and is moved heritably. Human dialects are obtained and learned by instruction. They are acquired by the ages that follow as a social legacy. Creature language is a statement of erotic conditions. Despite what might be expected, human language goes past the statement of sentiments and is utilized for argumentation, portrayal, order and figuration. In contrast to people, creatures use flags rather than images. Human dialects are made out of images to be utilized for repeat and move (Achinstein, 2009: 65).

Another order in the conversations about the idea of language is the variety of language as being formal or common. Normal dialects and formal dialects are ordinarily considered as being entirely unique. In any case, when profoundly addressed, numerous similitudes will be found. Characteristic dialects are formal on a fundamental level. In the two sorts of dialects there are the qualifications of structure and substance or articulation and importance. The utilization of a characteristic language under genuine conditions is corresponding to the connection among hypothesis and practice exhibited in formal dialects. The fundamental huge contrast among common and formal dialects lies in the arrangement procedures of both. Characteristic dialects have not really been detailed misleadingly. The crucial development procedures of such dialects are common and the standards and rules establishing these procedures are different, one of a kind and complex. Such a dark structure can not exclusively be clarified by the syntactic and semantic standards of formal dialects.

Reasoning of language is firmly identified with some different trains in theory like rationale, epistemology, metaphysics and theory of brain. The inquiries concerning the idea of equity, information or being are of incredible intrigue and discussion throughout the entire existence of reasoning. Finding the fitting answers is, one might say, an issue of understanding the inquiry. Is it the significance of the word being addressed or is it the substance of the idea? For example, Wittgenstein guarantees that the subject of "what is information?" is pointless when considered as a philosophical inquiry. Wittgenstein epitomizes this with the idea of "family likeness" and clarifies that when "game" is considered and characterized, it is difficult to discover highlights shared by all games. The motivation behind why we call them games can be clarified by the way that they all take after one another in a few or different manners like the individuals from a family. Along these lines any sort of philosophical addressing might be significant to the language utilized in our inquiries or in the meanings of ideas.

Rationale is one field of theory that is associated with reasoning of language at the syntactic level. Rationale is an investigation into the sensible type of recommendations which is the syntactic degree of addressing language in theory. Rationale shows a formal and counterfeit language which is regularly stood out from human language. Reasoning of language is another field in theory whose way meets with that of theory of language in regards to the ideas of such mental procedures as still, small voice, suspected, conviction, discernment and learning. A portion of the recommendations in language are on conviction or discernment. The philosophical investigation of an articulation like "I trust it will rain today" requires understanding the psychological procedures included. Another idea in theory of brain is the idea of mental portrayal which ties the field to language. There is a connection between mental portrayal of something and alluding to that thing. Therefore, the idea of reference and mental portrayal of the thing being alluded to, have a bond. Concerning epistemology, the connection is that numerous rationalists concur that information is propositional. At the point when the connection between a subject as a knower and an article as the thing known is considered, many contend that the item is a suggestion. Other than the idea of suggestion, the two fields of reasoning are connected with the idea of truth. The contention is that for a subject to know a recommendation, it is fundamental that the suggestion is valid. In this way, the subject of truth of suggestions ties information to language. At the point when metaphysics is the situation, language is addressed as far as recommendations of presence. To suggest that something exists or doesn't exist is dangerous for some rationalists of language including Frege and

Russell. The conversations about such suggestions will be taken care of in the significant parts that follow (Achinstein, 2009:104).

Language is a faulty idea in reasoning as well as in social and instructive sciences. For certain sciences language is a significant idea of research and for others an optional conversation point when taking care of another dangerous item. In a word, language is the object of numerous sciences either straightforwardly or by implication. Etymology is the science that reviews language and puts the idea at the core of its examination. Brain research of language, physiology of language, philology and writing are different fields and sciences in which language is either an essential or auxiliary worry for examine.

In the first place the logical investigation of language, it is consistent with state that semantics has picked up prominence as researchers are increasingly accentuating the connection among language and human culture, conviction and conduct. During the 1960s, as the multifaceted nature of semantic marvels was considered, it was essential for the logical field to complete research about language as an autonomous field. Right now, effective looks into called attention to new discoveries, there created numerous subfields inside the significant field of etymology. Saussure set forward a qualification regarding how language can be researched in two frameworks. The diachronic framework analyzes language on a recorded scale and concentrates the adjustments in language and grouping of dialects into families. nineteenth century phonetics was for the most part diachronic. The synchronic framework contemplates different semantic conditions paying little heed to verifiable changes. Synchronic phonetics centers around investigation and portrayal of language as utilized by its speakers. Humboldt was a significant supporter of synchronic phonetics and shed a light on the significance of typological examinations among dialects. Synchronic phonetics turned into a progressively broad sort of etymology with its significant number of subfields which are identified with the conversations in theory of language. Concentrates in synchronic semantics were generally about examination of language structure. There are a few fields like sociolinguistics that scaffold synchronic and diachronic phonetics. Morphology, phonology, grammar, semantics, pragmatics and talk examination are a portion of the subfields in etymological investigation. Phonology is the investigation of discourse sounds and their capacities. Morphology analyzes words, their interior structures and development forms. Linguistic structure is connected near the punctuation of a language and it considers units like sentences, statements, expressions and word classes. Semantics is the investigation of customary importance concerned somewhat with sense and reference qualification. Pragmatics examines social and full of feeling meaning. The utilization of language, in actuality, circumstances presents flags about speakers and their social relations. The semantic units of concentrate in pragmatics are articulations in legitimate language use. Talk examines composed or spoken messages as far as solidarity, cognizance and accentuation.

The etymologist looking for general standards for all dialects is believed to complete investigations in hypothetical or general phonetics. Anyway the one attempting to uncover actualities in the arrangement of a particular language is rehearsing illustrative semantics. The field of semantics that examines contrasts and likenesses among dialects is called relative etymology (Graff, Delia 2001: 314).

## Conclusion

Notwithstanding semantics, there are different fields of concentrate that ask into language in a roundabout way. Brain research of language is one of them and it look into a wide range of phonetic acts, for example, subjective wonders shown during the procedures of discourse and comprehension. It follows that there is a connection between phonetic conduct and the mental procedures like memory, consideration or center that underlie the etymological conduct. Right now is underscored that there is an association among language and character, insight or other mental variables. Human science of language manages language as far as sociological issues. The subject of what sorts of connections exist among society and language use or culture and language use and capacity is an issue of this field. Another observational investigation concerned by implication with language is physiology of language.

This explores natural ties that make talking conceivable. The conditions and terms of human physiology are inspected as far as its fundamental highlights like stomach, lungs, sense of taste, lips or teeth. Philology, the science began in the nineteenth century, accepts language as its immediate research subject and explores social wonders in the light of language considers. Anyway today philology centers around the uniqueness of dialects and heads towards the field of writing through research of individual

etymological marvels in abstract writings. In the field of artistic analysis the style, talk and tasteful degrees of language are examined. As a last case of fields associated near language, we can make reference to interpretation examines. This is a field exploring the approaches to build up correspondence of writings in various dialects. Various speculations of interpretation are proposed by the various kinds of writings and target audience/peruser.

## References

1. Achinstein, P. (2009) Concepts of Science: A Philosophical Analysis. Johns Hopkins Press, Baltimore, MD
2. Austin, J. L. (2000). A plea for excuses. Proceedings of the Aristotelian Society 57: 1-30 Austin J L 1961.Philosophical Papers. Clarendon Press, Oxford
3. Baker, G, Hacker, P. (2007) Language, Sense, and Nonsense. Blackwell, Oxford
4. Chomsky, N. (1999) Knowledge of Language: Its Nature, Origin and Use. Praeger, New York Language and nature. Mind 104: 1-61
5. Devitt, M, Sterelny K (2006) Language and Reality: an Introduction to the Philosophy of Language. Blackwell, Oxford
6. Frege, G. (1993): “On Sense and Meaning”, in Geach, Peter and Black, Max Translations from the Philosophical Writings of Gottlob Frege (Oxford: Basil Blackwell): 56-78.
7. Graff, Delia (2001): "Descriptions as Predicates," Philosophical Studies 102(1): 1-42. Hale, Bob and Wright, Crispin (1997): A Companion to the Philosophy of Language (Oxford: Blackwell Press).
8. Hempel, C. (2013) Aspects of Scientific Explanation and Other Essays in the Philosophy of Science. The Free Press, New York
9. Old Churches, New Believers / Ed. K. Kaariainer, D.E. Furman. SPb., 2000. S. 7–12.
10. Toporov, V. (2005) Moscow people of the 17th century (To ISSN 0321–3056 Proceedings of the universities. the north caucasus region. social sciences. 2005. No. 3 14 topic of the day) // To the 70th anniversary of Academician N.I. Tolstoy. M., 1993. S. 193.
11. Panchenko, A.M. (1993) On Russian history and culture. SPb., 2000.
12. Khrenov, N.A.(2002) Culture in the era of social chaos. Moskva: Rostov State Pedagogical University January 31, 200

**Rəyçi: fil.ü.f.d. Gülnar Qəmbərova**

Göndərilib: 01.03.2022 Qəbul edilib: 16. 04.2022

DOI: https://www.doi.org/10.36719/2663-4619/78/81-85

**Musa Natiq oğlu Əmiraslanov**
Azərbaycan Dövlət İqtisad Universiteti
magistrant
musa.amiraslanov7@gmail.com

# KORONAVİRUS (COVİD-19) PANDEMİYASI DÖVRÜNDƏ SƏNAYE MÜƏSSİSƏLƏRİNDƏ BÜDCƏLƏŞDİRMƏNİN TƏŞKİLİ

**Xülasə**

Məqalənin vəzifəsi Azərbaycanda koronavirus pandemiyası dövründə sənaye müəssisələrində büdcələşdirmənin təşkilini təhlil etmək və bu sahə ilə bağlı təkliflər verməkdir. Sənaye müəssisələrində koronavirus pandemiyasına cavab vermək üçün büdcə tərtibatı təcrübəsini öyrənilməlidir. Bu müəssisələrdə büdcə tərtibinin təşkilini və bu dövrdə maliyyə hadisələrinin həllində ondan necə istifadə olunduğunu araşdırılacaqdır. Tətqiqatda həmçinin hökumət kifayət qədər maliyyə resursları təmin edə bilmədiyi zaman müəssisələrin öz büdcələrindən istifadə edərək gələcək dövrdə necə hazırlaşa biləcəyini araşdırılmışdır. Öyrənilməsi nəzərdə tutulan əsas məsələ koronavirus (COVID-19) pandemiyası dövründə sənaye müəssisələrində planlaşdırma ilə yanaşı, büdcə tərtibinin təşkili ilə bağlı məsələlər olub. Bu tədqiqatın məqsədi pandemiya zamanı idarə və şirkət səviyyəli sənaye müəssisələrində büdcənin idarə edilməsinin nəzəri və metodoloji əsaslarını hazırlamaqdır ki, ondan mərkəzi hökumət səviyyəsində ekspertlər tərəfindən istifadə olunsun.

***Açar sözlər**: pandemiya, sənaye, büdcələşdirmə, maliyyə, büdcə xərcləri*

**Musa Natig Amiraslanov**

## Organization of budgeting in industry enterprises during the coronavirus (COVID-19) pandemy

**Abstract**

The purpose of the article is to analyze the organization of budgeting in industrial enterprises during the coronavirus pandemic in Azerbaijan and to make proposals in this area. Budgeting practices should be studied to respond to the coronavirus pandemic in industrial enterprises. The organization of budgeting in these enterprises and how it is used in resolving financial events during this period will be investigated. The study also looked at how businesses can use their budgets to prepare for the future when the government is unable to provide sufficient financial resources. The main issue to be studied was the organization of budgeting, as well as planning in industrial enterprises during the coronavirus (COVID-19) pandemic. The aim of this study is to develop a theoretical and methodological framework for budget management in management and company-level industrial enterprises during a pandemic that can be used by experts at the central government level.

***Key words:** pandemic, industry, budgeting, finance, budget spending*

## Giriş

Çində sənaye və xidmət sektorunda daralma 2020-ci ilin yanvar ayından etibarən azalmağa başlayıb. Bütün bu hadisələr 2020-ci ilin mart ayından etibarən təkcə Çində deyil, digər dünya ölkələrində də görülən koronavirus tədbirləri nəticəsində istehsal və tələbat zəncirlərinin pisləşməsinə səbəb olub. Bütün ölkələrin epidemiyaya qarşı mübarizə çərçivəsində səhiyyəyə çəkilən xərclər, virusun yayılmasının qarşısını almaq üçün fəaliyyətini dayandıran şirkətlərin kompensasiyası, vətəndaşların qidası və s. demək olar ki, onlar öz əsas ehtiyaclarını və zərər çəkən sektorları maddi cəhətdən təmin etməlidirlər.

Müəssisənin sənaye fəaliyyətinin büdcələşdirilməsi prinsiplərinin öyrənilməsinin aktuallığı istehsal-təsərrüfat fəaliyyətinin planlaşdırılmasının aşağı səviyyədə olması ilə əlaqədardır. İlk növbədə, göstərilən səviyyəni həyata keçirən xüsusiyyətləri qeyd etmək lazımdır.

Bu, bazar üçün zəruri olan malların növlərinin və həcminin çıxarılması əsasında mövcud həm maddi, həm də əmək ehtiyatlarını, habelə onların buraxılma müddətlərini nəzərə almaqla istehsalda müsbət tendensiya vektorunun və nisbətinin formalaşmasıdır.

Sənaye müəssisələrində büdcələşdirmənin səriştəli inkişafı sayəsində müəyyən biznes növlərinin və məhsulların maliyyə dayanıqlığını ətraflı qiymətləndirmək mümkündür ki, bu da son nəticədə bütün təşkilatın güclü maliyyə sabitliyini formalaşdıracaqdır.

Tədqiqatın elmi yeniliyi büdcə tərtibi metodologiyasının təhlilində, xüsusən də tədqiq olunan sahədə konkret prinsiplərin aydınlaşdırılmasındadır. Büdcənin formalaşmasında və inkişafında bir çox yerli və xarici alimlər öz töhfələrini vermişlər. Hal-hazırda çoxlu sayda büdcə prinsipləri mövcuddur, lakin müəllif onlardan ən vacibini müəyyən etmişdir. Covid-19 öz düzəlişlərini etdi, buna görə də bu, tədqiqatın bu sahəsində də əks olundu.

**Koronavirus pandemiyası dövründə sənaye müəssisələrində büdcələşdirmə**

Dünyada COVID-19 epidemiyası geniş yayılmış və həyatı ciddi şəkildə təhdid edən pandemiyaya çevrilmişdir. Xəstəliyin gedişatını və yayılmasını nəzərə alsaq, məsələ təkcə sənaye sahəsi üzrə deyil, habelə insan sağlamlığına, təhsilə, iqtisadiyyata, kənd təsərrüfatına, turizmə, sosial-mədəni, əxlaqi və mənəvi, eləcə də hüquqi aspektlərə bəzi mənfi təsirlərin ola biləcəyi təxmin edilir.

Büdcənin icra strategiyasından faydalanan müəssisələr həm də büdcənin tərtibinin əsas məqsədlərini həyata keçirəcək və büdcənin planlaşdırılması və nəzarətini təmin edəcəklər.

Bu müddət ərzində, yəni koronavirus infeksiyası dövründə mövcud vəziyyətlə əlaqədar ölkədə iqtisadiyyatın bütün sahələrində tam dissonans müşahidə olunur. Əsas zərbə ciddi problemlər yaşayan istehsal sektoruna dəydi. Müəssisələrin istehsal etdiyi məhsulların çeşidindəki dinamik dalğalanmaları və onun yenilənmə sürətini qeyd etmək lazımdır ki, bunun nəticəsində müəssisənin fəaliyyətinin xarakteri köklüşəkildə dəyişir. Nəticədə, təşkilatın dəqiq müəyyən edilmiş fəaliyyət planından istifadə etmədən və onun icrasına nəzarət etmədən bütün əsas mexanizmlərin tənzimlənməsi mümkün deyil. Yeni məhsulların buraxılışını formalaşdırmaq üçün nə üçün dinamika lazımdır. Bu, çox sadədir, potensial müştərilərin ehtiyaclarınıödəmək üçün əsas komponent kimi çıxış edir. Qeyri-kafi maliyyə resursları hesabına iqtisadi siyasətin prioritetləri ilə bağlı düzgün qərarların qəbul edilməsinin əhəmiyyəti artır.

Azərbaycan Respublikası formalaşmışşirkətdaxili planlaşdırma konsepsiyası onun fəaliyyət göstərməsi üçün aydın məqsədlərin qoyulması, kapitallaşmanın artırılması yolu ilə şirkətin strategiyasının formalaşdırılması baxımından tam mənzərəni vermir (Məmmədova, 2020). Qeyd etmək lazımdır ki, əldə edilmiş iqtisadi nailiyyətlərin təhlili üçün meyarların seçiminə yanaşmaq çox vacibdir, çünki düzgün olmayan yanaşma plan göstəricilərinin deformasiyasına səbəb olacaqdır. Ölkədə fəaliyyət göstərən planlaşdırma sistemi planların həyata keçirilməsi üçün iqtisadi nəticələrin çoxşaxəli öyrənilməsinə imkan vermir, həmçinin daim dəyişən iqtisadi şəraitdə müəssisənin ödəmə qabiliyyətinin qiymətləndirilməsini nəzərdə tutmur.

Buna görə də müəssisələr maliyyə-təsərrüfat fəaliyyətinin nəticələrini planlaşdırmaq və nəzarət etmək üçün ən səmərəli üsulları axtarmağa məcbur olurlar, eyni zamanda maliyyə idarəetmə alətlərinin bütün spektrini nəzərə almaq vacibdir. Müəssisə idarəetməsinin aparıcı funksiyası əməliyyatların həyata keçirilməsinin ardıcıllığına və xronologiyasına əsaslanaraq məqsədə çatmaq yolunda ifadə olunan planlaşdırmadır.

Daim dəyişən iqtisadi mühitin mövcud tendensiyası strateji yönümlü proqramın işlənib hazırlanmasını tələb edir ki, onun mahiyyəti büdcə tərtibi kimi alətdən istifadə edərək istehsal müəssisəsinin səmərəli inkişafı olacaq. Büdcələşdirmə dedikdə müəssisənin bütün struktur bölmələrini əhatəli planların işlənib hazırlanması və formalaşdırılmasına cəlb etmək məqsədi ilə maliyyə-təsərrüfat fəaliyyətinin tənzimlənməsi prosesi başa düşülür.

Tətqiqatçılara görə büdcələşdirmə təşkilatların strateji planını təkmilləşdirmək, fəaliyyətləri koordinasiya etmək, menecerə təşkilati resursların idarə edilməsi üçün məsuliyyət vermək və onların fəaliyyəti ilə bağlı menecerlərə rəy bildirmək kimi məqsədləri vardır. Bundan əlavə, bir çox müəssisələr büdcə sistemini öz fəaliyyətlərinə nəzarət etmək üçün çox vacib alət kimi görürlər (Arnold, 2019: 54-56).

Büdcələrin plan kimi istifadə edilməsində büdcənin icrası strategiyaları mühüm rol oynayır. Biznes idarəetmə fəaliyyətlərinin planlaşdırılması və nəzarəti strategiya çərçivəsində büdcələrin icrasından asılıdır. Büdcənin yaxşı idarə olunması da biznesin performansını artıracaq. Çünki büdcənin tərtibi prosesinin funksional effekti menecerlərin səyləri nəticəsində performansın artması ilə özünü göstərir. Büdcənin icra strategiyası eyni zamanda taktiki planları və strateji məqsədləri təfərrüatlandırarkən büdcənin tərtibi mərhələlərində və ondan sonra hansı fəaliyyət və proseslərin, hansı vaxtda və hansı planla təmin ediləcəyini müəyyən edir. Bu cəhəti ilə büdcələrdən müəssisələrdə idarəetmə uçotunda

qərar vasitəsi kimi istifadə edilir. Büdcə müraciətlərində əvvəlcə satış büdcələri tərtib edilir, daha sonra ilk maddi-material xərcləri büdcələri və digər büdcələr hazırlanır.

Bu kontekstdə büdcələrdən hansının təbii olaraq çox vacib olduğunu müəyyən etmək lazımdır. Büdcələr daha çox maliyyə sabitliyi potensialına sahib olur. Bu, biznesdə büdcə və strategiya arasında müsbət nəticə yaratmağa kömək edir. Digər tərəfdən, effektiv təşkilatlar üçün idarəetmə nəzarət sistemlərini, o cümlədən büdcə nəzarətini öz strategiyalarına uyğunlaşdırmaq üçün tənzimləmək büdcə tərtibinin ən mühüm məqsədlərindən biridir(Abdullayeva, Vəliyeva, 2020: 162).

Planlaşdırılmış davranışın qavranılması həm də korporativ şəxsiyyətin daha yaxşı təqdim olunmasına səbəb olacaqdır. Büdcənin icrası ilə əlaqəli büdcə məlumatlılığı idarəetmə fəaliyyətinin ölçülməsinə kömək edir. O, biznes fəaliyyətinin planlaşdırılmasına və təşkilatların fəaliyyətinin ölçülməsinə töhfə verir. Bu səbəbdən büdcənin icra strategiyasının büdcənin dərk edilən əhəmiyyətini artırdığı halda, bu icra yanaşmasının büdcənin planlaşdırılmasına da töhfə verdiyi qiymətləndirilir.

Fəaliyyətə əsaslanan büdcələşdirmə gələcək dövrlərdə mal və ya xidmətlərə tələbatın təxmin edilməsi ilə başlayır. Bu, ənənəvi büdcə metodundan daha çox məlumat ehtiva edir, çünki istehsal həcmi, material sifarişlərinin satın alınma tezliyi, habelə sifariş miqdarı və müştərilərdən çatdırılma üsulları kimi müştəri məlumatları ediləcək proqnozlarda nəzərə alınır (Məmmədova, 2020).

Tələb proqnozlarını verərkən satış və istehsal büdcəsindən kömək almaq lazımdır. Müəssisələrdə bazar təhlili, müştəri, məhsul və qiymət məlumatları, satış proqnozları nəzərə alınmaqla satış büdcəsi hazırlanmalıdır. Satış büdcəsindən sonra istehsal büdcəsi hazırlanır. Təxmini satış büdcəsinin sonunda tələbatı ödəyəcək məhsul qədər istehsal olunacaq məhsulların miqdarını və saxlanacaq ehtiyat miqdarını müəyyən edəcək istehsal büdcəsi hazırlanmalıdır.

Fəaliyyətlərin resurs məbləği müəyyən edildikdən sonra dolayı materiallar, dolayı əmək, enerji, amortizasiya və vergilər kimi resurs xərcləri müəyyən edilir. Resurslarla əlaqəli dəyərlər vahidə düşən resurs dəyərini və tələb olunan resursun vahid məbləğini vurmaqla pul dəyərlərinə çevrilir.

Resurs məsrəfləri, hansı resursun hansı fəaliyyətlə əlaqəli olduğunu nəzərə almaqla, resurs sərfiyyatı dərəcələrini hesablamaqla fəaliyyət obyektləri üzrə bölüşdürülür. Fəaliyyət məsrəfləri isə fəaliyyət sərfiyyatı əmsalı hesablanmaqla istehsal olunan məhsul və xidmət maya dəyəri obyektlərinə bölüşdürülür.

2020-ci il üzrə qlobal miqyasda kəskin dəyişkənlik tələb və təklif komponentlərini ölkəmizin iqtisadi göstəricilərini müəyyənləşdirən əsas amil olmuş, o cümlədən, bütün dünya üzrə iqtisadiyyatda qeydə alınan azalma tendensiyaları yerli iqtisadiyyatdan yan keçməmişdir. Hesabat ili üzrə baxdıqda mart ayından başlayaraq, ölkənin daxilində tətbiq olunan uzunmüddətli özünütəcrid rejimləri ilə ölkə iqtisadiyyatında mühüm azalmalar ilə nəticələnmişdir:

**Şəkil 1. Son 25 il ərzində ÜDM-in dinamikası, faizlə**




**Mənbə:**https://www.stat.gov.az -Azərbaycan Dövlət Statistika Komitəsinin məlumat bazası əsasında Hesablama Palatası tərəfindəntərtib edilmişdir.

Ölkə iqtisadiyyatı üçün makroiqtisadi dayanıqlılığın təmin olunması məqsədilə əhəmiyyətli dərəcədə ekzogen göstəricilər kimi qiymətləndirmələr neftin qiymətini və büdcə xərclərini bir neçə ssenarinin tətbiq olunmaması qeyri-müəyyən dünya iqtisadiyyatına və bu qeyri-müəyyənlikdə həssas olan neft qiymətlərinə şərait yaratmış, xüsusilə də aktual məsələ olmuş, makroiqtisadi çərçivədə bir variant kimi hazırlanması iqtisadi şərtlərin pisləşməsiylə iqtisadi nəticələrin dəqiq müəyyənləşdirməyə imkanı çətinləşdirməkdədir. Buna görə də istər dövlət, istərsə də müəssisə büdcələrinin rolu iqtisadiyyatın bu qədər dalğalandığı şəraitdə daha böyük qiymətləndirilir.

Ortamüddətli perspektivdə fiskal dayanıqlığın bərpası xərclərin azalmasında və iqtisadi artımı yüksəltmək üçün islahatlarda davamlı təmkin tələb edir. Hazırda büdcələşdirmə zamanı maliyyə çərçivəsində risklər aşağıdakı kimidir:

• İnnovativ maliyyələşdirmə mexanizmləri vasitəsilə maliyyələşdirilən və təkmilləşdirilmiş texniki imkanlarla dəstəklənən infrastrukturun qurulması proqramı da daxil olmaqla, bir sıra islahatlar vasitəsilə iqtisadi artımın dəstəklənməsi.

• Fiskal perspektiv əhəmiyyətli risklərə məruz qalır. Bunlara qlobal və ya daxili iqtisadi artımın zəifləməsi, qlobal borclanma xərclərinin artması, dövlət xidmətlərinin əmək haqqı xərclərinin artması ehtimalı və bir sıra iri dövlət şirkətlərinin pis maliyyə vəziyyəti daxildir.

• Yeni sosial qrant kimi xərclərin hər hansı böyük daimi artımı gəlirdə daimi artımlara uyğunlaşmadan təmin edilə bilməz. Hökumət həmçinin dövlət maliyyəsini qorumaq üçün fiskal lövbərin tətbiqini nəzərdən keçirməlidir.

Ortamüddətli fiskal siyasət büdcə kəsirinin azaldılmasına və borcun ÜDM-ə nisbətinin sabitləşdirilməsinə yönəlib. Hökumət gözləniləndən çox vergi gəlirlərinin bir hissəsini kəsiri azaltmaq üçün istifadə edəcək, eyni zamanda iqtisadi artımı, iş yerlərinin yaradılmasını və sosial müdafiəni dəstəkləmək üçün qeyri-faiz xərclərini artıracaq.

Dövlət maliyyəsinin bərpası üçün ən böyük risk ÜDM artımının pisləşməsidir. Gözləniləndən yüksək qlobal inflyasiya qlobal faiz dərəcələrinin yüksəlməsinə səbəb ola bilər ki, bu da borclara xidmət xərclərinə və valyuta məzənnəsinə təsir göstərir.

2021-ci ilin sonuna doğru COVID-19 infeksiyalarının yenidən canlanması ilə əlaqədar yeni məhdudiyyətlər, yüksək inflyasiya, pul vəsaitlərinin daha əvvəl çıxarılması, ABŞ-ın maliyyə dəstəyi paketinin geri çəkilməsi və Çinin problemli daşınmaz əmlak sektorundakı dəyişkənliyin nəticələri artım proqnozlarını azaldıb.2022-ci ilin sonuna qədər inkişaf etmiş ölkələr pandemiyadan əvvəlki istehsal səviyyəsinə qayıdacaq, lakin inkişaf etməkdə olan ölkələr tam bərpa olunmayacaq.

Dünya iqtisadiyyatı Covid-19 epidemiyası ilə çətin bir prosesdən keçir. Xəstəlik və görülən tədbirlər nəticəsində tələbatın azalması, tədarük zəncirinin pisləşməsi və istehsalda fasilələr baş verdi, iqtisadi tarazlıqlar pozuldu və dünya maliyyə böhranına girdi. Qeyri-müəyyənliyin artdığı bu dövrdə biznesin davamlılığını təmin etmək üst menecer üçün vacibdir. İnzibati qərarlarda planlaşdırma, nəzarət və koordinasiya üçün istifadə olunan büdcələr mühüm yer tutur (Gülməmmədov, Məmmədov,2019: 56).

Büdcə tərtibində qiymətləndirmə hesablanmış və idarə oluna bilən məlumatlara əsaslanır. Çox vaxt statistik modellər və iqtisadi meyarlar hesablanmış təxminlər əsasında baş verir. Büdcələşdirmə resurslara nəzarət etmək, proqnozlaşdırmaq, effektiv şəkildə bölüşdürmək və səhm üzrə qazancı maksimumlaşdırmaqla artımı sabitləşdirmək cəhdidir. Büdcənin tərtib edilməsində məqsəd gələcəkdə lazım olacaq resursları proqnozlaşdırmaqla müəssisənin maliyyə strukturunu hazırlamaqdır. Ümumi əməliyyat büdcəsi inteqrasiya olunmuş bir yanaşma ilə hazırlanmalı və bütün fəaliyyətlər ümumi strategiyaları dəstəkləməlidir. Büdcələşdirmə prosesində dəyər yaratmayan fəaliyyətlər aradan qaldırılmalı, müəssisənin resurslarından səmərəli istifadə edilməlidir.

Büdcələmə müəssisənin cari əməliyyatlarının və bu fəaliyyətlərin maliyyə təsirlərinin layihələndirilməsi prosesidir (Cəfərli, 2021: 2). Bu, ümumiyyətlə, illik büdcənin təşkili üçün maliyyə, qeyri-maliyyə və texniki cədvəllərə aiddir.

Büdcədə nəzərdə tutulan tədbirlərin planlaşdırılmış məbləğ və xərclə yerinə yetirilməsi müəssisənin fəaliyyəti haqqında məlumat verir (Sərxanlı, 2020). Əməliyyat büdcəsi departament büdcələrinin bir araya toplanmasından ibarət olduğu halda, şöbə büdcələri işçilər üçün fəaliyyət göstəricisidir. Departamentlər əvvəlcədən müəyyən edilmiş xərclər daxilində planlaşdırılan hərəkətləri yerinə yetirə bilmələri ilə uğurlu sayılırlar. Müvafiq şöbələrdə çalışan işçilər büdcədə nəzərdə tutulmuş tədbirləri müəyyən edilmiş xərclər daxilində yerinə yetirdikdə, təşkilati məqsədlərə xidmət etmiş hesab edilir və mükafatlandırılır. Təşviqat, maaş artımı və bonuslar biznesdə əsas mükafatlandırma üsullarıdır.

## Nəticə

Büdcə sistemi təşkilatda və ya firmada mövcud vəziyyətin nəticələrini və şirkətin maliyyə vəziyyətinin yaxşılaşdırılmasıüçün həyata keçirilən strategiyanın nəticələrini əvvəlcədən qiymətləndirməyə imkan verir. Belə ki, maliyyə əmsallarının hesablanması və təhlili və ya digər maliyyə təhlili vasitələrindən istifadə etməklə sənaye müəssisələrində büdcələşdirmə aparılır. Beləliklə, büdcə tərtibi bütün təşkilatın maliyyə dayanıqlığını təmin edərək, müəyyən növ biznes və məhsulların maliyyə dayanıqlığını əvvəlcədən qiymətləndirməyə imkan verir.

Təşkilatda pandemiya ərzində büdcədən istifadə nəticəsində xərclərin azaldılmasıüçün ehtiyatlar, biznesin səmərəliliyinin artırılması yolları müəyyən edilir, maliyyə axınlarının şəffaflıq, etibarlılıq və proqnozlaşdırıla bilmə dərəcəsi artır, idarəetmə qərarlarının qəbulu üçün asanlıqla qəbul edilən obyektiv məlumat bazası yaradılır. formalaşır, müəssisənin gəlir və xərclərinin real strukturu aşkarlanır, maliyyə məsuliyyəti sahələri rəhbər və işçilər dəqiq müəyyən edilir, idarəetmə qərarlarının hazırlanması və qəbulu üçün vaxt azalır, maliyyə əməliyyatlarından itkilər azalır. Buna görə də, pandemiya dövründə sənaye müəssisəsinin fəaliyyətində büdcələşdirmə prinsiplərinin seçilməsinə, formalaşmasına və praktiki tətbiqinə səriştəli yanaşma lazımdır.Hal hazırda ölkəmizdə pandemiyanın yartadığı fəsadları aradan qaldırmaq üçün tədbirlər davam edir. Dünüşürük ki, bu problemlər tezliklə tamamilə aradan qalxacaq.

## Ədəbiyyat

1. Abdullayeva, E.T., Vəliyeva, R.A. (2020). “Makromaliyyə sabitliyinin möhkəmləndirilməsində büdcə-vergi siyasətinin rolu”. In iqtısadi təhlükəsizlik: Mövcud Vəziyyət və Perspektivlər. səh.160-164.
2. Arnold, M., Artz M., “The use of a single budget or separate budgets for planning and performance evaluation”. Accounting, Organizations and Society, 2019, №73, p.50-67.
3. Cəfərli, R., (12 Noyabr 2021),“2022-ci il büdcə layihəsi Azərbaycan iqtisadiyyatının dayanıqlığını göstərir”, Azərbaycan,s.2.
4. Cho C.H., Kurpierz J., “Stretching the public purse: budgetary responses to COVID-19 in Canada”, Journal of Public Budgeting, Accounting and Financial Management, 2020, Vol. 32 No. 5, p.1-13
5. Gülməmmədov, V.İ, Məmmədov R.A. (2019). “Büdcə vəsaitləri ölkənin inkişafına və xalqın rifahına xidmət etməlidir”. Bakı,səh.7-20.
6. Məmmədova, A., “Dövlət büdcəsində səmərəli istifa əsas istiqamətləri” //Kooperasiya/elmi-praktiki jurnal, 2020, №1, S.108-113
7. Məmmədova, P., “Azərbaycanda sənayə müəsiisələrinin investisiya potensiyalının formalaşması və qiymətləndirilməsi”, Kooperasiya/elmi-praktiki jurnal, 2020. №3. S. 61-68.
8. Sərxanlı, S.A., (2020). “Sənayenin İnvestisiya Cəlbediciliyinə Təsir Edən Amillər”. In İqtısadi Təhlükəsizlik: Mövcud Vəziyyət Və Perspektivlər, səh.318-321
9. Yusubov, O., (2021)“Ölkədə iqtisadi artımın təmin olunmasında büdcə xərclərinin səmərəliliyinin qiymətləndirilməsi”, Əmək və sosial münasibətlər: Elmi-praktiki jurnal, 2021, № 1(15), S. 125-134
10. Azərbaycanın sənayesi,Azərbaycan Respublikasının Dövlət Statistika Komitəsi, (2022)https://www.stat.gov.az/source/industry/
11. İqtisadiyyat və Sənaye Nazirliyi, https://www.senaye.gov.az
12. Milli hesablar və makroiqtisadi göstəricilər statistikası, https://www.stat.gov.az/menu/4/e-reports/az/01/001.php

**Rəyçi: i.ü.f.d. Nigar Atakişiyeva**

Göndərildi: 05.03.2022 Qəbul edildi: 07.04.2022

DOI: https://www.doi.org/10.36719/2663-4619/78/86-91

**Vüsal Sədi oğlu Hacıyev**
Dövlət Gömrük Komitəsinin Akademiyası
magistrant
law802552@gmail.com

# GÖMRÜK ORQANLARININ VƏZİFƏLİ ŞƏXSLƏRİ TƏRƏFİNDƏN TÖRƏDİLƏN VƏZİFƏ CİNAYƏTLƏRİNİN KRİMİNALİSTİK XARAKTERİSTİKASI

**Xülasə**

Məqalədə həm vəzifə cinayətlərinin, həm də gömrük orqanlarının vəzifəli şəxsləri tərəfindən törədilən vəzifə cinayətlərinin kriminalistik xarakteristikasının anlayışı və mahiyyəti göstərilməklə yanaşı, hüquq ədəbiyyatlarında ona verilən anlayış və izahatlardan da bəhs edilir. Bununla yanaşı, tədqiqatda ayrıca olaraq, həmin cinayətlərin kriminalistik xarakteristikasının hüquqi təhlili də aparılır. Məlumdur ki, vəzifə cinayətləri cəmiyyətdə idarəetmə aparatı yarandığı vaxtdan mövcud olsa da, bu qrup cinayətlərin baş vermə tezliyi və yayılma miqyası müxtəlif dövrlərdə və müxtəlif ölkələrdə heç də eyni deyildir. Bu fikirləri eynilə gömrük sahəsində törədilmiş vəzifə cinayətlərinə də aid edə bilərik. Hazırda, ədəbiyyatlarda və bütün dünyada bu istiqamətdə müxtəlif profilaktik tədbirlər aparılsa da, yenə də aparıcı yeri həmin cinayətlərin kriminalistik xarakteristikasının aydınlaşdırılması tutur. Ona görə ki, gömrük orqanlarının vəzifəli şəxsləri tərəfindən törədilən cinayətlərin kriminalistik xarakteristikası belə ictimai təhlükəli əməllərin kriminalistik əhəmiyyət kəsb edən əlamətləri haqqında məlumatlar sistemidir və bu sistem qeyd olunan əlamətlər arasında qanunauyğun əlaqələri əks etdirir, istintaqın konkret vəzifələrinin həlli üçün istintaq fərziyyələrinin qurulması və yoxlanılmasına xidmət edir. Ancaq onu da qeyd edək ki, gömrük sahəsi mütəşəkkil cinayətkar qrupların xüsusi yüksək maraq dairəsinin obyekti olduğu üçün bu sahədəki cinayətlərin araşdırılması xeyli mürəkkəbdir.

***Açar sözlər:*** *kriminalistik xarakteristika; vəzifə cinayətləri, gömrük orqanları; istintaq şəraiti; kriminal situasiyalar*

**Vusal Sadi Hajiyev**

## Criminal characteristics of official crimes committed by customs officials

**Abstract**

The article demonstrates the concept and essence of the criminological characteristics of both duty crimes and official crimes committed by customs officials, as well as the concepts and explanations given to it in the legal literature. In addition, the study also provides a juridical analysis of the forensic characteristics of these crimes. It is known that although official crimes have existed in society since the establishment of the administration, the frequency and scale of this group of crimes are not identical, but distinct in different periods and in various countries. The same can be mentioned about the crimes committed in the field of customs. In the same way, we can mention crimes committed in the customs field. However various prophylactic measures are being taken in this direction in the literature and around the world, the headmost role is still to clarify the criminological characteristics of these crimes. Because the juridical characterization of crimes committed by customs officials is a system of information on the forensic signs of such socially detrimental acts, and this system reflects the legitimate relationship between these signs, serves to establish and verify investigative hypotheses to address specific tasks of the inquiry. Nonetheless, it should also be underlined that the investigation of crimes in this area is very complicated, as the customs area is the object of special interest of organized criminal groups.

***Key words:*** *criminological characteristics; official crimes, customs authorities, investigation, interrogation conditions*

## Giriş

Məlum olduğu kimi, vəzifəli şəxslər, eləcə də gömrük orqanlarının vəzifəli şəxsləri tərəfindən törədilən cinayətlərin sayının azaldılması və qarşısının alınmasından ötrü həyata keçirilən metodik tədbirlərin əsasında konkret cinayətlərin kriminalistik xarakteristikası dayanır. Ümumiyyətlə, kriminalistik xarakteristika verilmiş qrup, növ və konkret cinayət üçün tipik olan hansı izləri və harada aşkar edə bilməyə, habelə cinayətkarın onları hansı hərəkətlərlə və hansı üsul və ya vasitələrlə törətməyi, yaxud onların hansı ardıcıllıqla aşkar edilə bilməsinə yardımçı olur. Bu nöqteyi-nəzərdən, gömrük orqanlarının vəzifəli şəxsləri tərəfindən törədilən vəzifə cinayətlərinin kriminalistik xarakteristikası, bu növ cinayətlərin struktur elementləri haqqında məlumatlar şəraitin daha düzgün qiymətləndirilməsinə, istintaq fərziyyələrinin yoxlanılması üçün zəruri olanları irəli sürməyə, məlumatların təhlili əsasında cinayətlərin modellərinin qurulmasına, eləcə də araşdırmanın planlaşdırılmasına köməklik göstərir. Ona görə də məqalədə yuxarıda sadaladığımız bu kimi məsələlərə aydınlıq gətirilməklə, bütövlükdə cinayətlərin kriminalistik xarakteristikası ilə yanaşı, gömrük orqanlarının vəzifəli şəxsləri tərəfindən törədilən vəzifə cinayətlərinin kriminalistik xarakteristikasının da anlayışı verilir, mahiyyəti açıqlanır, təsnifat növləri əhatəli şəkildə göstərilir.

İlk öncə, onu qeyd edək ki, vəzifə cinayətləri ilə bağlı aparılan elmi tədqiqatlar və ibtidai araşdırma orqanlarının iş təcrübəsi onu göstərir ki, cinayətlərin, o cümlədən də haqqında söhbət açdığımız gömrük orqanlarının vəzifəli şəxsləri tərəfindən törədilən vəzifə cinayətlərinin araşdırılma metodikasının əsasında konkret cinayətlərin kriminalistik xarakteristikası dayanır. Ona görə ki, kriminalistik xarakteristika verilmiş qrup, növ və konkret cinayət üçün tipik olan hansı izləri və harada aşkar edə bilməyə, habelə cinayətkarın onları hansı hərəkətlərlə və hansı üsul və ya vasitələrlə törətməyi, yaxud onların hansı ardıcıllıqla aşkar edilə bilməsinə yardımçı olur. Ümumiyyətlə, kriminalistik xarakteristika, onun struktur və elementləri haqqında məlumatlar şəraitin daha düzgün aydınlaşdırılmasına, istintaq fərziyyələrinin yoxlanılması üçün zəruri olanları irəli sürməyə, məlumatların təhlili əsasında cinayətlərin modellərinin qurulmasına, araşdırmanın planlaşdırılmasına köməklik göstərir. Bu baxımdan, A.A.Eysmanın da proqnoz etdiyi kimi, bu və ya digər cinayətkar fəaliyyətin əlamətlərinin tipik abstrakt modeli kimi ayrı-ayrı növ cinayətlərin kriminalistik xarakteristikası mürəkkəb istintaq şəraitlərində müstəntiqlər üçün istiqamət kimi çıxış etmiş və etməkdədir (Qədirov, 2010: 48-49). İ.A.Vozqrinin mövqeyinə görə, cinayətin kriminalistik xarakteristikası cinayətlərin hərtərəfli, tam, obyektiv və tez bir zamanda açılması və istintaqının təşkili və həyata keçirilməsi üçün zəruri olan məlumatları özündə daşıyan cinayətkar əməlin ən əhəmiyyətli əlamətləri haqqında ümumiləşdirilmiş, faktiki məlumatlar və tövsiyyələr sistemidir (Vozqrin, 2010: 22). V.V.Kloçkov göstərir ki, kriminalistik xarakteristika istintaq üçün əhəmiyyət kəsb edən tipik əlamətlər və onlar arasında qarşılıqlı əlaqələr haqqında məlumatlar sistemindən ibarət olan elmi abstraksiyadır (Klaçkov, 1984: 64). A.N.Kolesniçenko və V.E.Konovalova isə göstərirlər ki, cinayətlərin kriminalistik xarakteristikası müəyyən növ cinayətlərin kriminalistik əhəmiyyət kəsb edən əlamətləri haqqında məlumatlar sistemidir və bu məlumatlar bazasına daxil olan ayrı-ayrı elementlər arasında mövcud qanunauyğun əlaqələr konkret cinayətlərin istintaqının əsasını təşkil edir (Kolesniçenko, Konovalova: 7-9). Bu baxımdan da N.P.Yablokov düzgün olaraq qeyd edir ki, kriminalistik xarakteristika elmi ümumiləşdirmə məlumatlarına söykənir və bu əsasda müəyyən növ cinayətkar fəaliyyətin açılması və istintaqı üçün ümumi və xüsusi tövsiyyələri işləyib hazırlamağa imkan verir. Bununla yanaşı, elmi analizə məruz qalaraq bu informasiya vəzifə cinayətləri ilə bağlı cinayətkar fəaliyyətin mahiyyəti və xüsusiyyətlərinin kriminalistik idrakının, nəzəri konsepsiyasının əsası ola bilər (Yablokov, 2002: 44-45). Vəzifə cinayətlərindən söz düşmüşkən, M.V.Axundovun fikrincə, gömrük fəaliyyəti sahəsində törədilən vəzifə cinayətlərinin kriminalistik xarakteristikası cinayətlərin ümumi xarakteristikasının müddəalarını konkretləşdirməklə, aşağıdakı məlumatların nizama salınmış sistemini birləşdirir: onun törədilməsinin ən geniş yayılmış üsulları haqqında; tipik şərait haqqında (həmin cinayətin törədilmə yeri, vaxtı və şəraiti); cinayətkarın (cinayətkarların) şəxsiyyət haqqında; cinayətin, qarşılıqlı təsiri sübut informasiyanın formalaşmasına həlledici təsir göstərən törədilməsi nəticələri (Axundov, 2012: 65).

İ.F.Panteleyev cinayətlərin kriminalistik xarakteristikasına, yuxarıda sadalanan elementlərlə yanaşı, tipik kriminal situasiyaları, eləcə də daha geniş yayılmış texniki vasitələr və onların əldə edilməsi

mənbələri, iştirakçıların cəlb edilməsi metodları və üsulları, cinayətin törədilməsinin ən geniş yayılmış motivləri və məqsədləri, onların tipik nəticələri haqqında məlumatları, həmçinin, cinayətin törədilməsinə kömək etmiş kriminal situasiyanın və halın tipik viktimoloji aspektlərini daxil edir (Panteleev1980: s.18; 43).

Göründüyü kimi, bəzi müəlliflərə görə, kriminalistik xarakteristika cinayətlərin göstəricilərinin, xarakterik cəhətlərinin məcmusu, digərlərinə görə cinayətlərin kriminalistik cəhətlərini, əlamətlərini və xassələrini əks etdirən elmi abstraksiya, üçüncü qrup müəlliflərə görə isə, cinayətkar əməlin hər hansı xüsusiyyətləri və keyfiyyətləri haqqında məlumatlar sistemidir. Ona görə ki, kriminalistik xarakteristika yalnız istintaq üçün əhəmiyyət kəsb edən cinayətin strukturunu təşkil edən elementlərin tipik xassələrini, əlamət və əlaqələrini əks etdirir. Habelə cinayətlərin kriminalistik xarakteristikası, eyni zamanda, istintaqı aparılan cinayətin kriminalistik əhəmiyyət kəsb edən əlamətlərinin məqsədyönlü şəkildə üzə çıxarılmasını təmin etməyə, ən perspektivli fərziyyələri irəli sürməyə, istintaq prosesini səmərəli planlaşdırmağa və onun qarşısında duran vəzifələri tez bir zamanda və daha az qüvvə sərf etməklə həll etməyə imkan verir. Bu baxımdan, cinayətlərin kriminalistik xarakteristikası cinayətin tipik, kriminalistik əhəmiyyət kəsb edən əlamətləri haqqında ümumiləşdirilmiş faktiki məlumatlar (informasiya) sistemi, onlara əsaslanan elmi nəticələr və tövsiyyələrdir ki, bunlar haqqında biliklər cinayətlərin hərtərəfli, tam, obyektiv və tez bir zamanda açılması, istintaqının təşkili və həyata keçirilməsi üçün zəruridir (Qədirov, 2010: 51-52).

Onu da diqqətə çatdıraq ki, bir çox kriminalist alimlər cinayətlərin kriminalistik xarakteristikasının strukturuna müxtəlif elementləri daxil etsələr də, indiyə qədər gömrük sahəsində həmin orqanların vəzifəli şəxsləri tərəfindən törədilən cinayətlərin kriminalistik xarakteristikasının strukturu tam işlənib hazırlanmamışdır. Məsələ ilə bağlı M.V.Axundov yazır ki, belə struktur aşağıdakı əsas komponentlərdən (elementlərdən) toplanır:

1) Müxtəlif cinayətkar əməllərin törədilməsi təşkilatçılarının tipik cəhdləri (Azərbaycan Respublikası gömrük sərhəddindən mal və nəqliyyat vasitələrinin daşınmasının həyata keçirilməsi zamanı; gömrük rejiminin pozulması; gömrük ödənişlərinin və rəsmiləşdirilməsinin həyata keçirilməsi zamanı; gömrük və valyuta nəzarətinin reallaşdırılması vaxtı);
2) Cinayətkarların şəxsiyyətinin tipik xüsusiyyətləri (oxşar növ cinayətlər, bir qayda olaraq, təsərrüfat-iqtisadi fəaliyyətin müxtəlif sahələrində hərəkət edən, peşəkar cinayətkarlıqda ixtisaslaşan və s. mütəşəkkil cinayətkar qruplar tərəfindən törədilir) və onların hərəkətlərinin motivləri;
3) Nəzərdən keçirilən cinayətlərin hazırlıq və törədilməsinin ən geniş yayılmış üsul və vasitələri;
4) Cinayətə hazırlıq və onun törədilməsi zamanı tətbiq edilən gizlətmənin (konspirasiyanın) tipik üsulları;
5) Gömrük sahəsində hazırlanan və törədilən cinayətlərin tipik şəraiti (vəziyyəti);
6) Cinayətkar fəaliyyət subyektlərinin spesifik izləri (Axundov, 2012:.68).

Qeyd edək ki, gömrük orqanların vəzifəli şəxsləri tərəfindən törədilən vəzifə cinayətlərinin spesifikliyi çoxsəviyyəli xarakterə malikdir və özündə iqtisadi fəaliyyətin müxtəlif komponentlərini (bank, vergi, nəqliyyat, sanitar nəzarət sistemi, sərhəd xidməti, biznes və s.) birləşdirir. Diqqətə çatdıraq ki, gömrük orqanlarının vəzifəli şəxsləri tərəfindən törədilən cinayətlərin kriminalistik xarakteristikasının xüsusiyyətləri, ilk dəfə, Y.P.Qarmayev tərəfindən verilmişdir (Qarmayev, 2003 s.105). Buna əsaslanaraq, M.V.Axundovun fikrincə, bütövlükdə Y.P.Qarmayevin verilmiş məsələ üzrə mövqeyini əsas kimi qəbul etməklə, tədqiq edilən cinayətlərin spesifikliyini nəzərə almaqla, onu gömrük orqanlarının vəzifəli şəxsləri tərəfindən törədilən cinayətlərin kriminalistik xarakteristikasının aşağıdakı tərkib elementləri ilə tamamlamaq lazımdır: cinayətin mexanizmi; cinayətin törədilməsinin yeri və vaxtı şərtləri; cinayətin törədilməsi zamanı istifadə edilən vasitələr; cinayətin törədilməsinə köməklik göstərən hallar və şəraitlər; mənafeyi naminə gömrük orqanlarının nümayəndələri tərəfindən vəzifə cinayətləri törədən cinayətkarın şəxsiyyəti (Axundov, 2012: 69).

Ümumiyyətlə, gömrük fəaliyyəti sahəsində törədilən cinayətlər özünün müxtə-lifliyi ilə fərqlənməsinə, və ya müxtəlif üsullarla törədilməsinə baxmayaraq, onların hamısı tipik xüsusiyyətlərlə səciyyələnirlər və həmin xüsusiyyətlər bir çox cəhətdən kriminalistik xarakteristikanın məzmununu müəyyən edərək aşağıdakılardan ibarətdir:

1. Gömrük sahəsində fəaliyyət normativ-hüquqi aktlarla tənzimlənir və müvafiq uçot sənədləri ilə rəsmiləşdirilməlidir (9);
2. Vəzifə cinayətləri həm qəsdən, həm də ehtiyatsızlıqdan müəyyən hüquqi tələblərin, qaydalar, müddəalar və təlimatların, o cümlədən verilmiş müəssisə, təşkilatlarda müəyyən edilən qaydanın, bir qayda olaraq, müxtəlif motivlər üzrə pozulması yolu ilə törədilir;
3. Cinayət həm vəzifəli şəxslər, həm də vəzifəsi olmayan şəxslər, sıravi işçilər, fiziki şəxslər və hüquqi şəxslərin nümayəndələri, eləcə də nəzərdən keçirilən cinayət növünə aidiyyatı olan digər şəxslər tərəfindən törədilir (10, s.144);
4. Cinayət əksər hallarda bu və ya digər gömrük əməliyyatının yerinə yetirilməsi prosesində törədilir;
5. Cinayətkar hərəkətlər, bir qayda olaraq, gömrük, bank, nəqliyyat-müşayiətedici, sərhəd, beynəlxalq-tranzit və digər uçot sənədlərində qeydə alınır; yəni müəyyən izlər saxlanılır, bəzən isə, onlar qismən uçotda əks etdirilmir ki, bu da öz-özlüyündə cinayətkar qəsd haqqında şəhadət verir;
6. Hesabat və uçot sənədlərinin təqdim edilmə müddətinin pozulması;
7. Cinayət uzanan xarakter daşıyır; bir qayda olaraq, leqal xarici iqtisadi fəaliyyət çərçivəsində müntəzəm həyata keçirilir;
8. Cinayətkar hərəkətlər digər müəssisə və təşkilatların, o cümlədən də xarici təşkilatların fəaliyyəti ilə bağlıdır və onların fəaliyyətində, əməliyyatlarında, sənədlərində, həmin təşkilatlarda işləyən şəxslərin yaddaşında müəyyən izlər əks etdirir;
9. Cinayətkar fəaliyyət – adi fəaliyyət, konkret əməliyyat çərçivəsində müəyyən şəraitdə həyata keçirilir; onlar bu və ya digər dərəcədə idarə, idarədənkənar, dövlət nəzarəti altında olurlar; dövlət nəzarəti orqanlarının yoxlamalarının nəticələri sənədlərlə rəsmiləşdirilir və bu zaman, şübhəsiz ki, müəyyən izlər formalaşır;
10. Cinayətkar fəaliyyət nəticəsində idarə, müəssisə və təşkilata müəyyən zərər vurulur ki, bu da onalrın maliyyə və iqtisadi vəziyyətində əks olunur və həmçinin, müəyyən izlər formalaşır. Çünki xarici iqtisadi fəaliyyət sahəsindəki cinayətkar hərəkətlər qaçılmaz olaraq qanunauyğun fəaliyyətlə bağlıdır; ona görə də cinayətin izləri kontragentlərlə olan əlaqədə təzahür etməyə bilməz (Axundov: 2012: s.70-71).

Göründüyü kimi, yuxarıda verdiyimiz izahlarda cinayətlərin kriminalistik xarakteristikasını cinayət izlərinin məcmusu kimi, yəni faktlar-nəticələr kimi başa düşməklə, onları cinayətin kriminalistik əlamətləri kimi nəzərdən keçirmiş olduq. Qeyd edək ki,gömrük işi sahəsində belə əlamətlərə,həmçinin, aşağıdakılar da aiddir:

1) Müəssisə və təşkilatların fəaliyyətinin həm dövlət tərəfindən tənzimlənən, həm də verilmiş strukturun təsis və normativ aktları ilə müəyyən edilən normativ, qanunverici tələblərinin pozulması;
2) Ticarət-iqtisadi münasibətlərin gömrük tənzimlənməsinin qeyri-qanuni vasitələrinin tətbiqi ilə pozulmalar;
3) Gömrük rüsumlarının, vergilərinin və digər gömrük ödənişlərinin tutulmasından yayınmaya köməklik göstərmə;
4) Kəsirlər, nəzərdə tutulmayan şübhəli ödənişlər, qeydə alınmamış dəyərlilərin olması və s.;
5) Müəssisə və təşkilatlarda istehsal prosesi və kommersiya fəaliyyəti ilə, xüsusən kontragent sazişləri ilə nəzərdə tutulan əməliyyatlar üzrə, bağlı olan qarışıq sahələrdəki neqativ və kriminal hadisələr;
6) Təsərrüfat fəaliyyəti ilə bağlı olan bu və ya digər işçilərin qanunsuz davranışı, qeyri-qanuni və ya kriminal hərəkətlər, onlara müvafiq rəhbərlərin və vəzifəli şəxslərin reaksiya verməməsi;
7) Şübhəli həyat tərzi, o cümlədən gəlirlərə müvafiq olmayan məsrəflər, təşkilat (müəssisə) hesabına konkret şəxslərin çox bahalı əmlak əldə etməsi və s.;
8) Azərbaycan Respublikası gömrük sərhəddindən malların və nəqliyyat vasitələrinin keçirilməsi qaydalarının pozulması;
9) Gömrük işi sahəsində cinayətlər, eləcə də gömrük qaydalarının və vergi qanunvericiliyinin normalarının pozulmasına yol verilməsi və onların törədilməsinə köməklik göstərilməsi; Azərbaycan Respublikasının gömrük sərhəddindən narkotik vasitələrin, silahın, bədii, tarixi və Azərbaycan xalqının və xarici ölkələrin xalqlarının arxeoloji sərvətinin, əqli mülkiyyət obyektlərinin, məhv olmaq təhlükəsi

olan heyvan və bitki növlərinin, digər malların qanunsuz keçirilməsinin qarşısının alınmaması; beynəlxalq terrorizmlə mübarizəyə və Azərbaycan Respublikası hava limanlarında beynəlxalq mülki aviasiyanın fəaliyyətinə qanunsuz müdaxilənin qarşısının alınmasına köməklik göstərilməməsi;

10) Gömrük nəzarətini – gömrük orqanlarının vəzifəli şəxsləri tərəfindən gömrük işi və gömrük rəsmiləşdirilməsi haqqında Azərbaycan Respublikası qanunvericiliyinə riayət olunmasını təmin etmək məqsədi ilə həyata keçirilən tədbirlər məcmusunu qəsdən pozulması, Azərbaycan Respublikası gömrük sərhəddindən sürətləndirilmiş mal dövriyyəsinə maneələr törədilməsi;

11) Öz hərəkət və hərəkətsizlikləri̇lə xarici iqtisadi fəaliyyətin gömrük statisti-kası və Azərbaycan Respublikasının xüsusi gömrük statistikasının təhrif edilməsi;

12) Xarici iqtisadi fəaliyyətin mal nomenklaturası haqqında hesabatın təhrifi;

13) Müəssisələrin, təsisatların, təşkilatlar və fiziki şəxslərin xarici iqtisadi əlaqələrinin inkişafına maneəçilik törədilməsi;

14) Dövlət təhlükəsizliyinə, ictimai qayda və mənəviyyata, insanların həyat və sağlamlığına, heyvan və bitkilərin, ətraf mühitin mühafizəsinə, daşınan malların Azərbaycan istehlakçılarının mənafelərinin müdafiəsinə ziyan vurulması;

15) Valyuta nəzarətinin həyata keçirilməsi qaydalarının pozulması;

16) Azərbaycan Respublikasının gömrük işinə dair hissəsində beynəlxalq öhdəliklərinin, gömrük işi ilə bağlı Azərbaycan Respublikasının beynəlxalq müqavilələrinin yerinə yetirilməsinə maneəçilik törədilməsi, bəzən isə pozulması;

17) Xarici dövlətlərin gömrük və digər orqanları ilə gömrük işi məsələləri ilə məşğul olan beynəlxalq təşkilatlarla əməkdaşlıq üçün maneələrin yaradılması;

18) Əməkdaşların əxlaqi-peşəkar keyfiyyətlərinə mənfi təsir göstərilməsi;

19) Azərbaycan Respublikasının Prezidentinə, Milli Məclisinə, digər dövlət orqanlarına, müəssisə, idarə və təşkilatlara və vətəndaşlara gömrük məsələləri üzrə həqiqətə uyğun olmayan, təhrif olunmuş, bilə-bilə yalan informasiya təqdim edilməsi;

20) Dövlətin vahid maliyyə-təsərrüfat siyasətininin reallaşmasına, gömrük orqanlarının maddi-texniki bazasının genişlənməsinə maneəçilik törədilməsi, həmin orqanların işçiləri üçün zəruri əmək və sosial şəraitin yaradılmaması (Axundov: 2012: 71-73).

Qeyd edək ki, yuxarıda sadaladığımız əlamətlər gömrük orqanlarının vəzifəli şəxsləri tərəfindən törədilmiş cinayətlər üçün tipikdir və onların araşdırılmasına oxşar yanaşmalar tələb olunur. Ümumiyyətlə, araşdırmanın tam, hərtərəfli və obyektiv aparılması ibtidai istintaqın qarşısında duran vəzifələrin həllinə mühüm köməklik göstərir. Bundan əlavə, onu da diqqətə çatdıraq ki, xarici iqtisadi fəaliyyətdə sadaladığımız əlamətlər, narkotik vasitələrin və psixotrop maddələrin, odlu və soyuq silahların qanunsuz dövriyyəsi, terrorizmin maliyyələşdirilməsi və digərləri ilə bağlı olan hallar gömrük işində vəzifə sui-istifadələri haqqında müəyyən qənaətlərə gəlməyə əsas verə bilər. Bu baxımdan, onları informasiyanın qiymətləndirilməsi, kriminalistik xarakteristikanın digər elementlərinin, o cümlədən vəzifə cinayətlərinin törədilmə şəraitinin təhlili zamanı nəzərə almaq mütləqdir. Ona görə ki, belə əlamətlər gömrük orqanlarında baş verən vəzifə cinayətlərinin törədilməsi və gizlədilməsi üsullarını, həmçinin, cinayətin törədilməsinə aidiyyatı olan şəxsləri aşkar etməyə kömək edir.

Göründüyü kimi, gömrük orqanlarının vəzifəli şəxsləri tərəfindən törədilmiş cinayətlər ilə mübarizə üzrə tədbirlərin ümumi sistemində mühüm rol onun təmin edilməsinin kriminalistik metod, üsul və vasitələrinə məxsusdur. Ümumiyyətlə, gömrük sahəsi mütəşəkkil cinayətkar qrupların xüsusi yüksək maraq dairəsinin obyekti olduğu üçün bu sahədəki cinayətlərin araşdırılması xeyli mürəkkəbdir. Bu səbəbdən də Azərbaycan Respublikası Dövlət Gömrük Komitəsinin, eləcə də digər hüquq-mühafizə orqanlarının əməliyyat işçiləri və müstəntiqləri, ilk növbədə, belə cinayətlərin mahiyyətini, onların, tədqiq edilən cinayətlərin hazırlığı, törədilməsi və gizlədilməsi qanunauyğunluqlarının təhlili və ümumiləşdirilməsi əsasında qurulan kriminalistik xarakteristikasını təsəvvür etməlidirlər.

Beləliklə, sonda ümumi şəkildə qeyd edək ki, vəzifə cinayətlərinin kriminalistik xarakteristikası haqqında apardığımız təhlilin məqsədi ondan ibarətdir ki, bu anlayışın mahiyyəti aydınlaşdırılmaqla, vəzifə cinayətlərinin kriminalistik xarakteristikasının işlənib hazırlanmasında onun müddəalarından istifadə olunsun. Bu nöqteyi-nəzərdən, gömrük orqanlarının vəzifəli şəxsləri tərəfindən törədilən vəzifə

cinayətlərinin kriminalistik xarakteristikası belə ictimai təhlükəli əməllərin kriminalistik əhəmiyyət kəsb edən əlamətləri haqqında məlumatlar sistemidir və bu sistem qeyd olunan əlamətlər arasında qanunauyğun əlaqələri əks etdirir, istintaqın konkret vəzifələrinin həlli üçün istintaq fərziyyələrinin qurulması və yoxlanılmasına xidmət edir.

## Nəticə

Yuxarıda tədqiqatın aparılması ilə gəldiyimiz nəticə ondan ibarətdir ki, vəzifə cinayətləri bütövlükdə özünün ictimai təhlükəliliyi, təcrübədə baş vermə tezliyi ilə həm ölkə daxilində, həm də dünya miqyasında fərqlənən ictimai təhlükəli əməllərdəndir. Yaşadığımız müasir dövrdə isə, vəzifə cinayətlərindən sayılan gömrük orqanlarının vəzifəli şəxsləri tərəfindən törədilmiş müxtəlif spektrlı vəzifə cinayətləri istər dövlətdaxili, istərsə də qlobal səviyyədə əksər dövlətlərin əziyyət çəkdiyi, özünün ictimai təhlükəliliyinin xarakter və dərəcəsi ilə fərqlənən cinayətlərdəndir. Bu cinayətlərinin araşdırılması, öyrənilməsi və qarşısının alınmasında həmin növ cinayətlərin kriminalistik xarakteristikası çox mühüm rol oynayır. Bu baxımdan, ədəbiyyatlarda da söylənildiyi kimi, bu və ya digər cinayətkar fəaliyyətin əlamətlərinin tipik abstrakt modeli kimi ayrı-ayrı növ cinayətlərin kriminalistik xarakteristikası mürəkkəb istintaq şəraitlərində müstəntiqlər üçün istiqamət kimi çıxış etməkdədir. Odur ki, gömrük orqanlarının vəzifəli şəxsləri tərəfindən törədilmiş vəzifə cinayətlər ilə mübarizə üzrə tədbirlərin ümumi sistemində mühüm rol onun təmin edilməsinin kriminalistik metod, üsul və vasitələrinə məxsusdur.

## Ədəbiyyat


1. Qədirov, A.X. (2010) Korrupsiya cinayətlərinin istintaqının prosessual-taktiki və elmi-metodiki problemləri, Bakı, 196 s.
2. Vozqrin, A.İ (1983) Kriminalistiçeskaya metodika rasledovaniya prestupleniya Minsk: Vışeyş.şk.
3. Klaçkov, V.V.(1984) Sostayennie i prespektivı kriminalistiçeskaya xarakteristika prestupleniy, Moskva, s. 63-65.
4. Kolesniçenko, A.N., Kononova V.E. (1985) Kriminalistiçeskaya xarakteristika prestupleniy, Xarkov: s. 131
5. Yablokov, N.P. (2002) Rassledovanie orqanizovannoy prestupnoy deyatelnosti, Moskva: Yurist, 172 s.
6. Axundov, M.V. (2012) Gömrük orqanlarının vəzifəli şəxsləri tərəfindən törədilən vəzifə cinayətlərinin araşdırılmasının xüsusiyyətləri, Bakı: Elm-Təhsil, 232 s.
7. Panteleev, İ.F. (1980) Teoretiçeskie problemı sovetskoy kriminaliski, Uçeb.posobie, Moskva: Vyuzi, 96 s.
8. Qarmaev, Y.P. (2003) Aktualınıe vaprosı teorii i praktiki rassledovaniya doljnost nıx prestupleniy v tamojennıx orqanax, Dis.kand.yurid., Moskva: 175 c.
9. http://www.e-qanun.az
10. Azərbaycan Respublikası Cinayət Məcəlləsinin Kommentariyası / H.e.d., red. F.Y.Səməndərov, II Hissə. CM-in 190 – 353-cü maddələrinin şərhi. – Bakı: Hüquq Yayın Evi, – 2018. – 800 s.
11. Məmmədov, V.Q. (2006) Korrupsiya ilə bağlı cinayətlərlə mübarizənin problem məsələləri, Bakı: Adiloğlu, 186 s.
12. http://e-qanun.az/framework/46947 – Azərbaycan Respublikasının 30 dekabr 1999-cu il Cinayət Məcəlləsi.
13. http://e-qanun.az/framework/46957 – Azərbaycan Respublikasının Gömrük Məcəlləsi


**Rəyçi: h.e.d. Midhət Qafarov**

Göndərildi: 01.03.2022 Qəbul edildi: 17.04.2022

DOI: https://www.doi.org/10.36719/2663-4619/78/92-96

**Leyla Ramiz Mammadova**
Baku State Universty
master
leilaa.mva@gmail.com

## PROCEEDINGS IN THE UN INTERNATIONAL COURT OF JUSTICE

### Abstract

The International Court of Justice as the UN main judicial body plays a fundamental role in establishing the rule of law in international relations. It should help to resolve interstate disputes in conditions where all other means of peace are ineffective. The relevance of the study of the functions and powers of the UN International Court, its practice is explained by the fact that it is precisely from the day of its establishment that the court remains the only universal international judicial body to date. The article will examine a number of procedural issues in the activity of the court, in particular, the procedure for conducting proceedings in the International Courtof Justice.

**Key words***: international court, international court of justice, proceedings, world Court, Hague court*

**Leyla Ramiz qızı Məmmədova**

## BMT Beynəlxalq ədalət məhkəməsində icraat

### Xülasə

Beynəlxalq Ədalət Məhkəməsi BMT-nin baş məhkəmə orqanı kimi beynəlxalq münasibətlərdə hüququn aliliyininbərqərar edilməsində başlıca rol oynayır. O,dövlətlərarası mübahisələrin həlli üçün bütün digər sülh vasitələrinin səmərəsiz olduğu şəraitdə köməklik göstərməlidir. BMT-nin Beynəlxalq Məhkəməsinin funksiyalarının və səlahiyyətlərinin, onun təcrübəsinin tədqiqinin aktuallığı onunla izah olunur ki, məhz məhkəmə yarandığı gündən indiyədək yeganə universal beynəlxalq məhkəmə orqanı olaraq qalır. Məqalədə məhkəmənin fəaliyyətində bir sıra prosessual məsələlələr xüsusilə, beynəlxalq məhkəmədə icraatın keçirilmə qaydaları araşdırılacaqdır.

***Açar sözlər:*** *beynəlxalq, beynəlxalq ədalət məhkəməsi, icraat, Dünya məhkəməsi, Haaqa məhkəməsi*

### Introduction

The International Court of Justice (the International Court of Justice, hereinafter referred to as ICJ), which is perhaps the most authoritative judicial body in the world, deserves the most attention. Therefore, it is vital for our state to train highly qualified international lawyers who, in the event of any international dispute, can represent the interests of our state at a high level. However, it is possible to speak about the success of the domestic higher education given the mass nature of the professional level of lawyers.

As you know, the ICJ was founded at the same time with the United Nations (hereinafter referred to as the UN) in 1945 and began its activity in 1946. The creation of the ICJ is the culmination of a long development of ways to peacefully resolve international disputes. The Statute of the ICJ is based on the Statute of the Permanent Court of International Justice, but differs from the latter, first of all, in that the ICJ is one of the main organs of the UN. All members of the UN automatically become parties to the ICJ Statute, and if the state is not a member of the UN, then it can be a party to the process (Article 93 of the UN Charter) (1).

The ICJ Statute gives broad powers to the parties to involve their representatives in court. Interpretation of Art. 42 gives reason to believe that "there are no restrictions on the choice of representatives ... The state may invite any person to participate in proceedings, regardless of citizenship or qualifications" (2, 965). In fact, ICJ does not establish any rules for the selection of state representatives. The choice of a representative rests solely with the state, so the representative does not have to be a member of a professional bar association of any state in order to represent the state before

2020-ci ildə Azərbaycanın real ÜDM-i 400 milyon manat birbaşa və 205 milyon manat dolayı olmaqla, ümumilikdə, 605 milyon manat artacaq, bilavasitə bu sahədə 10900 olmaqla, ümumilikdə, 18900 yeni iş yeri yaradılacaqdır. Nəqliyyat sektorunda yük və sərnişin daşınmasına çəkilmiş xərclər, əvvəlki ilə nisbətən %-lə aşağıda qeyd edilib.

| **Cəmi** | **2015** | **2016** | **2017** | **2018** | **2019** | **2020** |
|---|---|---|---|---|---|---|
| | **107.3** | **120.9** | **131.9** | **114.5** | **102.7** | **110.1** |
| Dəmir yolu | 90.3 | 162.1 | 140.6 | 70.3 | 105.3 | 117.1 |
| Dəniz | 130.1 | 112.4 | 93.4 | 107.6 | 97.1 | 99.5 |
| Hava | 105.2 | 120.3 | 166.8 | 134.5 | 103.9 | 127.8 |
| Boru kəməri | 104.8 | 102.9 | 107.1 | 94.0 | 111.0 | 94.3 |
| Avtomobil | 116.8 | 114.9 | 113.7 | 112.6 | 94.5 | 63.2 |
| Metro | 104.6 | 152.2 | 66.4 | 103.8 | 106.1 | 92.1 |

Hazırda Azərbaycanın beynəlxalq nəqliyyat qovşağına çevrilməsi istiqamətində aşağıdakı mühüm layihələrin icrası üzrə işlər aparılır.

- Avropa, Qara dəniz, Qafqaz, Xəzər və Mərkəzi Asiya regionlarının arasında iqtisadi, ticari, nəqliyyat və logistika əlaqələrinin inkişafı;
- Çin və Avropa İttifaqı arasında ən qısa quru yolu üzərində qurulan multimodal dəhlizin inkişafı;
- Şimal-Cənub nəqliyyat dəhlizinin qurulması;
- Böyük İpək Yolu çərçivəsində tranzit yüklərin cəlb edilməsi

2020 –ci ildə Azərbaycan ordusu tərəfindən tarixi torpaqların işğaldan azad edilməsi nəqliyyat sahəsinə yeni nəfəs gətirdi. Çəkiləcək yeni nəqliyyat xətlərindən biri Azərbaycanı təxminən 30 ildir Ermənistan tərəfindən mühasirəyə alınan Naxçıvanla birləşdirəcəkdir. Bu, həmçinin Cənubi Qafqaz ölkələri və qonşuları arasında əlaqəni yaxşılaşdıracaqdır. Yeni nəqliyyat landşaftı iqtisadi əməkdaşlığa və inkişafa kömək edəcək, bu da regional və beynəlxalq miqyasda müsbət təsiri təmin edəcək

## Nəticə

Qloballaşan dünyada dinamik və ən fəal sahələrdən biri də nəqliyyatdır. Müasir dövrdə nəqliyyat sektorunun inkişafı, xidmət sahələrinin sərbəst mübadiləsinin, sosial-iqtisadi inkşafın, eyni zamanda rəqabətin və həyat şəraitinin yüksəlməsinin əsas komponentlərindən biridir. Eyni zamanda nəqliyyat sahəsinin inkşafı ölkənin inkşafı ilə düz mütənasiblik təşkil edir.Ümumi baxımdan nəqliyyat, bütövlükdə ölkənin başqa iqtisadi sektorları ilə yanaşı sosial tələbatların qarşılanması və eyni zamanda başqa ölkənin tələblərinə xidmət etmək baxımından əhəmiyyətli sahədir. Nəqliyyat sisteminə bir sıra nəqliyyat növləri daxildir və müasir dövrdə nəqliyyat sahəsi makro səviyyədə idarəetmə obyekti kimi qeyd olunur.

## Ədəbiyyat

1. Babaoglu.H. ( 1998) Dünya siyasəti və Beynəlxalq münasibətlər
2. M.Nəsibov (2015) Gələcək dünya düzəni və geosiyasi mənzərə. Siyasi proqnozların əsasları. Ümumi hissə. I kitab. Bakı: Elm və təhsil. nəşriyyatı, 544 s.
3. Əliyev E.Ə. (2009) Beynəlxalq nəqliyyat hüququ.Dərslik. Bakı Elm.
4. Məmmədov.Z.S. (2009) XXI :İqtisadi İnkişafın nəqliyyat faktoru.Bakı .Gənclik386 səh.
5. Azərbaycan Respublikasında nəqliyyat sisteminin inkisafına dair Dövlət Proqramı ( 2012) Elm.
6. Azərbaycan Respublikasında avtomobil yolları şəbəkəsinin yeniləşdirilməsi və inkşafına dair Dövlət Proqramı|| (2009-2020-ci illər)
7. Cənub-Şimal nəqliyyat dəhlizi: inkişaf meyilləri və perspektivlər. 2005-2006- cı illərdə Azərbaycan Dövlət İqtisad Universitetində yerinə yetirilmiş büdcə təyinatlı elmi-tədqiqat işlərinin yekununa həsr edilmiş elmi-praktiki konfransın tezisləri. Azərbaycan Dövlət İqtisad Universiteti. (A.F.Hacızadə ilə müştərək)

8. Regional nəqliyyat infrastrukturunun təkmilləşdirilməsində Bakı-Tbilisi-Qars dəmir yolu xətti layihəsinin rolu. Azərbaycanın vergi jurnalı. Bakı: № 3.
9. Koçetov E.G. ( 1999) Geoiqtisadiyyat. Dünya iqtisadi məkanının mənimsənilməsi ali məktəblər üçün dərslik. Rus dilindən tərcümə. Bakı: ―İqtisad Universiteti‖ Nəşriyyatı
10. Qloballaşma prosesində Qafqaz və Mərkəzi Asiya, iqtisadi və beynəlxalq münasibətlər, II Beynəlxalq Konqres materialları, Qafqaz Universiteti
11. mot.gov.az-A(zərbaycan Respublikası Nəqliyyat Nazirliyi)
12. www.traceca-org.org/ru/traseka/istorija-traseka/
13. www.xalqqazeti.com/az/news/economy/66959
14. iqtisadiyyat.com/az/pages/8/information/489

**Rəyçi: i.ü.f.d. Camal Hacıyev**

Göndərilib: 11.03.2022 Qəbul edilib: 14. 04.2022

DOI: https://www.doi.org/10.36719/2663-4619/78/156-162

**Həbib Yusif oğlu Həbibi**
Azərbaycan Dövlət İqtisad Universiteti (UNEC)
magistrant
hebib7732@gmail.com

# AZƏRBAYCANIN İŞĞALDAN AZAD OLUNMUŞ RAYONLARINDA MÜASİR NƏQLİYYAT SİSTEMİNİN İNKİŞAFI

**Xülasə**

Nəqliyyatdasektorislahatlarınıntamalanmasıvahidnəqliyyatsiyasətininformalaşması üçün stimul yaratmışdır. Vahid nəqliyyat siyasətinin hədəflərindən biri sub sektroların inteqrasiyasından və nəqliyyat xidməti bazarında həm birləşmiş həm də multi-modelli nəqliyyat sistemlərində bacarıqların artırılmasındanibarətdir.

Araşdırılmış ədəbiyyatlar vasitəsilə işğaldan azad edilmiş rayonlarda nəqliyyat sisteminin təşkilinin tənzimləməsi, dünya təcrübəsinin qiymətləndirilməsi və Azərbaycanda istifadə imkanları müqayisə ediləcəkdir.

Nəqliyyat daşımaları üzrə, aralıq xidmətlərin dəyəri müxtəlif rola malikdir. Belə ki, bu zaman istifadə edilən aralıq məhsul üzrə marja daşıma və ticarət xidmətlərini əhatə edir. Məlum olduğu kimi, sənaye, investor və ev təsərrüfatı tərəfindən istifadə edilən məhsulun son məkanı istehlak nöqtəsində qərarlaşır. Məhsul və ya xidmətin ixrac məkanı isə istehsal nöqtəsi ilə müxtəliflik təşkil edir. Tələbin fərqsizliyi funksiyası göstərir ki, məkanda tələb əmtəə qrupuna proporsionaldır və məkanla yanaşı texniki dəyişikliklərlə də əlaqəlidir.

Daxili nəqliyyat xidməti bazarında alternativ xidmət növü kimi dəmiryol nəqliyyatı çıxış edir. Xarici xidmət bazarına çıxış imkanlarının zəif olmasına baxmayaraq, hazırba nəqliyyat müəssisələri daxili bazarda necə rəqabət aparmaqları və digər nəqliyyat növləri qarşısında üstünlüyü necə əldə etmələri haqqında düşünürlər. Ona görə də, nəqliyyat xidməti təklif edən hər bir müəssisə üçün əsas problem bu resurslardan səmərəli istifadə etməkdir.

Daxili xidmət bazarında yalnız iri müəssisələr tam xidmət paketi: yükün daşınmasının təşkili, yüklənməsinin təşkili, saxlanılması və s. təklif etmək imkanına malikdirlər. Bununla belə, rəqabət üstünlüyü faktoru kimi enerji daşıyıcılarının qiyməti də digər ölkələrlə müqayisədə yüksəkdir ki, bu da dəniz nəqliyyatını digər nəqliyyat-tranzit vasitələri ilə müqayisədə daha rəqabətli edir.

***Açar sözlər:*** *nəqliyyat sistemi, azad müasir nəqliyyat sisteminin inkişafı, Azərbaycanda nəqliyyat sistemində yenidən qurulma işləri*

**Habib Yusif Habibi**

## Development of modern transport system in occupied territories in Azerbaijan

**Abstract**

Completion of sector reforms in transport has created an incentive for the formation of a unified transport policy. One of the goals of the unified transport policy is the integration of sub-sectors and capacity building in the transport service market in both integrated and multi-model transport systems.

The studied literature will compare the organization of the transport system in the liberated regions, the assessment of world experience and the possibility of using it in Azerbaijan.

The cost of intermediate services plays a different role in transportation. Thus, the margin on the intermediate product used in this case covers transportation and trade services. As is well known, the last place for a product used by industry, investors and households is at the point of consumption. The export space of a product or service varies with the point of production. The demand difference function shows that demand in space is proportional to the commodity group and is related to space as well as technical changes.

In the domestic transport services market, railway transport is an alternative service. Despite their limited access to foreign services, modern transport companies are thinking about how to compete in the domestic market and how to gain an advantage over other modes of transport. Therefore, the main problem for any enterprise offering transport services is the efficient use of these resources.

In the domestic service market, only large enterprises have a full service package: organization of cargo transportation, organization of loading, storage, etc. have the opportunity to offer. However, as a factor of competitive advantage, energy prices are also higher than in other countries, which makes maritime transport more competitive than other means of transport and transit.

***Key words:*** *transport system, development of free modern transport system, reconstruction of transport system*

## Giriş

Nəqliyyat sisteminin inkişafı Azərbaycan Respublikası üçün böyük əhəmiyyət kəsb edir. Ölkə iqtisadiyyatının infrastruktur sahələri olan enerji, rabitə, təhsil,səhiyyə ilə yanaşı,nəqliyyat cəmiyyətin həyat fəaliyyətinin ilkin tələbatını təminetmək ilə sosial,iqtisadi,xarici siyasət və digər dövlət prioritetlərinə nail olmaq üçün mühüm rol oynayır. Azərbaycan Respublikas ımüstəqillik qazandıqdan sonra nəqliyyatsistemiinkişafınınyenimərhələsinə qədəm qoymuşdur.Əsaslı struktur islahatlar tamamlanmışdır.Ölkə İqtisadiyyatı sürətli inkişafın növbəti mərhələsinə keçmiş, bazar iqtisadiyyatı şəraitində nəqliyyatın işinin hüquqi bazasının yaradılmasına,tələbə yönəlik,bazar iqtisadiyyatının tələblərini əks etdirən güclü fəaliyyətlərə üz tutmağa səbəb olmuşdur.

İşğaldan azad olunmuş torpaqlarda, dağıntıların hərtərəfli və böyük miqyaslı olması azad edilmiş ərazilərin bərpası prosesini mürəkkəb və zaman alan prosesə çevirir. Bunları nəzərə alaraq İkinci Qarabağ müharibəsi bitdikdən dərhal sonra azad edilmiş ərazilərdə “Böyük Qayıdış” proqramı əsasında bərpa prosesi başlandı.

Dövlətin siyasətinə əsaslanaraq Azərbaycanda nəqliyyat, bütövlükdə ölkənin başqa iqtisadi sektorları ilə yanaşı ictimai ehtiyacların ödənilməsi və bundan başqa ölkənin tələblərinə xidmət etmək baxımından əhəmiyyətli sahədir. Nəqliyyat sisteminə daxil olan çeşidli nəqliyyat növləri fərqlənsələr də Azərbaycanın nəqliyyat sektoru nəqliyyatın davamlı inkişaf etməsi iqtisadi bütövlüyün, xidmətlərin sərbəst şəkildə mübadiləsinin, iqtisadi fəaliyyətdə sərbəstliyin, eyni zamanda rəqabətin və həyat şəraitinin yüksəlməsinin təminatıdır.

Malların mübadiləsinin və istehsalının prosesinin düzgün formalaşdırılması məhz nəqliyyat köməyi ilə təmin edilir. Material axınlarının yaranma mənbəyindən istehlak yerlərinə kimi hərəkəti logistik əməliyyatların böyük hissəsi məhz müxtəlif nəqliyyat üsullarının iştirakı ilə həyata keçirilir. Bu baxımdan nəqliyyatın funksional sahələri arasında asılı rol oynayır. Məhsulların logistik dövrənin mərhələlərinə ötürülməsi, yəni prosesin ahəngdar təşkili, logistik yük vahidlərinin cəld ötüb keçməsi, istehsal ehtiyatların tələb olunan dərəcədə saxlanılması nəqliyyat ilə sıx bağlıdır. Yüklərin nəql edilməsindən asılı olan proseslərə logistikanın tətbiq edilməsi nəticəsində əldə edilən pozitiv irəliləyişlər son zamanlarda respublikamızda bazar tələbləri baxımından reallaşdırılan əsaslı struktur siyasəti nəticəsində möhkəmlənir. Azərbaycan Respublikasında nəqliyyat sisteminin inkişaf etməsi böyük əhəmiyyət kəsb edir. Tənzimləyici və təşkilati fəaliyyətlərin bölgüsü ilə yanaşı inzibati idarəetmə şəraitindən bazar şəraitində tənzimlənmə sisteminə keçirilmiş, nəqliyyat fəaliyyətinin hüquqi əsası yaradılmışdır.

## 1. Azərbaycanda müasir nəqliyyat sisteminin təhlili

Bərpa prosesinin həyata keçirilməsi üçün 2021-ci ilin büdcəsində ilkin olaraq 2.2 milyard dollar vəsaitin ayrılması nəzərdə tutulur. Bərpa prosesi bir neçə mərhələdə həyata keçiriləcəkdir. Birinci mərhələdə büdcədən ayrılan vəsaitlər əsas iki məqsəd üçün,infrastrukturun formalaşdırılmasına və kommunal xidmətlərin əlçatanlığının təmin edilməsinə yönəldiləcəkdir. Növbəti mərhələdə isə özəl və xarici investisiyanın cəlb edilməsinə daha çox yer ayrılacaqdır.

Ölkəmizin ərazi bütövlüyü təmin olunduqdan sonra Naxçıvan Muxtar Respublikası ilə nəqliyyat-kommunikasiya xətlərinin bərpası və bu istiqamətdə tranzit daşımaların həyata keçirilməsi üçün

perspektiv imkanlar yaranmışdır. İşğaldan azad edilmiş ərazilərdə dayanıqlı məskunlaşma, iqtisadi fəaliyyətin canlanması və nəqliyyat-logistika imkanlarından istifadə regional iqtisadi-ticarət əlaqələrini genişləndirəcəkdir.

Nəzərdə tutulan strateji istiqamətlərin uğurla həyata keçirilməsi üçün bölgədə logistika, ticarət və digər xidmətlərin göstərilməsi, həmçinin qabaqcıl texnologiyalara və "yaşıl enerji" konsepsiyasına əsaslanan rəqabətqabiliyyətli və innovativ sənaye sahələrinin, o cümlədən tikinti materialları istehsalının dəstəklənməsi olduqca mühümdür (Şəkərəliyev, 2016: 87).

Hazırda Azərbaycanın nəqliyyat dəhlizi başlıca olaraq ticarət tərəfdaşı ölkələr arasında əlaqələrin genişlənməsinə xidmət edir. Bununla belə nəqliyyat-tranzit sistemində yükdaşımada avtomobil, dəmir yolu və dəniz nəqliyyatı iştirak etsə də, TRASECA-nın Azərbaycan bölməsindəki tranzit yükdaşımalarda avtomobil nəqliyyatının statistikası verilməmişdir. Bu dəhliz üzrə yükdaşımada dəmir yolu geniş paya malikdir ki, bu da yeni xətlərin istifadəyə verilməsi ilə bağlıdır. (Azərbaycan Respublikasında nəqliyyat sisteminin inkisafına dair (2006–2015-cu illər) Dövlət Proqramı)

**Cədvəl 1: Avropa-Qafqaz-Asiya nəqliyyat dəhlizində nəqliyyatın fəaliyyəti (Azərbaycan hissəsində)**




**Mənbə:** DSK-nin məlumatları əsasında müəllif tərəfindən tərtib olunmuşdur**.**

İşğaldan azad olunmuş Şərqi Zəngəzur iqtisadi rayonunun Arazboyu ərazisinin əsasən düzənlik relyefə və həmin bölgənin cənub istiqamətində giriş qapısı mövqeyinə malik olması sənaye parkının yaradılması üçün əlverişli şəraiti təmin edir (geostrategiya.az). Şərqi Zəngəzur iqtisadi rayonunun cənubunda - Cəbrayıl rayonu ərazisində yerləşən tarixi Xudafərin körpülərinin olduğu istiqamətdə sərhəd-gömrük keçid məntəqəsinin açılması da sənaye parkının fəaliyyətə başlaması ilə daha səmərəli olar. Eyni zamanda, Cəbrayıl rayonunda logistika mərkəzinin, müxtəlif xidmət və innovativ sənaye sahələrinin, o cümlədən tikinti materialları istehsalı müəssisələrinin yaradılması işğaldan azad edilmiş digər rayonların da bərpasında faydalı olacaqdır (11).

Nəqliyyat xidməti göstərən müəssisələr üçün əsas problemlərdən biri də əməkdaşlarda profesionallığın aşağı olmasıdır ki, bu da təcrübəli sürücülərin MDB ölkələrinə miqrasiya etmələri ilə bağlıdır. İşçilərin profesionallığı ilə yanaşı, müəssisələrin texniki göstəriciləri (nəqliyyat kommunikasiyası üzrə biliklər, infrasdstruktur, əlavə dəyər yaratmaq imkanları və s) nəqliyyat xidməti göstərən müəssisələr üçün problem olaraq qalır. Xidmətlər bazarında kommunikasiya imkanları qənaətbəxş vəziyyətdə deyil və neqativ olaraq qalmaqdadır (Bağırov, 2019: 46).

**Cədvəl 2: Nəqliyyat xidmətinin strategiyası**




**Mənbə:** Osmanlı A.E., "Nəqliyyat sisteminin optimal idarə edilməsi məsələləri dissertasiyası.

2020-ci ilin fevral ayında təsdiq edilmiş "Azərbaycan 2030: sosial-iqtisadi inkişafa dair Milli Prioritetlər" sənədində "işğaldan azad olunmuş ərazilərə böyük qayıdış" beş prioritetdən biri kimi müəyyən edilmişdir. Sənəddə bu prioritetin uğurla reallaşdırılması üçün iki məqsəd müəyyən edilmişdir: *dayanıqlı məskunlaşma* və *iqtisadi fəaliyyətə reinteqrasiya.* Bu məqsədlərin həyata keçirilməsi ilə regionun iqtisadi potensialından səmərəli istifadə olunmaqla, əhalinin məskunlaşma səviyyəsinin işğaldan əvvəlki səviyyəyə çatdırılması təmin edilməli və azad edilmiş ərazilərin ölkə üzrə iqtisadi fəaliyyətdə payı işğaldan əvvəlki vəziyyətə çatdırılmalı və daha sonra artırılmalıdır (Azərbaycan 2030: sosial-iqtisadi inkişafa dair Milli Prioritetlər). Ona görə də deyə bilərik ki, azad edilmiş ərazilərin bərpası təkcə Qarabağ regionunun deyil, bütünlükdə Azərbaycan iqtisadiyyatının inkişafı baxımından da böyük əhəmiyyət daşıyır (12).

Bərpa prosesinin hansı formada həyata keçirilməsini müəyyən etmək üçün nəqliyyat, enerji, şəhərsalma və digər istiqamətlər üzrə həyata keçirilən layihələri və qarşıya qoyulan məqsədləri nəzərdən keçirək.

Nəqliyyatındayanıqlıinkişafının baza prinsiplərinə əsasən nəqliyyat ehtiyaclarının ödənilməsi məsələlərinin həlli vətəndaşların sağlamlığı və ətraf mühitin qorunması prioritetləri ilə ziddiyyət təşkil etmir və gələcək nəsillərin maraqlarınatoxunmur. (Avtomobil yolları haqqında Azərbaycan Respublikasının Qanunu, 2000)

## 2. Azərbaycanda nəqliyyat sisteminin inkşaf yolları

İşğaldan azad olunmuş ərazilərin yenidən qurulması istiqamətində atılan ilk addımlar avtomobil yolların çəkilməsi oldu. Qarabağın dirçəlişinə aparan "Böyük Qayıdış" proqramının birinci mərhələsi məhz işğal olunmuş ərazilərdə yeni yol-nəqliyyat infrastrukturunun yaradılmasıdır. İcra edilən nəqliyyat layihələri Şimal, Cənub və Şərq istiqamətindən Qarabağa hərəkət etmək imkanı yaradacaqdır. Həyata keçirilən və ya həyata keçirilməsi planlaşdırılan avtomobil, dəmiryolu və hava limanı layihələrini ayrı-ayrılıqda nəzərdən keçirək:

*Suqovuşan və Talış avtomobil yolu.* Həyata keçirilməsinə başlanılan ilk layihələrdən biri Tərtər rayonunun Suqovuşan və Talış kəndlərinə gedən avtomobil yollarının yenidən qurulması oldu. Hələ döyüşlərin davam etdiyi dövrdə bu yolların çəkilişinə başlanıldı. Bu yolun Tərtər şəhərindən Suqovuşan kəndinə qədər olan hissəsi 21 km, Suqovuşandan Talış kəndinə doğru uzanan hissəsi isə 7,5 km-dir. 2 geniş hərəkət zolağından ibarət olacaq yolun asfalt-beton örtüyünün eni 9 metr təşkil edir və artıq bu yollar 2-ci texniki dərəcəyə uyğun olaraq 1-ci mərhələ üzrə bərpa edilib. Növbəti mərhələdə isə Çaylı

kəndindən Talış kəndinə qədər uzunluğu 8 kilometr olan yolun, həmçinin Talış kəndindən Naftalan şəhərinə doğru 22 kilometr uzunluğa malik yeni yolun inşası da planlaşdırılır. Qeyd edilən avtomobil yollarının birləşdirilməsi nəticəsində Tərtər şəhəri ilə yanaşı, alternativ olaraq Naftalan şəhərindən də Talış və Suqovuşan istiqamətində hərəkət etmək mümkün olacaqdır.

*Əhmədbəyli-Füzuli-Şuşa avtomobil yolu.* Digər böyük əhəmiyyətə malik olan avtomobil yolu isə Əhmədbəyli-Füzuli-Şuşa avtomobil yoludur. 2020-ci ilin noyabrın 17-də Əhmədbəyli-Füzuli-Şuşa avtomobil yolunun layihələndirilməsi və tikintisi ilə bağlı tədbirlər haqqında sərəncam imzalanmışdır və sərəncama əsasən Prezidentin ehtiyat fondundan Avtomobil Yolları Dövlət Agentliyinə ilkin olaraq 50 milyon manat ayrılmışdır. Yolun ümumi uzunluğu 101.5 km, eni isə 37.7 metr olacaqdır və ən gec 2022-ci ildə hazır olacağı gözlənilir. Bu yolu Füzulidə tikiləcək yeni hava limanı ilə əlaqələndirmək məqsədi ilə isə yolun 27-ci km-ində yol qovşağının və hava limanına giriş yolunun inşası da nəzərdə tutulur.

Bu yolun simvolik məna daşıyan hissəsi Füzuli-Şuşa avtomobil yoludur. Bu yol Topxana meşələrinin ətəyindən keçməklə Daşaltı kəndinə, oradan isə Şuşa şəhərinə çəkiləcəkdir. Bu yoldan İsa bulağına da yol çəkiləcəkdir və yolun dördzolaqlı, bəzi yerlərdə altızolaqlı olacağı gözlənilir. Füzuli-Şuşa yolu əsgərlərimizin Qarabağın mərkəzinə, xüsusilə də Şuşaya doğru irəlilədikləri yoldur. Ona görə də ölkə başçısı bu yolu "Qələbə Yolu" adlandırmışdır.

*Toğanalı - Kəlbəcər avtomobil yolu.* Şimal istiqamətində isə Toğanalı-Kəlbəcər avtomobil yolunun çəkilməsi nəzərdə tutulur. Bu yol Göygöl rayonunun Toğanalı kəndindən başlayaraq, Murov dağı silsiləsindən keçərək, Kəlbəcər, İstisu və Laçın istiqamətində davam edəcəkdir. Yolun ümumi uzunluğu təxminən 190 km-ə yaxındır. Toğanalı-Kəlbəcər istiqamətində olan hissəsi 74 km, Kəlbəcər-İstisu istiqamətində 28 km, Kəlbəcər-Laçın istiqamətinə isə 87 km təşkil edir. Yol iki, bəzi hissələrdə üç zolaqlı olacaqdır (Həşimova, 2018: 39).

Layihənin 16 kilometrliyindən Murov dağı silsiləsi başlanır və bundan sonra yolun keçəcəyi bəzi ərazilərdə yüksəklik 3500 metrə qədər çatır. Bu isə qış aylarında bu yoldan istifadəni çətinləşdirəcəkdir. Bu problemin qarşısını almaq üçün tunellərin tikintisi nəzərdə tutulur. Tikiləcək tunellərin ümumi uzunluğu təxminən 10-12 km olacaqdır. Tunellərdə hərəkət zolaqlarının sayının 4-ə qədər artırılması planlaşdırılır.

Qeyd edilən avtomobil yolları ilə yanaşı eyni zamanda Horadizdən Zəngilana, oradan Qubadlıya və Laçın rayonuna qədər avtomobil yolunun çəkilişi ilə bağlı da göstəriş verilib və bu istiqamətlərdə hazırlıq işləri başlayıb. Beləliklə qeyd edilən avtomobil yollarının çəkilişi nəticəsində həm şimaldan, həm də cənubdan Laçın və Kəlbəcər rayonlarına aparan müasir yol-nəqliyyat infrastrukturu yaradılacaqdır.

*Dəmiryolları.* Avtomobil yolları ilə yanaşı bərpa prosesində dəmiryollarının da çəkilməsi və yenidən qurulması nəzərdə tutulub. Belə dəmir yollarından biri *Bərdə-Ağdam dəmiryoludur* və şərq istiqamətindən Qarabağa hərəkət etməyə imkan yaradır. Bərdə-Ağdam dəmir yolu xətti işğaldan əvvəl istifadə edilmiş və 104 km uzunluğunda olan Yevlax-Xankəndi dəmir yolunun bir hissəsidir. Hazırda həmin yolun Bərdədən başlayaraq Ağdama qədər uzanan 45 kilometrlik hissəsi yenidən tikilir. Dəmir yolu xəttinin layihələndirmə və tikinti işlərinin iki mərhələdə həyata keçirilməsi nəzərdə tutulur. İlkin mərhələdə Bərdə-Təzəkənd istiqamətində 19 kilometr, ikinci mərhələdə isə Təzəkənd-Ağdam istiqamətində 26 km-lik dəmiryolu yolu bərpa ediləcəkdir. Bu yolun tikintisi üçün artıq dövlət tərəfindən ilkin olaraq 5 milyon manat ayrılıb.

Eyni zamanda işğaldan azad olunmuş ərazilərdə *Horadiz-Füzuli* və *Füzuli-Şuşa dəmir yolu* xəttləri də inşa olunacaqdır. Şuşanın Qarabağda əsas turizm və mədəniyyət mərkəzlərindən birinə çevrilməsi nəzərdə tutulduğundan avtomobil yolu ilə yanaşı Şuşaya dəmiryolu xətti də çəkiləcəkdir. Digər nəzərdə tutulan dəmir yolu layihəsi isə *Horadiz-Ağbənd* dəmir yolunun yenidən tikilməsidir. Bu yol Ermənistan ərazisindən keçməklə Naxçıvana gedən Zəngəzur dəhlizinin əsas komponentlərindən biridir.

*Hava limanları.* İşğaldan azad edilmiş ərazilərin sürətli inkişafının təmin edilməsi və turizm potensialının tam olaraq reallaşdırılması üçün hava limanlarının da tikintisi nəzərdə tutulur. İlk hava limanı layihəsi *Beynəlxalq Füzuli Hava Limanının* layihəsidir. Yeni hava limanı beynəlxalq standartlara uyğun infrastrukturla təchiz edilib. Limanın uçuş-enmə zolağının uzunluğu 2800 metrdir. Yeni hava

limanının əsas məqsədi xarici qonaqların və turistlərin azad edilmiş ərazilərə, xüsusilə də Şuşaya gəlişini təmin etməkdir. Xarici qonaqlar Füzuli Beynəlxalq Hava Limanına gələrək, çox rahat və qısa müddət ərzində tikintisi həyata keçirilən Füzuli-Şuşa avtomobil yolu vasitəsilə Şuşa şəhərinə gedə biləcəklər. Eyni zamanda azad edilmiş ərazilərdə daha iki hava limanın tikintisi nəzərdə tutulmuşdur. Bu limanlar Zəngilan və Laçın rayonlarının ərazisində inşa ediləcəkdir. Hazırda limanlar üçün uyğun ərazinin seçilməsi həyata keçirilir.

Eyni zamanda azad edilmiş ərazilərdə mövcud olmuş Su Elektrik Stansiyalarının (SES) da bərpası və yenidən qurulması həyata keçirilir. Müharibə dövründə Ermənilər azad olunan ərazilərində mövcud olan kiçik su elektrik stansiyalarını darmadağın edərək yararlı avadanlıqlarını söküb aparıb, apara bilmədiklərini yandırıb və ya partladıblar. Nəticədə azad edilmiş ərazilərdə olan SES-lər yararsız vəziyyətə düşmüşdür. Ona görə də həmin stansiyaların bərpası həyata keçirilir.

**Nəticə**

Nəqliyyatin ifrastrukturunun inkişafı büdcə vəsaitlərindən və digər vəsaitlərdən istifadə etməklə bərabər, şəxsi investorların cəlb edilməsini genişləndirməyi nəzərdə tutur.

Onun istismarına özəl investorları cəlb etməklə, infrastrukturun kommersiyalaşdırılması və idarəedilməsini gözdən qaçırmamaq zəruridir. Həmçinin dövlət siyasətinə müvafiq olaraq bir sıra nəqliyyat infrastrukturunun tədricən özəlləşdirilməsi də mühim xarakterdaşıyır.

Aparılan tədqiqat göstərir ki, ümumilikdə rəqabət qabiliyyətini müəyyən edən əsas amillər qiymət, həcm və rentabellik səviyyəsidir. Eyni zamanda ölkədə nəqliyyat-tranzit sektorunun rəqabət qabiliyyəti rəqabət qabiliyyətli müəssisələrin bu sektorda nə vaxtdan fəaliyyət göstərməsindən və xidmətlər bazarında rəqabətin intensivliyindən asılıdır. Rəqabət qabiliyyətliliyi isə rəqabət vasitələrini, müəssisənin xüsusiyyəti və bazarda rəqabət üstünlüyündən istifadə etmək imkanlarını əhatə edir.

MDB və Avropa ölkələrinin nəqliyyat xidmətləri ilə müqayisədə Azərbaycanın nəqliyyat-tranzit sahəsində xidmət göstərən müəssisələr elə də böyük rəqabət aparmaq imkanlarına malik deyildir. Bu, rəqabət qabiliyyətini müəyyən edən amillərin kifayət qədər zəif inkişaf etməsi ilə əlaqədardır. Tədqiqatın nəticələrinə və beynəlxalq təcrübəyə əsaslanmaqla həm rəqabət qabiliyyətli nəqliyyat-tranzit sektorunun formalaşdırılması və həm də beynəlxalq xidmətlər bazarında rəqabət üstünlüyünün qorunması üçün aşağıdakı tədbirlərin həyata keçirilməsini məqsədə uyğun hesab edirik:

- Nəqliyyat məsrəflərinin azaldılması və sektorun rəqabət qabiliyyətliliyini artırmaq üçün regional logistik mərkəzlərin yaradılması;
- Ölkə ərazisindən tranzit konteyner daşımalarını inkişaf etdirmək, bu məqsədlə dəmir yolu tariflərinin beynəlxalq standartlara uyğunlaşdırılması;
- Nəqliyyat sektorunun rəqabət qabiliyyətliliyini artırmaq üçün innovasiyaların tətbiqini və klasterlərin yaranmasının stimullaşdırılması;
- Nəqliyyat növlərindən asılı olaraq yük daşıma qiymətlərinin (tranzit və yerli) Tarif Şurası tərəfindən tənzimlənməsi;
- Maliyyə institutlarının nəqliyyat kompleksinə kapital qoyuluşlarını artırmağa stimulların verilməsi;
- Nəqliyyat sektorunda kiçik və orta sahibkarlığın inkişafının dəstəklənməsi.
- Tranzit və əlavə nəqliyyat xidmətləri göstərən müəssisələrdə infrastrukturun yeniləşməsinə dəstək;
- Liman ərazisində azad iqtisadi zonaların yaradılması və bu ərazilərdə nəqliyyat xidmətlərinin inkişafına dövlət dəstəyinin artırılması.
- Nəqliyyat-tranzit fəaliyyətini tənzimləyən qanunvericilik bazasının təkmilləşdirilməsi.

Dəyişən şərtlər nəqliyyat sisteminin inkişafı üçün əsas istiqamətlərin müəyyən olunmasınıvə nəqliyyatın inkişafı sahəsində dövlət tərəfindən müəyyən olunan vəzifələrin müəyyənləşdirilməsini zəruriedir.

Nəqliyyatsisteminədaxilolanmüxtəlifnəqliyyatnövləribir-birindənfərqlənsələrdə, dövlətnəqliyyata makrosəviyyədə vahid idarəetmə obyekti kimi baxır. Nəqliyyatdan müxtəlif növləri arasında rəqabəti deyil, nəqliyyat xidmətlərindən istifadə edənlərə tamamlayıcı, qarşılıqlı, müxtəlif yönlü xidmətləri təmin edən vahid kompleksə çevirməyi tələb edir. Dövlət tənzimləmə işlərində əməkdaşılıq edərək müxtəlif nəqliyyat növlərinin inkişafınadəstək göstərir.

**Ədəbiyyat**

1. Azərbaycan Respublikasında informasiya cəmiyyətinin inkişafına dair Milli Strategiyanın həyata keçirilməsi üzrə 2016-2020-ci illər üçün Dövlət Proqramı”
2. Avtomobil yolları haqqında Azərbaycan Respublikasının Qanunu. Bakı: Nurlan, 2000
3. Azərbaycan 2030: sosial-iqtisadi inkişafa dair Milli Prioritetlər. AR Prezidentinin Sərəncamı// 12 fevral 2021
4. Azərbaycan Respublikasında nəqliyyat sisteminin inkisafına dair (2006‒2015-cu Illər) Dövlət Proqramı
5. Bağırov, F. (2009), “Ölkənin sosial-iqtisadi inkişafında nəqliyyatın rolunun yüksəldilməsi istiqamətləri” Bakı, 364 səh.
6. Əliyev, E.Ə. (2004), Nəqliyyat hüququnun əsasları. Bakı, «Hüquq ədəbiyyatı» nəşriyyatı,
7. Həşimova, A.Ç. (2018), Rabitə xidmətləri bazarının dövlət tənzimlənməsi problemləri, Beynəlxalq elmi və praktiki konfrans, - Bakı: səh.60-63
8. Həşimova, A.Ç. (2018), Rabitə xidmətləri bazarının dövlət tənzimlənməsi problemləri, Beynəlxalq elmi və praktiki konfrans, - Bakı: səh.60-63
9. https://aircenter.az/uploads/files/orxan%20tehlil%20mart.pdf?fbclid=IwAR0vC980vM4fPLHRgrSz3g5S9O1oavvI-7uIkPNJjtaWHaocTaeYUSK3yfc
10. https://president.az/articles/53319/print
11. Qafarov, Z., Əliyev E. (2002) “Müasir beynəlxalq nəqliyyat hüququnun Azərbaycan Respublikasında tətbiqi” Bakı: Elm
12. Şəkərəliyev, A. (2016), “Azərbaycanın iqtisadiyyatı: reallıqlar və perspektivlər” / A.Şəkərəliyev, Q.Şəkərəliyev – Bakı, 365 səh.

**Rəyçi: i.ü.f.d. Samirə Abbasova**

Göndərilib: 29.02.2022 Qəbul edilib: 31.03.2022

DOI: https://www.doi.org/10.36719/2663-4619/78/163-168

**Rufi Vidadi oğlu Lələyev**
Azərbaycan Dövlət İqtisad Universiteti (UNEC)
magistrant
Irufi@mail.ru

# AZƏRBAYCANIN İŞĞALDAN AZAD OLUNMUŞ RAYONLARINDA SƏNAYENİN VƏ ONUN STRUKTURUNUN FORMALAŞDIRILMASI

**Xülasə**

Məqalənin vəzifəsi Azərbaycanın işğaldan azad edilmiş rayonlarında sənayenin formalaşmasını təhlil etməkdir. Tədqiqatlar bu regionlarda sənayenin ümumi vəziyyətinə və inkişaf səviyyəsinə diqqət yetirməlidir. Bu prosesə təsir edən əsas amillər araşdırılmalıdır. Nəticədə bəzi addımlar arasında müqayisələr aparılır və müvafiq qurumlar və ya dövlət tərəfindən həyata keçirilə biləcək gələcək fəaliyyətlər, mümkün məhdudiyyətlər və risklər üçün tövsiyələr verilir. Araşdırmanın əsas nəticələri müəyyən edilmişdir.İlk növbədə müəyyən edilmişdir ki, bu regionlarda sənayenin inkişaf səviyyəsi kifayət qədər yüksəkdir və sənaye ölkələri ilə müqayisə edilir. İstehsal üçün xammal və gələcək artım üçün ehtiyatlar mövcuddur. Yeni zavodların təşkili və tikintisi prosesinə başlanılıb. Çox erkən mərhələdə belə qənaətə gəlinir ki, gələcəkdə Azərbaycanda bu prosesin hər kəs şahidi ola bilər.İkincisi, belə qənaətə gəlinir ki, Azərbaycanın işğaldan azad edilmiş rayonlarında sənayenin inkişafının əsas amili onun texnoloji yeniliklərlə sıx bağlı olmasıdır. Sənayenin inkişaf səviyyəsini yüksəltmək üçün ölkədə texnoloji infrastrukturu inkişaf etdirmək lazımdır. Qeyd edək ki, bu proses artıq başlayıb və hələ də davam edir. Bu məqalə Azərbaycanda sənaye inkişafı layihələrinin yaradılmasında faydalı olacaq. Bu, gələcəkdə belə layihələrin həyata keçirilməsi üçün zəruri olan nəzəri və praktiki biliklər verəcəkdir.

***Açar sözlər*** : *sənaye, resurs, azad olunmuş ərazilər, quruculuq, hasilat*

**Rufi Vidadi Laleyev**

## Formation of industry and its structure in the occupyed regions of Azerbaijan

**Abstract**

The task of the article is to analyze the formation of industry in the liberated regions of Azerbaijan. Research should focus on the general state of industry and the level of development in these regions. The main factors influencing this process should be investigated. As a result, comparisons are made between some of the steps and recommendations are made for future activities, possible constraints and risks that may be undertaken by the relevant authorities or the state. The main results of the study have been identified. First of all, it was determined that the level of industrial development in these regions is quite high and comparable to industrialized countries. There are raw materials for production and reserves for future growth. The process of organizing and constructing new plants has begun. At a very early stage, it is concluded that in the future everyone can witness this process in Azerbaijan. Secondly, it is concluded that the main factor in the development of industry in the liberated regions of Azerbaijan is its close connection with technological innovation. In order to increase the level of industrial development, it is necessary to develop the technological infrastructure in the country. Note that this process has already begun and is still ongoing. This article will be useful in creating industrial development projects in Azerbaijan. This will provide the theoretical and practical knowledge necessary for the implementation of such projects in the future.

***Key words*****:** *industry, resource, liberated territories, construction, extraction*

## Giriş

İstənilən regionda iqtisadi fəaliyyət növləri arasında sənaye xüsusi yer tutur. Regionların magistral sənaye müəssisələrinin inkişafı layihələri onların istehsal ixtisaslaşmasının formalaşmasında həlledici rol oynayır. Deməli, regionların inkişafında layihə idarəetməsinə keçid əksər hallarda sənayedə müvafiq tədbirlərin həyata keçirilməsi deməkdir.

Məqalədə sənaye layihələri ilə bağlı məlumat verilir, həyata keçirilmə məqsədindən və əhəmiyyətindən asılı olaraq onların həyata keçirilməsi şərtləri göstərilir. İşğaldan azad olunan bölgələrdə sənaye mərkəzlərinin inkişafında sənaye layihələrin yeri göstərilir. Aşağıdakı vəzifələrin həlli yolları nəzərdən keçirilir: regionlarda sənayenin inkişaf meyllərinin və qanunauyğunluqlarının müəyyən edilməsi; ölkənin regionlarında sənayenin inkişafı layihələri üçün əsas tələblərin müəyyən edilməsi; işğaldan azad olunmuş ərazilərdə bu sənayenin inkişafı üçün mövcud layihələr paketinin ekspertizası; respublikanın sənayesində strateji layihələrə dair təkliflər. Ənənəvi sənaye yerləşdirmə zonasından kənarda həyata keçirilən layihələr və ölkə üçün yeni fəaliyyət növləri üçün güzəştlərin genişləndirilməsi təklif olunur.

Bu regionlarda sənayenin inkişaf səviyyəsi sənayeləşmiş regionların müqayisəli səviyyəsinə yaxındır. Bunu istehsal üçün tanınmış xammal, gələcək artım üçün ehtiyatlar və texnoloji innovasiyalarla sıx əlaqə də daxil olmaqla bir neçə faktorla izah etmək olar. Sənayenin gələcək inkişafını davam etdirmək və Azərbaycan iqtisadiyyatı üçün rəqabətqabiliyyətli mövqe yaratmaq üçün sənayedə elmi-tədqiqat mərkəzlərinin inkişaf etdirilməsi və gələcək kadr hazırlığının təmin edilməsi zəruri olacaqdır. İstehsal üçün daha əlverişli mühitin yaradılması, yeni müəssisələrin sayının artırılması, xarici tərəfdaşlarla əlaqələrin inkişaf etdirilməsi vacibdir. İqtisadiyyatı xarici şoklardan qorumaq üçün sənayenin inkişafı üçün alternativ yollar tapmaq lazımdır (Daşsalahlı, 2021: s.2).

Sənayeləşmənin əsas məqsədi həyat keyfiyyətinin yaxşılaşdırılması və məşğulluq imkanlarının artırılması, habelə işsizlik səviyyəsinin azaldılmasıdır. Hökumət Azərbaycanda işsizliyin azaldılması üçün bir sıra tədbirlər həyata keçirir. Azərbaycanda sənayeləşmənin formalaşması üçün əsas amillər aşağıdakılardır:

1. Birinci amil Azərbaycanda mövcud olan infrastrukturdur. Azərbaycanda böyük həcmdə xammal, o cümlədən mis, qızıl, neft və qaz, eləcə də digər ehtiyatlar var. Xammal və ehtiyatların mövcudluğu ölkədə sənayeni sürətlə inkişaf etdirməyə imkan verir.
2. Sənayeləşməni şərtləndirən digər amil bu illər ərzində artmış işçi qüvvəsidir.
3. Azərbaycanda sənayenin inkişafında digər mühüm amil xarici investorların marağıdır.
4. Sənayeləşməni şərtləndirən digər amillər zəngin təbii ehtiyatlar və güclü iqtisadiyyatı təmin etmək istəyidir. Dövlət böyük infrastrukturun inkişafı proqramı yaratmaqla işsizliyi azaltmaq üçün addımlar atmaqdadır.

Sənayeləşmə Azərbaycan iqtisadiyyatının ən mühüm məsələlərindən biridir, lakin o, ilk göründüyündən daha mürəkkəbdir. Sənayeləşmənin iki müxtəlif formasını müşahidə etmək olar: biri xarici yardıma əsaslanan və digəri daxili istehsal prosesləri vasitəsilə iqtisadi artıma əsaslanan.

Həyat keyfiyyətinin yaxşılaşdırılması və işsizliyin azaldılması üçün Azərbaycanda sənayeni inkişaf etdirmək lazımdır. Sənayeləşmənin əsas məqsədi məşğulluq imkanlarını artırmaq, işsizliyi azaltmaq və insanların həyatını yaxşılaşdırmaqdır. Sənaye Azərbaycanda bir çox iqtisadi, sosial və mədəni problemləri həll edir. Azərbaycanda sənayeləşmə iki fərqli sənaye növünə əsaslanır. Biri xarici investisiyaya əsaslanan sənaye, digəri isə yerli istehsal proseslərinə əsaslanır. Azərbaycanın işğaldan azad olunan bölgələrində maddi-texniki və işçi qüvvəsinin çatışmazlığı bu məsələnin həlli üçün təsirli tədbirlərin görülməsini tələb edəcəkdir (Abdulla 2021: s.10).

Azərbaycanda sənayeləşmə xarici investorların maraqlarını dövlət maraqları ilə birləşdirən mürəkkəb prosesdir. Sənayeləşmə əhəmiyyətli resurs və maliyyə resursları tələb edəcəkdir. Sənayeləşmə prosesi dövlətin xarici investorlara münasibətdə siyasətindən başlayır. Azərbaycanda sənayeləşmənin əsas addımları aşağıdakılardır (Məmmədova P., 2020: s.62-64):

1. Addım 1: İnkişaf prosesinin dövlət tərəfindən, o cümlədən irimiqyaslı layihələr və mühüm iqtisadi səmərə verən digər layihələr vasitəsilə sürətləndirilməsi.
2. Addım 2: Sənayeləşmənin bir səviyyəsindən digər səviyyəsinə keçid, o cümlədən yeni investisiya və inkişaf layihələri üçün strateji planlar, müxtəlif sektorlarda iri şirkətlərin yaradılması və xarici tərəfdaşlarla birgə müəssisələrin yaradılması.
3. 3-cü addım: İqtisadi inkişafın aydın strategiyasının həyata keçirilməsi və iqtisadi artımın təşviqi daxil olmaqla sənayeləşmənin bir səviyyəsindən digər səviyyəsinə keçid.

4. Addım 4: Yerli ehtiyaclara uyğun gələn regional inkişaf proqramlarına əsaslanan sənayeləşmə və ölkənin müxtəlif sahələrində istehsal proseslərinin icrasının monitorinqi və qiymətləndirilməsi sisteminin yaradılması.

Azərbaycanda sənayeləşməyə əsaslanan iqtisadiyyat var. Dövlət tərəfindən həyata keçirilən sənayeləşmə proqramının əsas məqsədi istehsal və emal sənayesini artırmaq, işsizliyi aradan qaldırmaq və həyat səviyyəsini yüksəltməkdir. Hökumətin inflyasiyanın cilovlanması, artımın sürətləndirilməsi və yoxsulluğun azaldılması istiqamətində göstərdiyi səylər nəticəsində son illər Azərbaycan mühüm iqtisadi uğurlar əldə edib. Ölkənin sənaye infrastrukturu hazırda külli miqdarda investisiya tələb edir. Azərbaycanda sənayeləşmə xarici investorların maraqlarını dövlət maraqları ilə birləşdirən mürəkkəb prosesdir. Qeyd etmək lazımdır ki, Azərbaycan sənayeləşmənin bir növündən digərinə mərhələli keçid prosesindədir.

Azərbaycanın işğaldan azad edilən bölgələri sənayeləşmə əhəmiyyətli resurs və maliyyə resursları tələb edəcəkdir. Ölkənin sənaye infrastrukturu hazırda infrastruktur, logistika, nəqliyyat və digər komponentlər kimi bir çox aspektləri özündə birləşdirən inkişaf planının bir hissəsi kimi böyük həcmdə investisiya tələb edir.

- Azərbaycanda sənayeləşmənin birinci mərhələsi infrastruktur layihələri üçün böyük həcmdə investisiya və maliyyə resursları tələb edəcəkdir. Bu layihələrə sənaye parkları, fabriklər, elektrik stansiyaları, boru kəmərləri və digər iri sənaye obyektləri daxildir. Bunların hamısı ölkənin aşağıdakı əsas elementlərə əsaslanan ümumi inkişaf planının bir hissəsidir:

- Azərbaycanda sənayeləşmənin ikinci mərhələsi inkişaf layihələri, o cümlədən başqa ölkədə bazar üçün mal və xidmətlər istehsal edən xarici şirkətlərlə çoxlu sayda birgə müəssisələrin yaradılması üçün əlavə investisiya və maliyyə vəsaiti tələb edəcəkdir.

Sənayenin davamlı inkişafı mexanizminin formalaşdırılması sənaye müəssisəsinin yerləşdiyi ərazinin ətraf mühit imkanları ilə sosial-iqtisadi sistemlərdə idarəetmənin konseptual əsaslarının işlənib hazırlanmasını tələb edir. Bunun üçün ərazinin təhlükəsiz və dayanıqlı inkişafı kimi konsepsiyanın tətbiqi məqsədəuyğundur. Ərazinin inkişafı təhlükəsizliyi dedikdə, ilk növbədə, bu ərazinin müstəqil inkişafına və antropogen təsir təhdidlərindən qorunmasına imkan verən müəyyən bir ərazidə təbii sərvətin optimal çıxarılması vəziyyəti başa düşülməlidir. Belə ki, tənzimləmənin sosial-iqtisadi aspektləri əsasında təbii sərvətlərin çıxarılması sisteminin qurulması həm də ərazinin davamlı inkişafını təmin edəcəkdir. Əgər təbii sərvətin yerləşdiyi ərazinin inkişafının davamlılığı əhalinin tələbatını ödəmək və təkcə bu ərazidə deyil, həm də gəlir əldə etmək imkanlarının artımının qorunub saxlanması kimi başa düşülürsə, optimallıq ola bilər. təbii sərvətdən istifadənin dəyişdirilməsi, faydalı fəaliyyət texnologiyasının əmsalının artırılması və idarəetmənin keyfiyyətinin yüksəldilməsi yolu ilə əldə edilə bilər. Sosial-iqtisadi optimallığın müəyyən edilməsi ətraf mühitin vəziyyəti və təkrar istehsalı, onun qanunları ilə əlaqəsi nəzərə alınmaqla, pul ifadəsində ifadə olunan tələb və təklif balansı şəklində iqtisadi inkişafa nail olmağa imkan verəcək ki, bu da ətraf mühitin məhv edilməsi təhlükəsini nəzərə ala və onunla mütənasib əlaqələr qura bilər. Bu şəkildə qurulan müasir resursların idarə edilməsi mexanizmi ətraf mühitin imkanlarına, bilik iqtisadiyyatına (yeni texnologiyalar vasitəsilə əvəzetmə) və bazar vasitəsilə real ehtiyaclarla tənzimlənən sosial ehtiyaclara uyğun olmalıdır (Baxşəliyev, 2021: s.2-3).

Bu gün yüksək inkişaf etmiş ölkələrdə texnologiya, sosial-iqtisadi inkişaf, elm və texnologiya sahəsində dəyişikliklərin davamlı monitorinqi mexanizmi mövcuddur ki, bu da iqtisadiyyatın sektorlarının inkişafı üçün uzunmüddətli planlar hazırlamağa imkan verir. Bütövlükdə iqtisadiyyat və qlobal sosial-iqtisadi sistemlərə xas olan ümumi xüsusiyyətləri müəyyən etmək üçün:

– qlobal inteqrasiya nəticəsində müxtəlif ölkələrin inkişaf proseslərinin xarici iqtisadi və sosial şəraitdən asılılığının artması;

- resursların qıtlığı nəticəsində müəyyən edilmiş və resurslara qənaət prinsipləri əsasında onlardan istifadəni artıran və uzunmüddətli perspektivdə iqtisadi sistemin dayanıqlığını təmin edən yeni innovativ texnologiyaların axtarışını tələb edən problemlərin kəskinləşməsi;

– ilk növbədə işğaldan azad olunan bölgə sisteminin imkanları nəzərə alınmaqla, iqtisadi səmərə əldə etməyə yönəlmiş sosial-iqtisadi proseslərin optimal tənzimlənməsi prinsiplərinin işlənib hazırlanması zərurəti;

- idarəetmə qərarlarının hazırlanmasında onun tarazlığını pozmadan sistemin inkişafını tənzimləmə üsullarını, prinsiplərini, üsullarını və yollarını formalaşdırmağa imkan verən regional aspektin (ərazinin inkişafı xüsusiyyətlərinin) nəzərə alınması zərurəti.

– iri sənaye komplekslərinin inkişafı təsərrüfat subyektlərinin çevikliyinin və mobilliyinin artması nəzərə alınmaqla nəzərə alınmalıdır;

– sənaye obyektlərinin istehsal amillərinin məcmusunu təyin edərkən sənayenin iqtisadiyyatında mövcud innovativ dəyişikliklər səviyyəsində resursların bölüşdürülməsinin mümkünlüyü nəzərə alınmalıdır.

Beləliklə, innovativ texnologiyaların inkişafı elm və texnika sahəsində gələcək elmi tədqiqatlar üçün müasir istehsal bazasının formalaşmasına imkan verən yeni texnologiyaların inkişafına təkan verir. Nəticədə də, innovasiyalar elmi və texnoloji inkişafa töhfə verir və sosial-iqtisadi sistemlərdə təkamül dəyişikliklərinə təsir göstərir. Təbii ehtiyatların məhdud təbiətindən danışırıqsa, bilik kimi bir resurs məhdudiyyətsiz kimi xarakterizə edilə bilər və nəticədə yeni mənbələrin meydana gəlməsi ilə əvəzetmə imkanlarını nəzərə alaraq ehtiyatların təkrar istehsalını nəzərdən keçirə bilərik (Sarıyeva İ., 2020: s.10).Bununla belə, iqtisadiyyatın müxtəlif sahələrində innovativ imkanlardan səmərəli istifadə etmək üçün ilk növbədə, yeni biliklərin yaranması və qiymətləndirilməsi sahəsində proqnozlaşdırma metodologiyasından başlamaq lazımdır. Bu günə qədər ən təsirli proqnozlaşdırma metodologiyaları kəşfiyyat və normativdir. Bu metodologiyalar formalaşmada ehtiyatların təkrar istehsalının tənzimlənməsinin sosial-iqtisadi prinsipləri üzrə optimal həllərin və təkliflərin işlənib hazırlanmasında bir-birini tamamlayır.

Bölüşdürmə nəzəriyyəsində sənayedə innovativ imkanlarla təkrar istehsalın əlaqələndirilməsi əsasında iqtisadiyyatın və cəmiyyətin resurslara tələbatının müəyyən edilməsinin proqnoz səviyyəsinin qiymətləndirilməsinə yeni yanaşmanın formalaşdırılması təklif edilir.

Belə ki, təqdim olunan proqnoz əsasında ərazilərin sosial-iqtisadi inkişafı proqramı qurulmalı və davamlı iqtisadi inkişaf mexanizmi formalaşmalıdır. Eyni zamanda, biliklər iqtisadiyyatında baş verən innovativ dəyişikliklər nəticəsində yeni texnoloji və idarəetmə innovasiyalarının meydana çıxması ilə əlaqədar olaraq istehsal prosesində iştirak edən resurslar və onların əvəzediciləri arasında nisbətin həcmi zamanla dəyişməlidir.

Aşağıdakı cədvəldə azad olunmuş regionlar üzrə sənaye məhsulun, xidmətlərin dəyəri, işlərin hər rayon üzrə faktiki qiymətlərlə göstərilmişdir. 2015-ci ildən Kəlbəcər rayonu su təchizatı, onların tullantılarının təmizlənməsi, o cümlədən emalı üzrə fəaliyyətləri mövcuddur. Amma Kəlbəcərdə bu məbləğ təxminən 1475,4 min manata bərabər olub. Bundan başqa da Laçın ərazisi üzrə də emal sənayesinin fəalliyyətinə başlanılmışdır. Beləliklə, 2018- 2020-ci illər sənaye istehsalatı statistik məlumatlarda qeydinə əsasən 361,7 min manat, habelə geyim istehsalı üzrə 294,2 min manat olmuşdur. Bundan başqa, Qubadlı rayonunun su təchizatı və burdakı tullantılarının təmizlənməsi, sənaye emalı üzrə fəaliyyətləri olmuşdur. Həmin sənaye sahəsi üzrə ümumi gəlir 2015-ci ildə təxminən 4,1 min manat, 2017-ci ili üzrə isə 34,9min manata bərabər olmuşdur. Statistik məlumatlara əsasən də Zəngilan rayonunda 2015-2018 dövrü üzrə təxminən 4662 ədəd yataq ağları, o cümlədən 6926 ədəd qadınlara kostyum istehsal edilmişdir. Son olaraq da, Cəbrayılın 2015-2020 dövrü ərzində təxminən 8437,3 min kub metr su təmizləməsi, onun bölüşdürülməsi üzrə, 2015-2018 dövrdə isə təxminən 5842 ədəd yataq ağları, habelə 1460 ədəd yubka-şalvarlar istehsal edilmişdir. Ümumi nəticə olaraq burada daha çox su təchizatı, dərzi, geyim sahələri əsas istehsalata yönəlmişdir.

**Cədvəl 1:Regionlar üzrə sənaye məhsulunun (işlərin, xidmətlərin) dəyəri, faktiki qiymətlərlə, min manat )**

| | 2015 | 2016 | 2017 | 2018 | 2019* | 2020* |
|---|---|---|---|---|---|---|
| **Şərqi Zəngəzur iqtisadi rayonu** | 1205 | 1122 | 4442 | 2823 | 2991 | 2543 |
| Cəbrayıl rayonu | 556 | 560 | 3910 | 2171 | 2251 | 2050 |

| | | | | | | |
|---|---|---|---|---|---|---|
| Kəlbəcər rayonu | 274 | 251 | 225 | 253 | 248 | 224 |
| Qubadlı rayonu | 4 | - | 35 | - | - | - |
| Laçın rayonu | 320 | 253 | 214 | 376 | 492 | 268 |
| Zəngilan rayonu | 51 | 59 | 58 | 22 | - | - |
| **Qarabağ iqtisadi rayonu** | **44700** | **57148** | **85860** | **97485** | **125603** | **114680** |
| Ağcabədi rayonu | 9475 | 15202 | 29752 | 38438 | 62330 | 52357 |
| Ağdam rayonu | 6841 | 7111 | 12693 | 12609 | 13731 | 13105 |
| Bərdə rayonu | 11617 | 13156 | 14368 | 14301 | 19525 | 23946 |
| Füzuli rayonu | 10298 | 11726 | 17324 | 16494 | 19575 | 18225 |
| Xocalı rayonu | - | - | - | - | - | - |
| Xocavənd rayonu | 352 | 346 | 381 | 225 | 598 | 648 |
| Şuşa rayonu | 12 | 17 | 7 | 8 | 8 | 15 |
| Tərtər rayonu | 6105 | 9590 | 11334 | 15411 | 9836 | 6385 |

**Mənbə:**Azərbaycanın sənayesi,Azərbaycan Respublikasının Dövlət Statistika Komitəsi, https://www.stat.gov.az/source/industry/, 2022.

Ona görə də, işğaldan azad olunmuş rayonlarda davamlı inkişaf mexanizmi yaratmaqla iqtisadiyyatın sənaye sahələrinin artım potensialını müəyyən etmək mümkündür. Davamlı inkişaf dedikdə sənaye müəssisələrinin resurslarının birləşməsindən istifadədə tarazlıq başa düşülməlidir ki, bu da istifadə olunmamış ehtiyatların, müəyyən kateqoriyalı resurslardan istifadənin artması nəticəsində istehsalın artım potensialının müəyyən edilməsini, istehsalın optimallaşdırılmasını nəzərdə tutur. istehsalın səmərəliliyinin artırılmasına töhfə verən müəssisələrin mövcud texnoloji imkanları hesabına onların birləşməsi. Eyni zamanda, yaranan resurs potensialı iqtisadi sistemin resurslarının məcmusundan ibarət olacaq və tədqiqi iqtisadiyyatın sənaye sahələrinin dayanıqlı fəaliyyət göstərmə məqsədlərinə nail olmaq qabiliyyətini müəyyən edəcək bir obyekt olacaqdır. Bununla bağlı əldə edilən geriləmə konkret sənayenin mövcud istehsal vasitələrindən istifadə etmək, resursların çatışmazlığını müəyyən etmək, sənaye müəssisələrinin istehsalat, texnoloji və iş proseslərində ehtiyatları müəyyən etmək qabiliyyətini əks etdirəcəkdir. Deməli, resurs potensialı son məhsulun yaradılmasının əsasını təşkil edir və resurslardan istifadənin səmərəliliyi iqtisadiyyatın sahələrinin iqtisadi artımında özünü göstərir.

## Nəticə

Azərbaycanın işğaldan azad olunmuş rayonlarında sənayenin inkişafında, yeni sənaye istehsalı üçün müəssisələrin yaradılmasında və onların inkişafı üçün bir neçə fəaliyyət sahəsi müəyyən edilmişdir.Nəticədə də bu torpaqlarda nəzərdə tutulan inkişafın təmin edilməsi üçün aşağıdakı prosesin izlənilməsi məqsədəuyğun olacaq:

-Bu ərazilərdə əhalinin həyatı və təhlükəsizliyi üçün vacib olan şəraitin yaradılması üzrə tədbirlər izlənilməlidir və ərazilərin minaların böyük qismi təmizlənməlidir;

-Bu ildən etibarən işğaldan azad olunmuş rayonlarında sənayenin inkişafı potensialının müəyyən olunması tədbirlərinə başlanılmalı və qiymətləndirilməlidir;

-Bölgədə məskunlaşmanın səmərəli təşkili üzrə, kəndlərin və şəhərlərin bərpasına sistemli yanaşmalar müəyyən edilməlidir;

- Tarix boyu toplanan sənaye təcrübəsinin qorunub saxlanılması ilə mövcud sənaye xammalından ölkədə səmərəli istifadə olunması, hazır məhsulların dünya bazarına çıxışının təmin olunması və imkanların genişləndirilməsi üzrə iqtisadiyyatın inkişaf istiqamətlərini müəyyən etməlidir;

-Ərazidə mövcud ehtiyatlardan və təbii resurslardan səmərəli formada istifadə olunması və sənaye sahibkarlığı yaradılmalıdır. Bu məhsulların xarici bazarlara çıxarılmasında yerli sakinlərin iştirakı təmin edilməlidir;

- İşğaldan azad edilmiş rayonlarında insanların həyat keyfiyyətinin bərpası və yaxşılaşdırılması üzrə maliyyə ehtiyatlarını və imkanlarını müəyyən etməlidir;

-Sahibkarlar və yerli əhali üzrə torpaqlarınədalətli bölüşdürülməlidir. Bundan başqa ehtiyat torpaq fondunun qorunması, ümumilikdə ərazidə kənd təsərrüfatı sənayesinin inkişafının təmin edilməsi və bu torpaqlardan səmərəli formada istifadə etməklə sahibkarlığın inkişafı təmin edilməlidir.

Nəticə olaraq, Azərbaycanın işğaldan azad olunmuş rayonlarında sənayeni inkişaf etdirmək mümkündür. Lakin istənilən halda bir çox problemə sistemli yanaşma tərtib olunması, çoxşaxəli və mürəkkəb proses zamanı parçalanmanı aradan qaldırmaq üçün davamlı proqnozlar edilməsi problemlərin həllini bu ərazilər üzrə asanlaşdıra bilər.

**Ədəbiyyat**

1. Filatov V. I. (2015) Structural aspect of the new model of economic growth of the Russian economy // World of New Economics, No. (1). pp. 31-36.
2. Shcherbakov, V. N., Khalidov, R. A. (2014) Problems of updating the technical and technological potential of the industry // Region: systems, economics, management.v.3, no.(26). pp. 71-79.
3. Abdulla, N. (2015) Regional sosial-iqtisadi inkişaf: problemlər və reallıqlar,525-ci qəzet. 2021. 14 oktyabr. S.10.
4. Baxşəliyev E., (2021) 2022 -ci ildə də sosial-iqtisadi inkişaf davam edəcək. Azərbaycan .10 sentyabr. S.1-4.
5. Bayramov, V. (2022) İqtisadi inkişaf sosial rifahın əsas amilidir. Xalq qəzeti, 11 yanvar. s.1-6.
6. Daşsalahlı, R. (2021) Qarabağ -inkişaf, tərəqqi meydanı, Azərbaycan müəllimi, 5 mart. S.2.
7. Məmmədova, P. (2020) Azərbaycanda sənayə müəsiisələrinin investisiya potensiyalının formalaşması və qiymətləndirilməsi, Kooperasiya/elmi-praktiki jurnal№3. S. 61-68.
8. Sarıyeva İ., (2021) Qarabağ turizmi - bölgələrin sosial-iqtisadi inkişaf mənbələrindən biri. Bakı Xəbər. 28 dekabr.S.10.
9. Sərxanlı, S.A., (2020). Sənayenin İnvestisiya Cəlbediciliyinə Təsir Edən Amillər. In İqtısadi Təhlükəsizlik: Mövcud Vəziyyət Və Perspektivlər, səh.318-321.
10. Azərbaycanın sənayesi, (2022) Azərbaycan Respublikasının Dövlət Statistika Komitəsi, https://www.stat.gov.az/source/industry/.
11. İqtisadiyyat və Sənaye Nazirliyi, https://www.senaye.gov.az
12. Milli hesablar və makroiqtisadi göstəricilər statistikası, https://www.stat.gov.az/menu/4/e-reports/az/01/001.php
13. Allahverdiqızı, F. (2020) Azad edilən ərazilər yerli və xarici investorlar üçün cəlbedici olacaq. 10 Dekabr 2020. https://vergiler.az/news/economy/11072.html.

**Rəyçi: i.e.d. Sahib Məmmədov**

Göndərilib: 04.03.2022 Qəbul edilib: 21.04.2022

DOI: https://www.doi.org/10.36719/2663-4619/78/169-172

**Xəqani Məqsəd oğlu Salmanov**
Azərbaycan Respublikası Turizm
və Menecment Universiteti
magistrant
xetai.salmanov@list.ru

# AZƏRBAYCANDA NƏQLİYYAT SAHƏSİNİN İNKİŞAFI VƏ MALİYYƏLƏŞDİRİLMƏSİNİN DİNAMİKASI

**Xülasə**

İqtisadiyyatın inkişafı və ölkələr arasında iqtisadi əlaqələrin genişlənirilməsində nəqliyyat sektoru vacib amillərdəndir. Belə ki , xarici investorlar hər hansı bir ölkəyə yatırım etdikdə təhlil edilən istiqamətlərdən biri də ölkənin nəqliyyatıdır. Bu səbəbdən ölkənin inkişafı etdirilməsi ilə nəqliyyat sahəsinin inkişaf etdirilməsi arasında birbaşa əlaqə vardır.

Ölkəmizdə də nəqliyyat sahəsinin inkişaf etdirilməsi Dövlət qarşısında duran priotet istiqamətlərdən biridir. Bununla bağlı olaraq hər il yeni layihələr həyata keçirilir və nəqliyyatat sektoru hərtərəfli, sistemli şəkildə inkişaf edir. Müstəqillik əldə etdikdən sonra həyata keçirilən bütün layihərlər uğurla yekunlaşıb, həmçinin yol təsərrüfat sahələrinin yenidən qurulması, yeni yolların salınması, köhnə yolların isə tam şəkildə təmiri ilə bağlı layihələr uğurla davam etdirilmişdir.Bakıda və regionlarda xeyli sayda yol ötürücüləri, körpülər, tunellər , yerüstü və yeraltı piyada keçidləri inşa olunub. İllər üzrə müqayisə etdikdə 2014 – 2018-ci illərdə ölkə iqtisadiyyatı 1,65%, qeyri - neft sektoru 3,7%, nəqliyyat sektoru isə orta hesabla 7.2% artmışdır. Nəqliyyat sektorundan əldə edilən gəlir 2014-cü ildə 2.8 milyard manat olduğu halda 2018-ci ildə 1.5 dəfə artaraq 4.8 milyard manata bərabər olmuşdur. 2018-ci il üzrə nəqliyyat sektoru əlavə dəyərin 6.3% -ə işçi qüvvəsinin isə 8.1% -ni işlə təmin etmişdir.Yuxarıda qeyd edilən məlumatlar ümumi olaraq Azərbaycanda nəqliyyat sektorunun inkişaf dinamikası qeyd edilmişdir. Rəqəmlərdən də tam olaraq aydın olur ki, Ölkə üzrə nəqliyyat sektoru daimi olaraq inkişafdadır.

***Açar sözlər:*** *ölkə iqtisadiyyatı, Azərbaycanda nəqliyyat, nəqliyyat sahəsi, layihə, nəqliyyat sektoru*

**Khagani Maksad Salmanov**

## Dynamics of transportation field development and financing in Azerbaijian

**Abstract**

The transport sector is one of the important factors in the development of the economy and the expansion of economic ties between the countries. Thus, one of the directions analyzed when foreign investors invest in any country is the country's transport. Therefore, there is a direct link between the development of the country and the development of the transport sector.The development of the transport sector in our country is one of the priorities facing the state. In this regard, new projects are implemented every year and the transport sector is developing comprehensively and systematically. All the projects implemented after gaining independence have been successfully completed, as well as projects related to the reconstruction of road facilities, construction of new roads and the complete repair of old roads. Numerous overpasses, bridges, tunnels, overground and underground pedestrian crossings have been built in Baku and the regions. Compared to the years, in 2014-2018, the country's economy grew by 1.65%, the non-oil sector by 3.7%, and the transport sector by an average of 7.2%. Revenues from the transport sector increased 1.5 times in 2018 from 2.8 billion manat in 2014 to 4.8 billion manat. In 2018, the transport sector provided 6.3% of value added and 8.1% of the workforce.

The above-mentioned information generally noted the dynamics of development of the transport sector in Azerbaijan. It is clear from the figures that the transport sector in the country is constantly developing.

***Key words:*** *Country economy, transport in Azerbaijan, transport sector, project, transport sector*

## Giriş

Stateji baxımından Azərbaycan Yaxın Şərq , Avropa və Asiya arasında şimal-cənub, həmçinin şərq-qərb ticarət qovşaqlarının kəsişməsində yerləşir. Eyni zamanda dünyanın ən qədim neft istehsal edən ölkələrindən olmaqla yanaşı regionda vacib qaz və neft istehsalçısı , eləcədə ixracatçısıdır. Azərbaycanda nəqliyyat sektoru sürətlə inkişaf edir və ümumi daxili məhsula kifayət qədər töhvə verir. 2013-cü il statistikasına əsasən nəqliyyat sektoru ÜDM 4.7% təşkil etdiyi halda 2018-ci ildə isə 1.4 artaraq 6.7% -ə bərabər olmuşdur. 21-ci əsrin ilk on ilində Azərbaycanda iqtisadiyyatı qaz və neft ehtiyatlarından çox asılı idi. Lakin dövlət bu asılılıqdan sığortalanmaq üçün son bir neçə qeyri-neft sektorunun inkişafına üstünlük verir. Hətta 2030-cu il üçün qeydri-neft sektorunun neft sektounu üstələyəcəyi haqqında proqnozlar verilir. Nəqliyyat sahəsi bu məqsədlə əhəmiyyətli bir sektor olaraq təyin edildi. Nəticədə 2017-ci ildə Hökumət tərəfindən iqtisadiyyatın 11 sektoruna əsas istiqamət olan 'Milli İqtisadiyyat üçün Strateji Yol Xəritəsini' qəbul edildi və bu sahələrin hər biri üçün sahə inkişaf planlarını ayrı-ayrılıqda təqdim olundu. Əlavə olaraq "Logistika və ticarət üçün strateji yol xəritəsi" nəqliyyat sektoru üzrə bir sıra hədəfləri işlənildi. 2019-cu ilin yanvar ayından etibarən Logistika və Ticarətin İnkişafına dair Strateji Yol Xəritəsindəki qəbul edilən fəaliyyətin 27%-i həyata keçirildi, 10%-i qismən həyata keçirildi və 63%-isə növbəti illərdə həyata keçiriləcəyi gözlənilir. Hal-hazırda Azərbaycan "Şərq-Qərb" və "Şimal-Cənub" beynəlxalq nəqliyyat dəhlizinin yaradılması üzrə infrastruktur layihələrini davam etdirməkdədir. Azərbaycanın beynəlxalq nəqliyyat qovşağına çevrilməsi istiqamətində aşağıdakı mühüm layihələrin icrası üzrə işlər aparılır. Bu səbəbdən ilkin olaraq ölkə daxilində nəqliyyat qovşaqlarının əsaslı şəkildə inkişaf etdirilməsi nəzərdə tutulub. Dünya İqtisadi Forumunun 2021-ci ildə üçün avtomobil yollarının vəziyyəti haqqında hesabatına əsasən, Azərbaycan MDB məkanında 1-ci yer olmuşdur. Siyahı üzrə Azərbaycan Asiya qitəsi üzrə 10-cu, ümumilikdə 141 ölkə arasında isə 24-cü yerdə olmuşdur.

Ölkə üzrə Nəqliyyat sektorunun bir sıra makroiqtisadi göstəricilər aşağıda qeyd edilib. (cədvəl 1.1)

**1. Nəqliyyat üzrə əsas makro göstəricilər**

| | 2016 | 2017 | 2018 | 2019 | 2020 |
|---|---|---|---|---|---|
| Əlavə dəyər (cari qiymətlərlə),milyon manat | 4.076 | 4.719 | 4.928 | 4.867 | 5 144*) |
| Ümumi mənfəət (cari qiymətlərlə), milyon manat | 3.281 | 3.860 | 3.959 | 3.789 | 3 993*) |
| Xalis mənfəət (cari qiymətlərlə), milyon manat | 2.162 | 2.935 | 3.137 | 3.055 | 3 229*) |
| Muzdlu işçilərin orta illik sayı, min nəfər | 123,8 | 126,1 | 126,8 | 130,8 | 140,7*) |
| Orta aylıq nominal əmək haqqı, manat | 649 | 734 | 807 | 856 | 886*) |
| Əsas fondlar (ilin sonuna), milyon manat | 11.582 | 12.404 | 15.175 | 15.696 | 15 839*) |
| Əsas kapitala investisiyalar, milyon manat | 1.391 | 1.774 | 1.923 | 2.189 | 2.092 |

Cədvəl üzrə nəzərə alsaq son 4 ildə Əlavə dəyər məbləği 1.26 , Ümumi mənfəət 1.21, Xalis mənfəət 1.49 dəfə artmışdır. Bu göstəricilər üzrə Respublikamız dünya ölkələri arasında bir çox dövləti qabaqlayır.

Aşağıdakı cədvəldə (cədvəl 1.2) isə Nəqliyyatın ölkə iqtisadiyyatında xüsusi çəkisi qeyd edilib.

**1.1. Ölkə iqtisadiyyatında nəqliyyatın xüsusi çəkisi, faizlə**

| | 2016 | 2017 | 2018 | 2019 | 2020 |
|---|---|---|---|---|---|
| Əlavə dəyər | 6,7 | 6,7 | 6,2 | 5,9 | 7,1*) |
| Ümumi mənfəət | 7,6 | 7,4 | 6,7 | 6,6 | 8,5*) |
| Xalis mənfəət | 6,5 | 6,5 | 5,8 | 5,8 | 7,7*) |
| İşçilərin orta illik sayı | 8,1 | 8,2 | 8,1 | 8,0 | 8,3*) |

| | | | | | |
|---|---|---|---|---|---|
| Orta aylıq nominal əmək haqqı**) | 129,9 | 138,9 | 148,2 | 134,8 | 125,2*) |
| Əsas fondlar | 8,1 | 6,8 | 7,6 | 6,9 | 6,8*) |
| Əsas kapitala investisiyalar | 8,8 | 10,2 | 11,2 | 11,8 | 12,1 |




Nəqliyyatda maliyyə planlaşdırılması, maliyyə sxemlərinin hazırlanması, təhlil edilməsi və icra olunması üzrə prosesləri özündə əks etdirir. Maliyyə planlaşdırılması nəqliyyat sahəsinin idarə olunması fəaliyyətinin funksional tərkib hissəsidir. Maliyyə planlaşdırılması zamanı nəqliyyat subyektləri, müvafiq nəqliyyat orqanları ilə mövcud maliyyə resurslarının tərkibində və strukturunda qiymətləndirmələr aparır, maliyyə vəsaitlərinin artırılması və səmərəli istifadə olunması ilə bağlı tövsiyyələr hazırlayır. Düzgün maliyyə planlaşdırılması nəqliyyat sahəsində iqtisadi tarazlığa və sabit maliyyə mühitinin formalaşdırılmasına, mənfəət əldə edilməsinə, qarşıya qoyulmuş iqtisadi və sosial vəzifələrə nail olmağa zəmin yaradır. Belə ki , 2020 -ci ilin sonlarından etibarən ərzilərin işğaldan azad edilməsi yeni nəqliyyat qovşaqlarının yaranmasına imkan yaratdı. Belə ki , 2020-ci il il noyabr ayında "Zəfər yolu" təməli qoyulmuşdur. Bu yol Şuşa şəhərindən Hacıqabul-Mincivan-Zəngəzur dəhlizi magistralına qədər uzanır. Yolun ümümi uzunluğu 101 km təşkil edir. Digər layihə isə Zəngilan-Horadiz avtomobil yolunun tikintisidir. Bu yolun çəkilməsi ilə bağlı işlət davam etdirilməkdədir. Yolun ümumi uzunluğu 124 kilometr təşkil edir və 4-6 zolaqdan ibarətdir. Xocavənd rayonunun Hadrut qəsəbəsindən başlayan və Cəbrayıl rayonundan keçməklə Şükürbəyli kəndində Hacıqabul-Mincivan-Zəngəzur dəhlizi magistral avtomobil yoluna birləşən Hadrut-Cəbrayıl-Şükürbəyli avtomobil yolunun da tikintisinin icrasına başlanılmışdır. Layihələndirilən yolun uzunluğu 43 kilometr təşkil edir. İşğaldan azad edilmiş ərazilərdə icra olunan yol infrastrukturu layihələrindən biri Bərdə-Ağdam avtomobil yoludur. Başlanğıcını Bərdə şəhərindən götürən Bərdə-Ağdam avtomobil yolunun uzunluğu 44,5 kilometr təşkil edir . Azad edilmiş ərazilərdə icra olunan yol infrastrukturu layihələrindən biri Xudafərin-Qubadlı-Laçın və Xanlıq-Qubadlı avtomobil yollarıdır. Laçın – Qubadlı- Xudafərin avtomobil yolunun uzunluğu 66 km təşkil edəcək. Qeyd edilən yol Xanlıq məntəqəsindən başlayaraq Qubadlı şəhərinə qədər 17 km uzunluğunda yeni avtomobil yolunun da inşası nəzərdə tutulub. Layihələndirilən yolların ümumi uzunluğu 83 km təşkil edir. Əlavə olaraq uzunluğu 29 kilometr olan Tərtər-Çaylı-Suqovuşan-Talış avtomobil yolunun bərpası həyata keçirilib.Hal-hazırda əlverişli coğrafi məkanda yerləşən respublikamız bütün beynəlxalq və regional layihələrin reallaşması prosesində aktiv iştirak edir.Son illər dəmir yolu nəqliyyatı sisteminin beynəlxalq standartlara uyğun təkmilləşdirilməsi, ölkənin dəmir yolları şəbəkəsinin genişləndirilməsi, müasirləşdirilməsi və yenilənməsi istiqamətində intensiv işlər aparılıb. Həmçinin beynəlxalq və regional nəqliyyat dəhlizlərinin, "Bakı-Tbilisi-Qars" və "Şimal-Cənub" layihələrinin reallaşması prosesində Azərbaycanın aktiv iştirakı təmin edilib. Hazırda işğaldan azad edilmiş ərazilərdə dəmiryolu şəbəkəsinin bərpası istiqamətində işlər aparılır. Uzunluğu 100 km olan Horadiz-Ağbənd dəmir yolu xəttinin işğaldan azad olunmuş torpaqlara gediş-gəlişində mühüm rol oynayacaq və ən vacibi gələcəkdə Zəngəzur dəhlizi vasitəsi ilə Azərbaycanın əsas hissəsi ilə Naxçıvan MR arasında birbaşa dəmir yolu əlaqəsinin yaranmasına imkan verəcək. Bundan əlavə, ümumi uzunluğu 45 kilometr olan Bərdə–Ağdam dəmir yolu xətti də yenidən qurulur.

Azərbaycan Respublikası Dövlət Statistika Komitəsinin məlumatına görə, 2019-cu ildə 235 milyon ton mal nəql edilmişdir .Avtomobil nəqliyyatı yüklərin daşınması üzrə əsas növ (2018-ci ildə 65%) olsa da, boru kəmərləri də bu rəqəmin mühüm hissəsini (ümuminin təxminən 25%-ni) təmsil edir ki, bu da Azərbaycanın neft və qaz istehsalçısı və ixracatçısı kimi profilinə uyğun gəlir. Boru kəmərləri istisna olmaqla daşınan malların 88%-i avtomobil nəqliyyatı, sonra müvafiq olaraq dəmir yolu (8,4%), dənizlə (3,4%) və hava yolu (0.1%) nəqliyyatının payına düşür. 2014-2019-cu illər ərzində ümumi yük daşımalarının həcmi 5,6% artmışdır. Bu, əsasən avtomobil yolu vasitəsilə yük nəqliyyatında 17% artımdan meydana gəldi, eyni zamanda dəmir yolları və dəniz vasitəsilə daşımalar azaldı. Avtomobil nəqliyyatı ilə yükdaşımalardakı artım tendensiyası Azərbaycanın MDM hədəflərinə çatması üçün, şübhəsiz ki, çağırışa çevriləcək. Nəqliyyat sektorunda mal dövriyyəsi 2014-cü ildəki 93.531 milyon ton-km-dən 2019-cu ildə 89.749 milyon ton-km-ə qədər azalıb.

Nəqliyyat sisteminin inkişaf etdirilməsinin əsas məqsədləri aşağıdakılardır.

1. nəqliyyat xidmətləri ilə respublika əhalisinin çevikliyinin artan tələblərini qarşılamaqla həyat tərzinə olan müsbət təsirin maksimum səviyyəyə çatdırılması
2. iqtisadi artıma xidmət etmək üçün etibarlı,sağlam,əlverişli nəqliyyat siyasətinin həyata keçirilməsi .Nəqliyyat sisteminin inkişafının məqsədləri, sürətli iqtisadi artım mərhələsinə keçidlə üst üstə düşən birbaşa ictimai və iqtisadi prioritetlərin həyata keçirilməsi ilə əlaqədardır.
3. Vahid iqtisadi məkanın inkişafı, mal dövriyyəsinin sürətləndirilməsi və iqtisadiyyatda nəqliyyat xərclərinin azaldılması - mal dövriyyəsi sistemində inzibati əngəllərin və ayrı-ayrı regionların nəqliyyat sisteminin inkişafında qeyri-bərabərliyin ləğv olunması ilə yanaşı, ölkədə vahid dayanıqlı nəqliyyat şəbəkəsinin yaradılmasını tələb edir.

**Nəticə**

Azərbaycan Respublikası qarşısında duran əsas prioritet istiqamətlərdən biri də nəqliyyat sektorunu çoxşaxəli istiqamətdə inkişaf etdirməkdir. Tam əminlikdə demək olar ki bu vəzifə yüksək səviyyədə icra edilir. Bu gün Azərbaycan Respublikası öz regionunun ən inkişaf etmiş ölkəsidir. Yuxarıda məqalədə qeyd edilən nəticələri analiz etdikdə bu inkişafın davamlı olacağını demək olar. Ərazilərin işğaldan azad edilməsi isə bu inkişafa xüsusi olaraq rəng qatacaq.

**Ədəbiyyat**

1. Əliyev E.Ə. (2009)Beynəlxalq nəqliyyat hüququ.Dərslik. Bakı: Elm.
2. Cənub-Şimal nəqliyyat dəhlizi: inkişaf meyilləri və perspektivlər. Azərbaycan Dövlət İqtisad Universitetində yerinə yetirilmiş büdcə təyinatlı elmi-tədqiqat işlərinin yekununa həsr edilmiş elmi-praktiki konfransın tezisləri. Azərbaycan Dövlət İqtisad Universiteti.
3. Azərbaycan Respublikasında nəqliyyat sisteminin inkisafına dair (2010 −2020 - ci Illər) Dövlət Proqramı
4. Regional nəqliyyat infrastrukturunun təkmilləşdirilməsində Bakı-Tbilisi-Qars dəmir yolu xətti layihəsinin rolu. Azərbaycanın vergi jurnalı. Bakı
5. Azərbaycan Respublikasında avtomobil yolları səbəkəsinin yeniləşdirilməsi və inkşafına dair Dövlət Proqramı|| (2009-2020-ci illər)
6. Regional nəqliyyat infrastrukturunun təkmilləşdirilməsində Bakı-Tbilisi-Qars dəmir yolu xətti layihəsinin rolu. Azərbaycanın vergi jurnalı. Bakı: № 3.
7. Məmmədov.Z.S. XXI :İqtisadi İnkişafın nəqliyyat faktoru. Bakı: Elm, 386 səh.
8. mot.gov.az-A(zərbaycan Respublikası Nəqliyyat Nazirliyi)
9. www.traceca-org.org/ru/traseka/istorija-traseka/
10. www.xalqqazeti.com/az/news/economy/66959
11. iqtisadiyyat.com/az/pages/8/information/489
12. Economy.gov.az

**Rəyçi: i.ü.f.d. Camal Hacıyev**

Göndərilib: 11.03.2022 Qəbul edilib: 12.04.2022

DOI: https://www.doi.org/10.36719/2663-4619/78/173-177

**Ləman Amil qızı Amil**
Azərbaycan Dövlət İqtisad Universiteti (UNEC)
magistrant
amil.leman@mail.ru

# ƏMLAK VERGİLƏRİNİN HESABLANMASI VƏ TUTULMASININ DÜNYA TƏCRÜBƏSİ

**Xülasə**

Əmlak vergisi hal-hazırda dünyanın 120-dən çox ölkəsində tətbiq edilməkdədir. Əmlak vergisinin tətbiq edildiyi ölkələrin əksəriyyətində büdcə gəlirlərində əmlak vergisi üzrə daxilolmaların payı təxminən 1-3% arasında dəyişir. Qeyd etmək lazımdır ki, ABŞ-da həmin göstərici hətta doqquz faizə qədər hesab olunur . Əmlak vergisi üzrə mədaxilin Ümumi Daxili Məhsuldakı dəyəri Kanada, İngiltərə, Amerika Birləşmiş Ştatları, Yaponiya və Fransa kimi inkişaf etmiş ölkələrdə müxtəlif göstəricilərə malikdir. Azərbaycan Respublikasında isə fiziki və hüquqi şəxslərdən tutulan əmlak vergisi mədaxilinin Ümumi Daxil Məhsuldakı dəyəri təxminən 0,3%-a bərabərdir. Azərbaycan Respublikasındakı əmlak vergisinin göstərici səviyyəsi Avstraliya və Avstriya ilə eyni səviyyədədir.
***Açar sözlər:****əmlak vergisi, dünya təcrübəsi, büdcə, torpaq vergisi, ümumi daxili məhsul*

**Laman Amil Amil**

## World experience of calculation and determination of property taxes

**Abstract**

Property taxes are currently applied in more than 120 countries around the world. In most countries where property taxes are applied, the share of property tax revenues in budget revenues varies between about 1-3%. It should be noted that in the United States, this figure is as high as nine percent. The value of property tax revenue in GDP varies in developed countries such as Canada, the United Kingdom, the United States, Japan and France. In the Republic of Azerbaijan, the value of property tax income from individuals and legal entities in the Gross Domestic Product is about 0.3%. The indicator level of property tax in the Republic of Azerbaijan is the same as in Australia and Austria.
***Key words :*** *property tax, world experience, budget, land tax, gross domestic product*

## Giriş

Beynəlxalq təcrübədə əmlak vergisi qeyd-şərtsiz olaraq yerli vergiyə daxil edilir, yəni bəzi ölkələrdə torpaq vergisi ayrıca olaraq alınmır, daşınmaz əmlakla birlikdə vahid vergi sistemi olan əmlak vergisinə daxil edilir. Bundan əlavə hüquqi şəxslərdən alınan əmlak vergisi də yerli büdcənin tərkibində hesablanılır. Aşağıdakı cədvəldə 2019-cu il statistikasına görə inkişaf etmiş həmçinin inkişafda olan digər ölkələrdə əmlak vergisinin həcmi göstərilmişdir (14).

Amerika Birləşmiş Ştatlarında səciyyəvi olaraq əmlak vergisi adətən sahibkarlıqla əlaqədar hüquqa bağlı olaraq daşınmaz əmlakın məbləğinə əsasən vergi tutulması tətbiq edilir. Buna nümunə olaraq Texas əyalətində əmlakla bağlı verginin sahibindən tutulma vaxtı hər vergi ilinin yanvar ayının 1-nə təsadüf edir. Verginin hesablanması isə əmlakın həmin tarixə olan dəyərinin vergi dərəcəsinə tətbiq edilməsi ilə həyata keçirilir. Bundan əlavə, Nyu-Yorkda olduğu digər ştatlarda da daşınmaz əmlakın alqı-satqısının həyata keçirilməsi ilə əlaqədar vergi sistemi mövcuddur. Ümumi olaraq qeyd edə bilərik ki, ir ABŞ-ın bir çox ştatlarında digər əmlak vergisi ilə birlikdə şəxsi əmlak vergisi tutulur. Şəxsi əmlak vegisinin tutulduğu əyalətin sərhədləri əhatəsində mövcud olan əmlak obyektinə sahib olmaq yaxud mülkiyyətçilik hüquqlarına əsasən bir ilə uyğun vergi məbləği hesablanaraq tətbiq edilir (15).

Kanadada yerli vergi sistemində miqyasına görə ən əhəmiyyətlisi olan məhz əmlak vergisidir. Kanadada mövcud vergitutmanın məbləği üzərində tikinti aparılan torpağın dəyərinə uyğun olaraq hesablanılır. Əyalətlərdə vahidləşmə sisteminin formalaşdırılışması üçün vergi əldə edilən əmlakın dəyərləndirilməsi funksiyasını ştat hakimiyyətləri həyata keçirir. Qiymətləndirmədə mövcud dəyərin

yaradılmasında ortaya çıxan məxaric, mülkiyyətçisinə qazandırdığı real gəlir və dəyərləndirmə zamanı bazarda mövcud qiymətin hesabatının aparılması olaraq üç əsas faktor nəzərə alınır. Bundan əlavə vergitutma obyektinə yalnız torpaq və binalar daxil olub, bu vergi sistemi avadanlıqlara tətbiq edilmir (15).

Almaniyada əmlak vergisi "Əmlak vergisi haqqında " 14 mart 1985-ci il tarixli qanununa uyğun olaraq tətbiq edilir. Almaniyada əmlak vergisi bütöv məbləğdə federativ sahə üzrə büdcəyə mədaxil olunur. Əmlak üzrə dəyərləndirilmə metodu isə xammal dəyərlilərinə uyğun olaraq həyata keçirilir. Burada vergi məbləği fiziki şəxslərə görə 0,5%, hüquqi şəxslərə üçün 6/10 faiz hesablanılır. Həmçinin əmlaka uyğun olaraq müəyyən güzəştlər tətbiq edilir (13).

Almaniya Federativ Respublikasının vergi sisteminə əsasən əmlak vergisi üzrə vergiyə cəlb olunan əmlak əsasən daşınmaz əmlak hesab olunan binalar, torpaqlar, maddi olmayan aktivlər səhmlər, borc öhdəlikləri mal-material qiymətliləri, uzunmüddətli şəkildə istifadə edilən mallar olan televizorlar, soyuducular yəni real şəxsi əmlak, kommunal və kommunal olmayan digər müəssisələrin obyektləri və avadanlıqlara tətbiq edilir. Bundan əlavə, kənd və meşə təsərrüfatına aid olan müəssisələrin əmlakı, hüquqi və fiziki şəxslərin daşınmaz əmlakı, şirkətlərin istehsal təyinatlı əmlakı, şəxsi əmlakın müxtəlif növləridə əmlak vergisinə daxildir.

Almaniyada əmlak vergisi üzrə bütün mədaxillər torpaq hökumətinin büdcəsinə daxil edilir. Şəxsi və istehsal məqsədilə olan əmlaklar bir-birindən ayrılaraq vergiyə cəlb edilməsi mərhələsində növlərinə uyğun dərəcələrdən istifadə edilir. Burada hüquqi şəxslərə tətbiq edilən əmlak vergisi 0,6 %-ə bərabərdir. Nəticəsi etibarilə qeyd edə bilərik ki, burada əmlaka daxil olan bütün amillərin dəyərinə vergi tətbiq edilir. Şirkətə məxsus olan daşınmaz əmlakın qiymətləndirmə mərhələsində isə reallaşdırma qiymətinə uyğun olaraq yekun göstəriciyə daxil edilir (13, s 48).

Şirkətlərin eləcə də fiziki şəxslərin öz əmlaklarını qiymətləndirmə dəyəri isə əmlak vergitutmasının əsas elementi hesab edilir . Belə ki, əmlaka daxil olan bütün amillərinin gəlirlilik səviyyəsinə uyğun qiymətləri cəmi vergi qanunvericiliyinə uyğun olaraq vergiyə cəlb edilir. Müəssisənin daşınmaz əmlakı satılarkən onun dəyəri qiymətləndirmə mərhələsində qiymət göstəricisi ilə, eləcə də daşınan əmlakın qalıq dəyəri ilə, qiymətli kağızların eləcə də iştirak isə kurs dəyəri ilə müəyyən edilir. Almaniyada hətta müəssisənin əmlakının minimum ölçüsü belə müəyyən edilərək ondan vergi tutulur (13, s. 52).

1995-ci ilə qədər fiziki şəxsin ortaq əmlakının vergi səviyyəsi 0,5 faiz təşkil etdiyi halda, həmin ildən sonra isə qeyd edilən vergi dərəcəsi 1 faizə qədər yüksəldilmişdir. Şirkətlər eləcə də öz növbəsində istehsal fəaliyyətini həyata keçirən müəssisələrə isə 0,6 faiz vergi ödəyirlər. Qeyd etdiyimiz vergi səviyyəsinin yüksəldilməsi ilə birilikdə üzərinə vergi tətbiq edilməyən müəssisələrin minimum dərəcəsi də artırılmışdır. Belə ki, vergi dərəcəsi artırılmadan əvvəl 70 000 mark dəyərində olan əmlakdan vergi alınmırdısa, hal-hazırda dəyəri 120 min markadan kiçik olan əmlaka vergi tətbiq edilmir. Hüquqi şəxslərdə isə üzərinə vergi qoyulmayan əmlak üçün minimum dəyə 20 min mark təşkil etməlidir. Əmlakın yenidən qiymətləndirilməsi müddəti isə hər üç ildən bir həyata keçirilir(11).

Almaniyada daşınan əmlak hesab olunan nəqliyyat vasitələrinə qoyulan vergi iyirmi bir dekabr 1927-ci ildə qəbul edilən, eləcə də iyirmi iki dekabr 1983-cü il tarixində yenidən redaktə olunan qanuna uyğun olaraq tətbiq edilir. Motosiklet və minik avtomobillərə tətbiq edilən vergi dərəcəsi mühərrikin işçi həcminə uyğun olaraq hesablanılır. Yük maşının isə ümumi çəkisi nəzərə alınaraq vergi tətbiq edilir. Nəqliyyat vasitələrinin vergisinin tutulma tezliyi isə ildə bir dəfə təşkil edilir. Daşınmaz əmlakdan alınan vergi növlərindən biri də məhz torpaq vergisidir. Buna baxmayaraq burada kilsələr, məktəbəqədər körpələr üçün tərbiyə qurumları, xəstəxanalar, internat evləri, tədris məqsədilə ayrılan torpaq əraziləri qeyd edilən əmlak vergisindən azaddır (11).

Digər ölkələrdə olduğu kimi Türkiyə Respublikasının sərhəddi daxilində də daşınmayan əmlak obyektləri birbaşa əmlak üzrə vergiyə daxil edilir. Sahibkarlığında daşınmayan əmlaka malik şəxslər isə əmlak vergisi ödəyən şəxs qismində fəaliyyət göstərir. Türkiyə Respublikasında əmlak vergisi bina yəni tikili vergisi və torpaq vergisi olmaqla 2 yerə ayırılır. Buna baxmaraq bir sıra müəssisələr əmlak vergisindən azaddır. Belə müəssisələrə büdcə təşkilatları və qurumları, dövlət eləcə də bələdiyyə mülkiyyətində olan əmlaklar, hərbi şəhərciklərə daxil olan tikililər daxildir (10). Yaşayış binalarının 2 min beş yüz TL dəyərindən yüksək olmaq şərtilə ödəyəcəyi verginin 4-də bir hissəsi binanın inşasının yekunlaşdığı ildən sonrakı 5 il müddətində heç bir vergi ödənilmir. Bundan əlavə turizm müəssisələrinə

məxsus inşaatlar tikintisinin yekunlaşdığı yaxud alqı-satqı ilə əldə olunduğu növbəti ildən etibarən beş il müddətində əmlak üzrə vergisi ümumiyyətlə tutulmur. Torpaq vergisindən azad olan başqa müəssisələr isə dövlətin, bələdiyyələrin, büdcə təşkilatlarının eləcə də fermerlərin mülkiyyətində olan torpaq sahələridir (7).

İspaniyada şəxsi əmlakı olan fiziki şəxs il ərzində bir dəfə əmlak vergisi ödəməli olur. Burada əmlaklarının harada olması nəzərə alınmadan əmlak obyektinin bütöv dəyərini rezidentlərdən, qeyri-rezidentlərdən İspaniya ərazisindəki əmlak üçün vergi məbləği tutulur. Vergi məbləği isə əmlak obyektinin dəyərinə görə dəyişiklik göstərir. Belə ki, burada vergi əmlakın dəyərinin ümumi məbləği 2/10 faizdən 2,5 faizədək göstəricilərə malikdir. Burada daşınmayan əmlak obyekti və həmin əmlak üçün razılaşmayla əlaqədar vergi məbləği, iqtisadiyaat sahəsində yerinə yetirilən funksiyalarla bağlı vergi, torpaq sahələrinin yüksəliş göstərən dəyərinə uyğun olan vergilər məhz əmlak vergisinə daxildir. Burada daşınmayan əmlak obyekti üçün vergitutma obyekti deyildikdə bələdiyyə orqanı əhatəsində mövcud olan torpaq ərazisi və inşaatlar nəzərdə tutulur. Kadastr idarəsi isə əmlakın qiymətləndirilməsi funksiyasını həyata keçirir. Burada dərəcələr diferensial olub bələdiyyələr tərəfindən tənzimlənmə həyata keçirilir. Tənzimlənmənin əsas səbəbi şəhərlərdə və kənd yerlərində mövcud olan torpaqlardır. Bələdiyyələr vergi dərəcəsini müəyyənləşdirir və bu dərəcə 16 faizdən 30 faizə qədər göstəriciyə sahib olur. Daşınmaz əmlak sahibi olan xarici firmalara isə İspaniya hökumətinə xüsusi vergi ödəməli olurlar. Xüsusi verginin dərəcə faizi isə 5 faiz olub əmlakın kadastr qiymətinə tətbiq edilir. Əmlakın alqısı eləcə də satışı ilə əldə edilmiş razılaşma ilə qiymətli kağızlarla əməliyyatlara əmlak üzrə razılaşma və əmlak hüququ vergisi tətbiq olunur. Daşınmaz əmlak üzrə satışın vergi dərəcəsi 6 faiz, qiymətli kağızlar üzrə razılaşma üçün vergi dərəcəsi isə 4 faiz təşkil edir.

Rusiyada əmlak vergisi siyasəti fərqli bir şəkildə tətbiq edilir. Belə ki, mülkiyyət növündən asılı olmayaraq bütün Rusiya Fedrasiyasında mövcud olan təşkilatlar, eləcə də daimi nümayəndəliyin vasitəsilə fəaliyyətdə olan əcnəbi qurumlar, RF sərhəddi daxilində sahibkarlığında daşınmayan əmlaka malik əcnəbi qurumlar birbaşa şəkildə həmin qurumların əmlak vergisinin ödəyiciləri hesab olunr. Rusiya Federasiyası təşkilatları üçün aparılan mühasibat uçotu qaydalarına görə balansda əsas vəsait daşınar və daşınmaz əmlakdan tutulan vergi hesab olunur (12).

Rusiya Federasiyasında daimi nümayəndə olaraq fəaliyyətdə göstərən əcnəbi qurumlara görə mühüm məbləğ obyekti daşınan və daşınmayan əmlak obyekti aid edilir. Bundan əlavə RF-da daimi nümayəndə şəklində fəaliyyətdə olmayan əcnəbi təşkilatların mülkiyyət hüququna məxsus olan buna baxmayaraq Rusiya Federasiyası burada yerləşən daşınmaz əmlak da vergitutma obyekti hesab edilir. Vergitutma bazası olan əmlakın illik dəyərinin maksimum səviyyəsi 2,2 faiz hesablanılır. Əmlakın, yəni qeyd etiyimiz təşkilatların yer aldığı məkandan, fəaliyyət göstərdiyi sektordan əlaqədar olaraq vergi məbləğini müəyyən etmək hüququ federasiyanın subyektlərinə aiddir. Rusiya Federasiyası ərazisində əmlak mülkiyyətçisi vətəndaşlar, əcnəbilər eləcə də vətəndaşlığa sahib olmayan şəxslərin hər biri fiziki şəxslər üçün tətbiq edilən əmlak vergisi tutulur. Yaşayış yerləri, bina və başqa inşaat obyektləri vergi tutulan müəssisə olub, ərazi üzrə idarəetmə qurumlarının müəyyən edəcəyi dəyəri və vergi məbləğinin səviyyəsini federal qanunvericilik müəyyənləşdirir (2, s. 28).

Rusiya Federasiyasında fiziki şəxslər daşınmaz əmlak hesab olunan vergitutma obyektlərinə yəni mənzillərə, otaqlara, evlərə olması eləcə də hamam, qaraj, anbar və digər təsərrüfat tikililərinə görə əmlak vergisi ödəməlidirlər. Verginin məbləği tikilinin kadastr dəyərinə uyğun olaraq hesablanılır. Bundan əlavə yarımçıq tikili də vergitutma obyekti olaraq müəyyənləşdirilmişdir. Nəticədə bələdiyyə qurumlarının gəlirləri və eləcədə rolu daha da artmışdır. Qərara əsasən qeyd etdiymiz vergitutma obyekti olan əmlaka görə bazar dəyəri üzrə vergi ödənilmədiyi təqdirdə həmin təşkilatlar sökülməlidir (3).

Əmlak vergisi siyasətinə ciddi nəzarət edən ölkələrdən biri də məhz Böyük Britaniyadır. Belə ki burada yerli vergi sistemi deyildikdə ilk ağla gələn ünsür əmlak vergisi və bələdiyyə vergisidir. Böyük Britaniyada məhz əmlakdan alınan vergi məbləği vergi gəlirlərində xüsusi yerə sahibdir. Daşınmaz əmlak hesab olunan torpaq ərazisi, yaşayış, qeyri-yaşayış binalarından və buna bənzər digər təşkilatların mülkiyyətçi və istifadəçisi əmlak vergisi ödəməli olurlar . Bundan əlavə, həmin vergiyə binanı icarəyə götürən və mənzilin istisması ilə bağlı məbləğ ödənişi edən şəxslər də öz növbəsində cəlb edilirlər. Böyük Britaniyada yalnız aqrar sektora aid torpaqlar və burada yer alan inşaat obyektləri (yaşayışın olduğu

obyektlər xaric), eləcə də kilsə binaları vegitutma obyektinə daxil deyildir. Vergitutma bazası olaraq əmlakın bir illik xalis dəyəri müəyyən edilir. Əmlak vergisi məbləğinin müəyyənləşdirilməsində əmlak dəyərinin yenidən qiymətləndirilməsi prosesi olduqca əhəmiyyətli rola sahibdir (8). Böyük Britaniyada qeyd etdiyimiz bu proses on ildən bir həyata keçirilir. Qiymətləndirilmənin aparılmasının əsas məqsədi əmlak dəyəri ilə real bazarda mövcud dəyərə uyğunlaşdırıla bilməsidir. Bu verginin dərəcə faizi bələdiyyələrin maliyyə resurs tələbinə uyğun olarq tərtib edilir, bu səbəbdən qeyd etiyimiz əmlak dərəcəsi göstəricisi şəhər və qraflıqlar baxımından bir-birindən olduqca fərqli göstəricilərə malikdirlər. Vergi il ərzində rüblərə bölünməklə bərabər miqdarda on dəfəyə ödənilməlidir. Aztəminatlı ailələr, eləcə də xeyriyyə təşkilatları üçün isə yerli vergilərin tutulması miqdarında 50 faiz güzəşt tətbiq edilir (9).

Fransada əmlak vergisinin əsas ödəyicisi hüquqi şəxslərdir. Fransada ümumilikdə əmlak vergisindən əldə edilən dəyər dövlət gəlirlərinin 10 faizini təşkil edir. Xüsusilə, peşəkarlıq fəaliyyəti çərçivəsində və məqsədilə istifadə edilən əmlak, kənd təsərrüfatı obyektlərinin digər növləri, rəssamlıq və digər incəsənətə aid məmulatlar tam və ya qismən vergiyə cəlb edilmirlər. Əmlak üzrə vergi növü təkmilləşmə xüsusiyyətinə malik olsa da, gəlir vergisi ilə əmlak vergisinin dəyəri ümumi gəlirin 85%-ni keçməməlidir. Müəssisə və şirkətlərə məxsus olan avtonəqliyyat vasitələri də vergiyə cəlb edilən ünsürlər hesab edilir. Həmin obyektlərin vergi ödəyicisi isə özəl avtomobil nəqliyyatı vasitələrindən yararlanan hüquqi şəxslərdir. Vergi məbləği avtomobillər üzrə say hesabına və onlara məxsus vasitələrin həcminə görə dəyişiklik göstərir. Bundan əlavə əmlak üzrə vergiyə dair qrupa qeydiyyatın olunması, tutulması və rüsum məbləğini , eləcə də mühasibatlıq və kredit təşkilattrı, sığorta lahiyələrini bütün məxaricindən əldə olunan rüsumları da daxil etmək mümkündür. Yaşayış ərazisinə görə vergini isə istər yaşayış yerinin sahibləri istərsə də kirayəyə götürənlər mənzil vergisi şəkilində ödəyirlər (40).

Hollandiyada əmlak vergisi bələdiyyə tərəfindən hər il müəyyən edilir. Yerli icra hakimiyyəti orqanları əmlak vergisi məbləğini seçmək səlahiyyətinə malikdir. Burada əmlak vergisini əsasən iki tərəf ödəyir. Belə ki, verginin bir hissəsi əmlak sahibindən, digər hissəsi isə onun istifadəçisindən tutulur. Əgər əmlak sahibi və istifadəçisi eyni şəxsdirsə əmlak vergisini həmin şəxs təkbaşına ödəyir. Tikinti dövründə olan yeni binalardan isə əmlak vergisi tutulmur (5).

İtaliyada əmlak vergisi hesablandığı zaman kənd təsərrüfatı fəaliyyətinə dair məqsədlər üçün torpaq ayrıca uçota alınır. Vergilər yalnız yaşayış binaları hesab edilən obyektlər, eləcə də şəhər evləri və bağ evlərinə tətbiq edilir. Təklif həcmi daşınmaz əmlak vergisi sahibinin istifadəsinə dair tariflərə uyğun müəyyən edilir. Burada əmlak vergisi bazası icarəyə verilən əmlaka dair bağlanan icarə müqaviləsinə əsaslanaraq hər il üçün icarə haqqının məbləği ilə hesablanılır. Torpağın icarə haqqının məbləğinin tənzimlənməsi isə kadastr əsasında reyestrlər tərəfindən həyata keçirilir. Kadastr dəyərinə hər on ildən bir yenidən baxılır.

İsveçrə dövlətində daşınmaz əmlak vergisi yaşayış, ticarət və istehsal məqsədləri üçün tutulur. Bundan əlavə, ödənilmiş daşınmaz əmlak vergisi korporativ gəlir vergisinin düzəlişi üçün əsas hesab oluna bilər (60).

Dünya iqtisadiyyatı təcrübəsindən də gördüyümüz ki, əmlak vergisinin büdcədəki payı olduqca yüksəkdir. Respublikamızda da son dövrdə keçirilən vergi islahatları nəticəsində əmlak vergisinin büdcədəki payı getdikcə artmağa başlamaqdadır. Doğrudur, bu artış yüksək səviyyədə olmasa da, gələcəkdə əmlak vergisinin daha da təkmilləşdirilməsi nəticəsində həmin yüksəlmənin müşahidə olunması gözləniləndir.

## Nəticə

Əmlak vergisi adətən aşağı səviyyədə əmlakın məbləğinin 5/10 və bir faizdən tutulsa da, buna baxmayaraq daşınmaz əmlak müəyyən fəaliyyətin həyata keçirilməsi məqsədi ilə üçün tutulmuşdursa bu zaman vergi dərəcəsi kəskin şəkildə yüksəlir. Buna nümunə olaraq əgər əmlak bərbərlik fəaliyyəti üçün nəzərdə tutulmuşdursa binanın otuz faizi məbləğində, vəkilliklə bağlı ofislər və həkimliklə əlaqədar idarələr üçün müəyyən edilimişdirsə 50% miqdarında vergi məbləği tətbiq edilir (9). Burada ən yüksək əmlak vergisi faizi isə alkoqollu içkilərin istehsal fəaliyyəti ilə məşğul olan binaların payına düşür, belə ki  əmlak vergisi yüz qırx faiz məbləğində ödənilir. İdarə etmə qurumu və ştat müəssisələri eləcə də bu müəssisələrin tərkibində olan qurğular daşınmaz əmlak vergisindən azad edilir. Buna

baxmayaraq həmin binalara ümumi dotasiya və subvensiyalar tətbiq edilməklə birlikdə onların ödəmədikləri vergi miqdarında vəsait ayrılaraq bələdiyyə tərəfindən ödənilir. Ştatlara və bələdiyyə qurumların həmçinin otel və restoran fəaliyyəti ilə əlaqədar rüsumun məbləği və vergilərin alınması ilə birlikdə, alkoqollu içki növlərinin satışınını keçirilməsi ilə lazım olan vergi məbləğinin toplanılması səlahiyyətləri də verilmişdir. Bələdiyyə qurumları üzrə vergi mədaxilinin əsas qismini fərqli icazələrin və lisenziyaları əldə olunmasına verilən ödəmələr təşkil edir.

**Ədəbiyyat**

1. Azərbaycan Respublikası Vergilər Nazirliyinin Tədris Mərkəzi (Şamaxı 2014: 604 )Vergiyə giriş
2. Azərbaycan Respublikasının İqtisadiyyat Nazirliyi yanında Dövlət Vergi Xidməti (Bakı 2021: 270). "Hüquqi Şəxlərin Əmlak Vergisi"
3. Azərbaycanın Vergi Jurnalı. (2016). Azərbaycanın büdcə gəlirlərinin formalaşmasında səmərəli vergi siyasətinin rolu, Bakı.
4. Əliyeva, N.N., (Bakı-2016: 73). "Müəssisələrdə vergilərin tərkibi, xüsusiyyətləri onların uçotunun təkmilləşdirilməsi" //
5. Musayev, A., Qəhrəmanov A. (2020)"Vergi mədəniyyəti". Bakı: Çaşıoğlu" nəşriyyatı, 343 səh.
6. Şirinov, Ş. İ. (2016)"Əmlak vergisi və onun tətbiqi problemləri", Bakı-2016, 85 s.
7. Büyüme Odaklı Vergilendirme Çalışma Grubu Raporu., " On birinci kalkınma planı"// Ankara-2018., 71 s.
8. Hasanov, V. (2019) Azerbaycan Vergi Sistemi: Sorunlar ve Çözüm Öneriler.,İstanbul
9. Kurt E., "Emlak vergisi sisteminin değerlendirilmesi ve yeni düzenlenme önerileri" // İstanbul-2021, 105 s.
10. Yüksel, C. (2021) "Kamu Maliyesi özet ders notları// İstanbul72 s.
11. Bogachev, S.V. "Real estate tax: foreign experience"// Moscow- No. 4 (187) 2020, 6 p.
12. Dementieva, M. A. (2019) Zakharova A. V., "Wholesale taxation of real estate of individuals in foreign countries and its application in Russia"// Moscow-2019., 8 p.

**Rəyçi: i.e.d. Mübariz Bağırov**

Göndərilib: 27.03.2022 Qəbul edilib: 30.04.2022

DOI: https://www.doi.org/10.36719/2663-4619/78/178-182

**Günəş Azər qızı Azərli**
Bakı Dövlət Universiteti
magistrant
gunesazerli@mail.ru

# AZƏRBAYCAN RESPUBLİKASINDA SOSİAL TURİZMİN İNKİŞAF DİNAMİKASI VƏ ƏSAS AMİLLƏRİ

**Xülasə**

Azərbaycanın sosial müdafiə sistemi 1990-cı illərdə və 2000-ci illərin əvvəllərində az dəyişmişdir. O, sosial sığorta, sosial yardım və pulsuz xidmətlər kimi sosial müdafiə komponentlərini özündə birləşdirən sovet yanaşmasını davam etdirdi. Kommunizm dövründə uşaq bağçaları və sanatoriya yolları kimi bir çox sosial yardım proqramları dövlət sənayesi və müəssisələri üçün bağlandı. Bu ərazilərdə çalışan insanların ailələri pulsuz müalicə, mənzil və güzəştli avtomobil almaq hüququna malik idi. Bir çox müəssisələrin bağlanması, sənaye transformasiyası, iqtisadiyyatın yenidən qurulması, məşğulluğun xarakterinin dəyişməsi işçiləri sosial müdafiəsiz və adi imtiyazlardan məhrum etdi. İşsizlərin əksəriyyətinin iş tapdığı inkişaf etməkdə olan xidmət sektoru heç bir sosial müavinət təklif etmirdi. Bu, pulsuz sosial yardım proqramlarının əsas maliyyə mənbəyini təmin edirdi. Bununla belə, qeydiyyatı olmayan şəxslərin ayda nə qədər qazandığını və nə qədər vergi ödədiyini təxmin etmək çətindir.
***Açar sözlər:*** *turizm, inkişaf dinamikası, iqtisadiyyat, sosial müdafiə, sənaye müəssisələri*

**Gunesh Azar Azarli**

## Development dynamics and main factors of social tourism in the Republic of Azerbaijan

**Abstract**

Azerbaijan's social protection system has changed little in the 1990s and early 2000s. He continued the Soviet approach, which included components of social protection such as social insurance, social assistance and free services. During the communist era, many social assistance programs, such as kindergartens and sanatorium roads, were closed to state-owned industries and enterprises. Families of people working in these areas were entitled to free medical treatment, housing and a discounted car. This event eventually led to the disappearance of trade unions. The emerging service sector, where the majority of the unemployed found work, did not offer any social benefits. This provided the main source of funding for free social assistance programs. However, it is difficult to estimate how much unregistered individuals earn per month and how much they pay in taxes.
***Key words:*** *tourism, development dynamics, economy, social protection, industrial enterprises*

## Giriş

Bu gün bizim istifadə etdiyimiz turizm anlayışının formalaşması XIX əsrə qədər gedib çıxır. Sözü gedən dövrdə əhalinin əksəriyyətinin məzuniyyət imkanları çox məhdud idi, belə ki, bazar günləri də daxil olmaqla hər gün işə getməli olan işçilər üçün tətillər keçirilmirdi və turizm yalnız cəmiyyətin yuxarı təbəqələri üçün əlçatan idi. Sosial turizm üzrə islahatlar 1936-cı ildə Beynəlxalq Əmək Təşkilatı (BƏT) tərəfindən Ödənişli Tətil Konvensiyasının qəbul edilməsi ilə başladı. Bu konvensiyanın mahiyyəti 1948-ci il Ümumdünya İnsan Hüquqları Bəyannaməsində öz əksini tapmışdır.

Sosial turizm anlayışı dövlət tərəfindən həssas qrup və ya xüsusi diqqət tələb edən sosial qruplar üçün təmin edilən istirahət imkanları deməkdir. Bura aztəminatlı ailələr, uşaqlar və tələbələr, əlillər və digər sosial qruplar daxildir. Sosial cəhətdən həssas insanlar büdcə vəsaitləri və digər yardımlar hesabına müvafiq turizm imkanlarından yararlana bilirlər.

## Əsas hissə

1990-cı illərdə və 2000-ci illərin əvvəllərində Azərbaycanın sosial müdafiə sistemi az dəyişib. O, sosial sığorta, sosial yardım və pulsuz xidmətlər kimi sosial müdafiə komponentlərini özündə birləşdirən sovet yanaşmasını davam etdirib. Kommunizm dövründə dövlət sənaye və müəssisələrinə uşaq bağçaları və sanatoriya yolları kimi bir çox sosial yardım proqramları bağlanırdı. Bu yerlərdə

çalışan insanların ailələri pulsuz müalicə, ev və güzəştli avtomobil almaq hüququna malik idilər. Bir çox müəssisələrin bağlanması, sənaye transformasiyası, iqtisadiyyatın yenidən qurulması və məşğulluğun xarakterinin dəyişməsi işçiləri sosial müdafiəsiz qoydu və onları adi güzəştlərdən məhrum etdi. Bundan əlavə, ölkədə sənaye fabriklərinin dağılması bir çox insanı müxtəlif xidmət sahələrində işləməyə və ya öz-özünə işlə məşğul olmağa məcbur etdi. Bu hadisə sonda həmkarlar ittifaqlarının yox olmasına gətirib çıxardı. İşsizlərin əksəriyyətinin iş tapdığı inkişaf etməkdə olan xidmət sektoru heç bir sosial müavinət təklif etmirdi. Bu, ödənişsiz sosial yardım proqramları üçün əsas maliyyə mənbəyini təmin edirdi. Bununla belə, qeydiyyatdan keçməyən şəxslərin aylıq nə qədər qazandığını və nə qədər vergi ödədiyini təxmin etmək çətindir.

Qeydiyyatdan keçməyən insanların kiçik azlığının vergi ödəmək və yığımı əhəmiyyətli dərəcədə artırmaq üçün kifayət qədər qazanacağını gözləyə bilərik (Əlirzayev, 2013 :87). Eyni zamanda, yoxsulluğun təbiətinin dəyişməsi və yoxsul ailələrin müəyyən edilməsi üçün yeni meyarlar sosial müdafiə sisteminə həssas insanların kateqoriyalarını düzgün müəyyən etməyə imkan verməmişdir. Sovet dövründən əvvəl yoxsulluq homojen idi. Yoxsulların böyük əksəriyyəti çoxlu sayda himayəsində olan ailələr, pensiyaçılar və tək analar idi. Bu, hökumətə asanlıqla müəyyən edilə bilən kateqoriyalar vasitəsilə sosial müdafiəni təmin etməyə imkan verdi. Bundan əlavə, sosial müdafiəyə ehtiyacı olan şəxslərin gəlirlərinin yoxlanılması, hökumətin bütün məşğulluğu təmin etdiyi mərkəzləşdirilmiş planlı iqtisadiyyatın xarakterinə görə çətin deyildi. Lakin müstəqillik əldə edildikdən sonra yoxsulluq ölkə daxilində getdikcə heterojen xarakter almışdır və demoqrafik xüsusiyyətlər yoxsulluğun zəif determinantına çevrilmişdir.

Azərbaycanda mövcud sosial müdafiə sistemi əsasən iki proqrama bölünür: sosial sığorta və sosial yardım. Sosial sığorta müavinətləri (məsələn, qocalıq, işsizlik, xəstəlik) məşğul əhalinin ödədiyi sosial sığorta haqları hesabına maliyyələşdirilir. Bu cür müavinətlər yuxarıda qeyd olunan hadisələr baş verdikdə ev təsərrüfatlarını və fərdləri yoxsulluqdan qoruyur. Uşaq müavinətləri, natura şəklində müavinətlər, ünvanlı sosial yardımlar və əlilliyə görə müavinətlər kimi sosial transfertlər sığortaolunmaz xarakter daşıyır və dövlət büdcəsindən maliyyələşdirilir. Bu cür sosial yardım proqramlarının əsas məqsədi yoxsulların minimum istehlak səviyyəsini saxlamasını təmin etmək üçün resursları yenidən bölüşdürməkdir. Belə islahatların başlanması ilə Azərbaycan sosial sığorta ödənişlərinin qeydiyyatı və həyata keçirilməsində böyük irəliləyiş əldə edib (Əlirzayev, 2013:87).

İnkişaf etmiş ölkələrin təcrübəsi sübut edir ki, son vaxtlar dünya iqtisadiyyatının sürətinə təsir edən güclü dövlətlərdən biri də turizm sahəsidir. Onun inkişafı qəbul edən ölkənin büdcələrinin formalaşmasına və ticarət balansının sabitləşməsinə güclü təsir göstərir. Azərbaycan iqtisadiyyatının qarşısında duran əsas problemlərdən biri də ölkənin inkişafını təmin etmək üçün neft gəlirlərindən səmərəli istifadə etməklə bu sahənin inkişaf məsələlərinin həllidir. Onu da qeyd etmək lazımdır ki, istənilən ölkədə yüksək inkişaf səviyyəsi yalnız regionların inkişafını təmin etməklə əldə edilir. Ona görə də respublikada qeyri-neft sahələrinin inkişafı dövlət siyasətinin prioritet istiqamətlərindən biridir.

Müasir dövrdə Azərbaycanın sosial-iqtisadi inkişafı bazar infrastrukturunun fəal formalaşdırılması və yeni idarəetmə modelinə keçidlə səciyyələnir. Bu məqsəd regionların sosial-iqtisadi siyasətinin mühüm tərkib hissələrindən birinə həsr edilmişdir. Lakin sosial-iqtisadi inkişaf siyasəti mürəkkəb olduğundan regionlarda infrastrukturun fəaliyyətinə daim diqqət yetirilir. Müasir dövrün tələbləri ilə respublikanın uzunmüddətli inkişafına nail olmaq üçün müxtəlif proqram və layihələrin tərtibi və layihələri ən məqsədyönlü üsuldur.

Sosial sferanın əsas sahələrindən biri olan turizmin sosial-iqtisadi strukturunu təsvir edərkən qeyd etmək lazımdır ki, yalnız bazar prinsipləri əsasında hərəkət etməklə müəyyən sosial tələbatların ödənilməsi mümkün deyil. Belə tələblərə məhsuldar istehsal və xidmətlər daxildir, cəmiyyətin, xüsusən də onun tabeliyində olanların gələcək inkişafı bu ehtiyacları ödəmədən mümkün deyildir. Turizm xidmətlərinin hərəkətverici qüvvəsi sayılan kommersiya, sosial, nəqliyyat, mehmanxana və informasiya kompleksləri turizm sənayesinin əsas hissəsi hesab olunur. Turizm, 1990-cı illərdə və 2000-ci illərin əvvəllərində Azərbaycanın sosial müdafiə sistemi az dəyişmişdir. O, sosial sığorta, sosial yardım və pulsuz xidmətlər kimi sosial müdafiə komponentlərini özündə birləşdirən sovet yanaşmasını davam etdirmişdir. Kommunizm dövründə dövlət sənaye və müəssisələrinə uşaq bağçaları və sanatoriya yolları

## Nəticə

Ümumilikdə edilən bu vergi və gömrük güzəşt paketləri ilə həm pandemiya həm də postpandemiya dövründə sahibkarlıq subyektlərinin dəstəklənməsi nəzərdə tutulur.Bu cəhəttən edilən güzəştlər vasitəsi ilə sahibkarlıq subyektləri həm xərclərini azaldacaq,həm də zərərlərini qısa zaman ərzində bərpa edə biləcəklər.

Təbii ki, hazırda pandemiyanın səngiməsi də sahibkarlıq subyektlərinə öz təbii müsbət təsirini göstərməkdədir.Ancaq qarşıdakı period üçün vergi və gömrük mexanizmi vasitəsi ilə sahibkarlıq subyektlərini stimullaşdırmaq mümkündür.Bunun üçün bir sıra əsas istiqamətlər araşdırılmalıdır :

- Pandemiyadan sonra beynəlxalq təcrübədə sahibkarlıq subyektlərinin ümumi vəziyyətinin təhlili
- Sahibkarlıq subyektlərinin inkişafını stimullaşdıran vergi siyasətinə ölkədə həyata keçirilən sosial – iqtisadi siyasətin ayrılmaz tərkib hissəsi kimi yanaşılması
- dövlətin vergi sistemi ilə pul-kredit sisteminin qarşılıqlı əlaqəsinin xarakterizə edilməsi və bu əlaqələrin səmərəliliyinin yüksəldilməsi;

Sahibkarlıq subyektlərində vergi və gömrük dərəcələrinin nəzəri cəhətlərinin və vergilərin istehsal proseslərinə təsirinin öyrənilməsi çox əhəmiyyətlidir.Həmçinin, əcnəbi ölkələrin vergi sistemlərinin öyrənilməsi əldə olunan nəticələrin daha etibarlı olmasına təkan verə bilər.

## Ədəbiyyat

1. Niftullayev V. (2002) Sahibkarlığı əsasları. Bakı, 314 s.
2. Azərbaycan respublikası Sahibkarlıq fəaliyyəti haqqında Qanun (15.12.1992-ci il )
3. Məmmədov R. Sahibkarlıq fəaliyyətinin dövlət tənzimlənməsi. Bakı, 2019, 290 s.
4. Hacızadə N. Pandemiya dövründə Azərbaycanda xarici ticarətin vəziyyəti və diversifikasiyası. Bakı, 2021, 290 s.
5. Məmmədova N. və N.Nəriman. Koronavirus (covid-19) pandemiyasının azərbaycanda sahibkarlığa təsiri. Bakı, 2020, 290 s.
6. Məmmədov R. Sahibkarlıq fəaliyyətinin dövlət tənzimlənməsi. Bakı, 2019, 290 s.
7. Rzayev P. Sahibkarlıq fəaliyyyətinin stimullaşdırılmasında vergi tənzimlənməsinin rolu. Bakı, 2021, 390 s.
8. Əliyev S.Bank sektorumuz pandemiya və müharibə dövründə. Bakı, 2021, 290 s.
9. Həbibi H.Sahibkarlığın əsasları. Bakı, 2019, 280 s.
10. Məmmədov R. Sahibkarlıq fəaliyyətinin dövlət tənzimlənməsi. Bakı, 2020, 290 s.
11. Mərkəzi Bankın normativ xarakterli qərarı.(30.09.2020-ci il)
12. Banklar və Biznes qəzeti,"Pandemiya dövründə Azərbaycan iqtisadiyyatında hansı işlər görülmüşdür?",Bakı-2021
13. İmanov Ə.Kiçik sahibkarlıq. Bakı, 2009, 280 s.
14. Ganglin.P and Farah.N ," Innovative Finance, Technological Adaptation and
15. SMEs Sustainability: The Mediating Role of Government Support during Covid-19 Pandemic" , 2021, 290 p.
16. Ganglin.P and Farah.N . Innovative Finance, Technological Adaptation and
17. SMEs Sustainability: The Mediating Role of Government Support during Covid-19 pandemic, 2021, 280 p.
18. Konstantin K. Some questions about the impact of the covid-19 pandemic on the development of business entities. 2020, 270 p.

**Rəyçi: i.e.d. Mirələm Həsənov**

Göndərilib: 13.03.2022 Qəbul edilib: 17.04.2022

# TƏBİƏT ELMLƏRİ

## NATURAL SCIENCES

DOI: https://www.doi.org/10.36719/2663-4619/78/220-225

**Yasin Qaibqulu oğlu Gözəlov**
Heyvandarlıq Elmi-Tədqiqat İnstitutu
Azərbaycan / Göygöl
gozelov.yasin@mail.ru
**Mehri Rafael qızı Xəlilova**
Heyvandarlıq Elmi-Tədqiqat İnstitutu
Azərbaycan / Göygöl
me-can@mail.ru

# DOVŞANÇILIQDA XƏTTARASI HİBRİDLƏŞMƏDƏN İSTİFADƏ ETMƏKLƏ ALINAN BALALARDA İRSƏN KEÇMƏ, MƏHSULDARLIQ İNDEKSİ VƏ SELEKSİYA SƏMƏRƏLİLİYİNİN ÖYRƏNİLMƏSİ

**Xülasə**

Dovşançılıqda təmizlikdə yetişdirmə və çarpazlaşmadan istifadə edərək yeni cins yaratma zamanı aparılan seleksiya damazlıq işinin özünün xüsusiyyətləri vardır. Dovşançılıqda yetişdirmənin iki üsulu tətbiq edilir. Təmizlikdə yetişdirmə, Çarpazlaşdırma.

Təmizlikdə yetişdirmə zamanı erkək və dişi dovşanlar eyni cinsdən olur. Yüksək məhsuldar dovşan cinsləri üzərində aparılan damazlıq işi üçün təmiz yetişdirmə üsulunun böyük əhəmiyyəti vardır. Bu üsulun bioloji xüsusiyyəti bundadır ki, təmiz dovşan cinsləri özlərinə xas olan əlaməti və keyfiyyətlərini nəslinə sabit şəkildə irsən verir və həmin irsi keyfiyyəti daha da möhkəmlədir.

Dovşançılıqda hər hansı bir cinsi təmizlikdə yetişdirdikdə əsas cinsin yüksək məhsuldarlıq və damazlıq keyfiyyəti mühafizə edib, möhkəmləndirmək, cinsin sayını artırmaq, cinsi gələcəkdə daha da təkmilləşdirmək kimi məqsədləri qarşıya qoyulur.

Çarpazlaşdırma zamanıyüksək keyfiyyətli konstitusiya, eksteryerli və məhsuldarlığa malik olan dovşan cinslərindən istifadə edərək yeni mələzlər almaq olar. Alınan nəsldə balalar daha qabarıq əlamətlərə görə seçilir və arzu olunan tiplər yaradılır.

Yuxarıda deyilənləri əsas götürərək, çarpazlaşma zamanı növbəti qaydalar nəzərə alınmışdır.Uyğun gələn cinslər seçilmiş, daha məhsuldar heyvanlardan istifadə edilmiş,düzgün hədəf müəyyən edilmiş, daha keyfiyyətli əlamətlər möhkəmləndirilmişdir.

***Açar sözlər:*** *yetişdirmə, dovşan cinsləri, yeni dovşan tipləri, irsən keçmə, məhsuldarlıq indeksi. seleksiya səmərəliliyi*

**Yasin Gozalov Gaibgulu**
**Mehri Khalilova Rafael**

# Study of heredity, fertility index and selection efficiency in chicks obtained using risk hybridization in rabbit breeding

**Abstract**

In rabbit breeding, the selection and breeding work carried out during the creation of a new breed using purebred breeding and crossbreeding has its own characteristics. There are two methods of breeding rabbits. Cultivation in purity, Crossing.

Male and female rabbits are of the same sex during *purebred breeding. A clean breeding method is of great importance for* breeding on high-yielding rabbit breeds. The biological feature of this method is

that purebred rabbits inherit their characteristic traits and qualities from their offspring in a stable way, and this hereditary quality is further strengthened.

In rabbit breeding, the goal is to maintain and strengthen the high productivity and breeding quality of the main breed, to increase the number of breeds, and to further improve the sex in the future.

During crossbreeding, new breeds can be obtained using rabbit breeds with high quality constitution, exterior and productivity. In the obtained offspring, the offspring are selected according to the more prominent features and the desired types are created.

Based on the above, the following rules were taken into account during crossing. Suitable breeds were selected, more productive *animals were used, the correct target was set, and better quality traits were strengthened.*

***Key words:*** *breeding, rabbit breeds, new types of rabbits, inheritance, fertility index. selection efficiency*

## Giriş

Dünyada ən qlobal problemlərindən biri bu gün əhalinin ərzaq məhsulları ilə etibarlı təminatıdır. Azərbaycan Respublikasında əhalinin etibarlı ərzaq təminatı Dövlətin iqtisadi siyasətinin başlıca istiqamətlərindən birini təşkil edir.

Etibarlı ərzaq təminatı cəmiyyətin hər bir üzvünün əsas ərzaq məhsullarına ən azı fizioloji normalara əsaslanan tələbatından irəli gələn ehtiyacının tam ödənilməsi deməkdir və bunun üçün milli səviyyədə davamlı olaraq iqtisadi və sosial tədbirlər həyata keçirilməkdədir.

Azərbaycan Respublikası Prezidenti İlham Əliyevin 6 dekabr 2016-cı il tarixli 1138 nömrəli Fərmanına əsasən milli iqtisadiyyat və iqtisadiyyatın 11 sektoru üzrə 12 strateji yol xəritəsinin işlənməsi nəzərdə tutulmuşdur. Həmin sənədlərdən biri olan "Azərbaycan Respublikasında kiçik və orta sahibkarlıq səviyyəsində istehlak mallarının istehsalına dair Strateji Yol Xəritəsi"ndə ölkədə kiçik və orta sahibkarlığın (KOS) vəziyyəti təhlil edilir, xüsusilə bu sahədə görülmüş işlər, həyata keçirilmiş islahatlar, mövcud statistika barədə ətraflı məlumat verilir. Həmin yol xəritəsində 2020-ci ilədək strateji, 2025-ci ilədək olan dövr üçün uzunmüddətli və 2025-ci ildən sonrakı dövr üçün hədəf baxış əhatə edilir. Yol xəritəsində adıçəkilən baxışlarda nəzərdə tutulan məqsədlərə nail olmaq üçün 5 strateji hədəf müəyyən edilmişdir. Bu strateji hədəflərə KOS fəaliyyəti üçün biznes mühitinin və tənzimləyici bazanın yaxşılaşdırılması, KOS subyektlərinin maliyyə resurslarına sərfəli və səmərəli çıxışının təmin edilməsi, onların beynəlmiləlləşdirilməsi və xarici bazarlara çıxış imkanlarının artırılması və s. aiddir.

Azərbaycanda dovşançılıq heyvandarlığın yeni bir sahəsi olaraq inkişaf etməkdədir. Bu sahənin perspektivliliyi dovşanların yüksək balavermə qabiliyyəti, tezyetişkənliliyi, ətinin yüksək qidalılığa malık olması, dərisi və tükünün qiymətli xammal olmasıdır. Belə ki, bir il ərzində bir dovşandan 60-70 kq ət, 25-30 dəri və 1 kq-a yaxın tük almaq olur (1, 2).

Dövlət Statistika Komitəsinin 2020-ci il yanvarın 1-ə olan məlumatına görə ölkədə 28511 baş (onlardan 2350 başı ana dovşanlar) dovşan mövcud olmuşdur. Dovşançılıq, Gəncə-Qazax, Şəki-Zaqatala, Quba-Xaçmaz, Aran bölgələrində və Naxçıvan MR-də geniş yayılmışdır. Bu bölgələrdə əsasən, ətlik istiqamətli Kaliforniya cinsi, Yeni Zenlandiya cinsi, ətlik, xəz-dəri istiqamətli Ağ Velikan cinsi, Gümüş cinsi, Boz Velikan, Yapon cinsi, Marder cinsi, Holland cinsi dovşanı yunluq istiqamətli Anqora cinsi, dekorativ istiqamətli Dekorativ Karlik cinsi yetişdirilir (3, 4).

## Elmi tədqiqat işinin material və metodikası

Dovşançılıqda yeni tiplərin alınması istiqamətində aparılan elmi tədqiqat işlərində yetişdirmənin müxtəlif üsullarından istifadə etmək lazım gəlir. Burada, seçmə əsas götürülərək taylaşdırma aparılır. Aparılan elmi tədqiqat işində dovşanlar uyğun olaraq yetişdirilmişdir (Aleksandrov, 2001: 256).

Bu məqsədlə, xəz dəri-ətlik istiqamətli yeni dovşan tiplərinin yaradılması istiqamətində Heyvandarlıq Elmi Tədqiqat İnstitutunun "Dovşançılıq Təsərrüfatında" elmi tədqiqat işi aparılmışdır. Tədqiqat zamanı Dekorativ Karlik, Kaliforniya, Yapon və Yeni Zelandiya dovşan cinslərindən istifadə edilmişdir. Tədqiqat zamanı alınan balalarda irsən keçmə, məhsuldarlıq indeksi və seleksiya səmərəliliyi öyrənilmişdir.

Kənd təsərrüfatı heyvanlarının damazlıq işində nəzərə alınan əsas genetik göstəricilər - (parametrlər) irsilik əmsalı, təkrarlanma, əlamətlərin korelyasiyası, reqresiya, prepotentlik (törədicilərin öz əlamətlərini yüksək sabitliklə nəslinə ötürməsi), genetik oxşarlığın və homoziqotluğun artması

əmsalları, seleksiya (seçmə) diferensialı, seleksiya səmərəliliyi, məhsuldarlıq indeksi, eynilik dərəcəsi və s. göstəricilər hesabedilir (Zvanerov, 2011: 80), (Lapin, 2013: 121), (Balakirov, Tinayev, 2001: 256), (Ziper, 2007: 94).

***İrsən keçmə*** fenotipik dəyişgənliyin bir növü olmaqla, genotipdən çox asılıdır, daha doğrusu genetik fərqlənməyə görə heyvanlar bir-birindən irsiyyətcə seçilirlər.

Burada irsən keçmənin (X) ölçüsü genotipin (G) fenotipə (F) olan nisbəti ilə götürülür və faizlə ifadə olunur.

İrsən keçmə aşağıdakı düstura hesablanır.

$$X = \frac{G}{F} x100$$

Belə bir üsul irsi keçmə və digər kəmiyyət üsullarının hazırlanmasına və irsən keçmə əmsalı hesablanmasına imkan yaradır. Hal-hazırda irsən keçmə heyvandarlıq təcrübəsində geniş istifadə edilir.

***Seleksiya səmərəliliyi*** gələcək nəslin valideyinlərə nisbətən məhsuldarlıq və digər əlamətlərin aparılan seleksiya nəticəsində üstün olması deməkdir.

Aparılan seleksiya damazlıq işinin səmərəli olub-olmamasını müəyyən etmək üçün İohansen təklif etmiş olduğu düsturdan istifadə etmək lazım gəlir.

$$S_s = \frac{Sdxh^2}{\dot{I}}$$

Burada, $S_{səm}$-seleksiya səmərəlılıyi, **S*d***-seleksiya diferensialı, $h^2$-irsən keçmə əmsalı, ***İ***- nəsil arasında olan müddətdir (Sedov, 2010: 173), (Komlaçkiy, 2014: 238).

***Məhsuldarlıq indeksi***müəyyən dövr ərzində heyvanların (neçə dəfə) böyümə dinamikasını göstərir.

Məhsuldarlıq indeksi (**Mİ-i**) ayda bir dəfə faizlə və ya dəfə ilə hesablanır.

$$M\dot{I} = \frac{SÇ}{\dot{I}Ç} x100;$$

$$M\dot{I} = \frac{SÇ}{\dot{I}Ç}$$

Burada, ***SÇ***-son çəki, ***İÇ***-ilkin çəkidir (Ульихин, 2004: 256), (Xakimov, Ynuşeva, 2013: 43).

.

### Aparılmış tədqiqat işinin təhlili və alınan nəticələr

**Tədqiqat işində məqsəd** istifadə olunan cinslərin yüksək məhsuldarlıq və damazlıq keyfiyyətini mühafizə edib, möhkəmləndirmək, sayını artırmaq, yeni dovşan tipləri yaratmaq, onların boy və inkişafını öyrənilməkdən ibarətdir. Bu məqsədlə çarpazlaşdırma aparılmış, 03 may 2021-ci il tarixdə $F_1$ nəsil mələz Dekorativ Karlik×Kaliforniya erkək dovşanla, $F_1$ nəsl mələz Yapon×Yeni Zelandiya dişi dovşandan 5 baş bala alınmışdır. $F_2$ nəsil balaların atası qəhvəyi rəngli $F_1$erkək dovşan, anası isə $F_1$ nəsl ağ rəngli dovşandır (şəkil 1).



**Şək.1. Dekorativ karlik X Kaliforniya mələzi**



**Yapon X Yeni Zelandiya mələzi**

Belə ki, xəttarası hibridləşmədən alınan 1 baş balanın rəngi qəhvəyidir, boynunda ağ zolaqlar vadır, qabaq ayaqlarının ucu ağdır, ətliyə meyillidir, dərisi xəzdir, Digər balalar bir tiplidir, rəngi bozdur. Alınan hibrid balanın göstəriciləri ana və atası ilə müqayisə edilmişdir (cədvəl 1; cədvəl 2; şəkil 2).

Xəttarası hibridləşmənin aparılmasında məqsəd, dovşanların bədəninin müxtəlif nahiyyələrində qanunauyğun rəng çalarlarının əldə edilməsidir.

**Cədvəl 1. Xəttarası hibridləşmədən alınan balanın qiymətləndirilməsi**

| S/S | Göstəricilər | 3 aylıq yaşda, dişi | |
|---|---|---|---|
| 1 | Canlı kütləsi, qr | 1980 | Xəttarası hibridləşmədən alınan balanın rəngi qəhvəyidir, boynunda və qabaq ayaqlarında ağ zolaqlar vadır. |
| 2 | Bədənin uzunu, sm | 38 | |
| 3 | Döş qucumu, sm | 28 | |
| 4 | Döşün eni, sm | 8 | |
| 5 | Arxanın eni, sm | 11 | |
| 6 | Alının eni, sm | 5 | |
| 7 | Alının uzunu, sm | 8 | |
| 8 | Qulağın eni | 5,5 | |
| 9 | Qulağın uzunu | 8,5 | |





**Şək.2.Xəttarası hibridləşmədən alınan bala**

**Cədvəl 2. Xəttarası hibridləşmədə istifadə olunan dovşan cinslərinin genetik kodu**

| S/S | Cinslərin adı | Genetik kod |
|---|---|---|
| 1 | Dekorativ Karlik | $C^m C^m$ |
| 2 | Kaliforniya | $C^H C^H$ |
| 3 | Yapon | Aa |
| 4 | Yeni Zelandiya | cc |
| 5 | Hibrid balanın genetik kodu | $C^m C^m cc$ |

Əlamətlərin dəyişmə dinamikasından belə aydın olur ki, alınan balada fenotipik olaraq əsasən, Dekorativ Karlik və Yeni Zelandiya dovşan cinslərinin rəngləri dominant olaraq (***$C^m$ $C^m$ və cc dominant genlər***) üstünlük təşkil edir. Rənglərin nəslə keçmə əmsalı yəni, Dekorativ Karlik (Marder) dovşan cinsinə görə 93,75%, Yeni Zelandiya dovşan cinslərinə görə isə 6,25%-dir. Yəni, alınan hibrid bala yeni tipdir (14, 15, 16, 17, 18).

Xəttlərarası hibridləşmə alınan nəsillərdə seleksiya differensialı, məhsuldarlıq indeksi, müəyyən edilmişdir (cədvəl 3; şəkil 3).

**Cədvəl 3. Məhsuldarlığın genetik əsaslarının nəticələri**

| Göstəricilər | Yaşı | | | Əlamətlərin irsən keçməsi, % | | Məhsuldarlıq indeksi, dəfə | |
|---|---|---|---|---|---|---|---|
| | 3 ayda anada | 3 ayda atada | 3 ayda balada | Anadan | Atadan | Anadan | Atadan |
| Canlı kütləsi, kq | 1,295+ 2,3 | 1,425+ 2,5 | 1,980 | 52,89 | 38,9 | 1,52 | 1,38 |
| Bədənin düz uzunu, sm | 29,0+ 0,5 | 32,0+ 0,8 | 38,0 | 31,0 | 18,0 | 1,31 | 1,18 |
| Döşün eni | 6,0+ 0,35 | 7,0+ 0,38 | 8,0 | 33,0 | 14,0 | 1,33 | 1,14 |
| Döş qucumu | 21,0+ 0,51 | 25,0+ 0,53 | 28,0 | 33,3 | 12,0 | 1,33 | 1,12 |
| Arxanın eni | 7,0+ 0,9 | 9,0+ 1,3 | 11 | 57,1 | 22,0 | 1,57 | 12,22 |
| Qulağın uzunluğu | 6,0+ 0,9 | 6,5+ 1,1 | 8,5 | 41,6 | 30,0 | 1,41 | 1,41 |
| Qulağın eni | 4,5+ 0,9 | 4,8+ 1,0 | 5,5 | 22,2 | 14,5 | 1,22 | 1,22 |
| Davamı | | | | | | | |
| **Göstəricilər** | **Yaşı** | | | **Seleksiya səmərəliliyi, fərq** | | **Nisbi artım balada, %** | |
| | **3 ayda anada** | **3 ayda atada** | **3 ayda balada** | **Anadan** | **Atadan** | **Anadan** | **Atadan** |
| Canlı kütləsi, kq | 1,295+ 2,3 | 1,425+ 2,5 | 1,980 | 0,685 | 0,555 | 52,8 | 38,94 |
| Bədənin düz uzunu, sm | 29,0+ 0,5 | 32,0+ 0,8 | 38,0 | 9,0 | 6,0 | - | - |
| Döşün eni | 6,0+ 0,35 | 7,0+ 0,38 | 8,0 | 2,0 | 1,0 | - | - |
| Döş qucumu | 21,0+ 0,51 | 25,0+ 0,53 | 28,0 | 7,0 | 3,0 | - | - |
| Arxanın eni | 7,0+ 0,9 | 9,0+ 1,3 | 11 | 4,0 | 2,0 | - | - |
| Qulağın uzunluğu | 6,0+ 0,9 | 6,5+ 1,1 | 8,5 | 2,5 | 2,0 | - | - |
| Qulağın eni | 4,5+ 0,9 | 4,8+ 1,0 | 5,5 | 1,0 | 0,7 | - | - |




**Şək. 3. 3 aylıq yaşda canlı kütlənin müqayisəli göstəriciləri**

**Nəticə**

Tədqiqat işinin sonunda əldə olunan təcrübə materialları əsasında aşağıdakı nəticələr alınmışdır:

1.Xəttarası hibridləşmədən alınan balanın fenotipik qiymətləndirilməsi zamanı Dekorativ Karlik və Yeni Zelandiya dovşan cinslərinin rəngləri dominant olaraq (***$C^m$ $C^m$ vəcc dominant genlər***) üstünlük təşkil edir. Rənglərin nəslə keçmə əmsalı yəni, Dekorativ Karlik (Marder) dovşan cinsinə görə 93,75%, Yeni Zelandiya dovşan cinslərinə görə isə 6,25%-dir.

2.Əlamətlərin irsən keçmə əmsalı canlı kütləyə görə anadan 52,89%, atadan 38,9%, bədənin düz uzununa görə uyğun olaraq 31%; 18%, döşün eninə görə 33%; 14%, döş qucumuna görə 33,3%; 12% və s. olmuşdur.

3.Alınan balaların canlı kütləsi anadan 0,52, atadan 0,38 dəfə, bədənin düz uzunu uyğun olaraq 0,31; 0,18 dəfə, döşün eni 0,33; 0,14 dəfə çox olmuşdur.

4.Alınan balanın 3 aylıq yaşda canlı kütləsi 1980 qr olmaqla, ata xəttindən (ata xəttin canlı kütləsi 1425 qr-dır) 555 qr, ana xəttindən (ana xəttin canlı kütləsi 1295 qr-dır) isə 685 qr daha çoxdur.

5.Nəticədə, alınan balalar anaya nisbətən 52,8% daha çox, ataya nisbətən isə 38,94% daha çox böyümüşdür.

**Ədəbiyyat**

1. www.e-qanun.az/framework/34254
2. files.preslib.az/site/laws8.pdf
3. https://azertag.az xeber Kechen_olkede_dir...
4. https://vk.com krolist
5. Abbasov,S.A.(2011).Livestock.Textbook.Ganja :, Janja Polygraphy OJSC, 215 p.
6. Aleksandrov, V.A. (2001). Leporis fetura et nutria. Moscoviae: Eksmo, 256 p.
7. Balakirev N.A., E.A. Tinaeva et al (2007). Lepus prolis. Moscow: KolosS, 232 p.
8. Zvonarev N.M. (MMXI). Lepus utiliter admissarius. Gignit, pascens, cura. Moscoviae: Tsentrpoligraf, 80 p.
9. Ziper , A.F. (2007). Lepores fetum. Moscoviae: AST, 94 p.
10. Komlatsky V.I. [et etc.]. (2014). Lepus efficax fetura pro baccalariis Facultatis Zootechnologiae et Management. Rostov-on-Don:, Phoenix, 238s.
11. Lapin, Yu.A. (2013). Lepores. Descriptio. Prolem. Curae. Moscow: Phoenix, 121 p.
12. Plokhinsky, N.A. (1970). Biometrics. Moscow: Moscow University, 668 p.
13. Sedov Yu.D. (2010). Lepores. Fetura, sustentatio, cura. Rostov n/a: Phoenix, 173 p.
14. Ul'ikhin L.I. (2004). Enchiridion Rabbit Breeder. Moscow: Phoenix, 256 p.
15. Khakimov I.N., Yunusheva T.N. (2013). Gramma Delectio. De Instructionibus Methologici. Kinel:, RIC SGSKhA, 43 p.
16. Shumilina N.N. Kalugin Yu.A., Balakirev N.A. (2010). Lepus officina in fetura. doceo. Moscoviae: Kolos, 167 p.

**Rəyçi: a.e.f.d. Qafar Məmmədov**

Göndərilib: 18.02.2022 Qəbul edilib: 13.04.2022

DOI: https://www.doi.org/10.36719/2663-4619/78/226-230

**Rüfət Şaiq oğlu Novruzov**
Azərbaycan Dövlət Neft və
Sənaye Universiteti
magistrant
rufatnovruzov262@gmail.com

# ƏHƏNGDAŞI YATAQLARINDA APARILAN MÜASİR DAŞ İŞLƏRİNİN ƏTRAF MÜHİTƏ TƏSİRİNİN QİYMƏTLƏNDİRİLMƏSİ (QARADAĞ ƏHƏNDAŞI YATAĞININ TİMSALINDA)

**Xülasə**

Bu məqaləni hazırlamaqda əsas məqsəd Azərbaycan Respublikasında fəaliyyət göstərən daş karyerlərinin (Qaradağ əhəngdaşı yatağının timsalında) sənaye əhəmiyyətinin artırılması haqqındadır. Dağ işlərinin ətraf mühitə nə kimi təsiri vardır və bu təsirlərin kompleks qiymətləndirilməsi nə dərəcə də həyata keçirilir.Geoloji qiymətləndirmə işləri əsasən əhəngdaşlarının qüvvədə olan standartlara və iqtisadi səmərəliliyinə görə qiymətləndirilməsi olmuşdur. Xüsusilə Abşeron yarmadasında yerləşən mişar daşı yataqları geoloji quruluşu sadə olması, əlverişli geoloji, dağ-texniki və iqtisadi şəraitdə yerləşməsi ətraf mühitə az təsiri ilə qimətləndirilməsini mümkün edir. Dünya ölkələrinin təcrübələri ilə müqayisəli təhlili.

***Açar sözlər:*** *Karyer, Qaradağ, əhəngdaşı, qiymətləndirmə, ətraf mühit, geoloji, dağ-texniki, problem*

**Rufat Shaig Novruzov**

## Environmental impact assessment of modern mining operations in limestone deposits (on the example of Garadagh limestone deposit)

**Abstarct**

The main purpose of this article is to increase the industrial significance of stone quarries (in the example of the Garadagh limestone deposit) operating in the Republic of Azerbaijan.What is the impact of mining on the environment and to what extent is a comprehensive assessment of these effects carried out.The geological assessment was mainly based on the assessment of limestone according to current standards and economic efficiency. In particular, the geological deposits of sawdust deposits located on the Absheron Peninsula are simple, their location in favorable geological, mining and economic conditions allows them to be valued with little impact on the environment. Consequences of low impact of career activities on the environment.

***Key words:*** *Quarry, Garadagh, limestone, assessment, environment, geological, mining-technical, problem*

## Giriş

Bəşər insanı var olduğundan təbii daşları istifadə etmiş və onlardan faydalanmışdır. İlk zamanlar ovlama ve özünü qorumaq məqsədilə çeşidli alətlər hazırlamış tarixin irəliləyən zamanlarında yaşamaq məqsədilə yaşayış binalarının inşasında istifadə etməyə başlamışdır.Faydalı qazıntıların kəşfiyyatı və tikinti-inşaat sənayesi nəinki respublika üzrə, hətta dünya üçün həyati əhəmiyyət kəsb edən dinamik və çoxşaxəli sahələrdən biridir. Bu sahə elm, texnikanı biznes və mailiyyə ilə birləşdirərək inşaat materiallarına yararlı faydalı qazıntıların kəşfiyyatını sürətləndirir. Bu sənaye sahəsi, yataqların kəşfi və təhlili, karyerlərin tikilməsi və inkişafı, istismarı və istehsalata çıxarılması, ətraf mühitə təsirinin qiymətləndirilməsi üçün ixtisas biliklərinə malik çoxlu sayda iştirakçıların, o cümlədən texnologiya və biznes üzrə mütəxəssislərin, riskləri qabaqlayan və yaradıcı şəxslərlə birgə çalışdığı bir sahədir. Karyer işi eyni zamanda yüksək mənfəət gətirən sahələrdəndir. Bu sahə bütün digər ehtiyacı olan sahələri xammalla təmin edir.Karyer işi təkcə keçmişin sənaye sahəsi deyil, o həmçinin müasir gələcək üçün böyük əhəmiyyət kəsb edir. Bu sahədə çalışmaq və onun haqqında məlumatlar toplamaq çox maraqlıdır.Bununla əlaqədar olaraq, bu məqalədə strateji əhəmiyyətli faydalı xammalın yerli

yataqlarının (Qaradağ) kompleks işlənməsinin ətraf mühitə təsirinin qiymətləndirilməsi müzakirə olunur.

**Əsas hissə**

İstənilən yataqda fəaliyyət göstərən karyerlər daş işlərinə başlamazdan öncə, qanunla müəyyən edilmiş formada ətraf mühitə təsirin qiymətləndirilməsini həyata keçirməlidir. Təbii olaraq hər bir ölkənin ətraf mühitə təsirinin qiymətləndirilməsi üçün öz müxtəlif idarəetmə qaydaları vardır, bu qaydaların bəziləri daha qətidir. Buna baxmayaraq demək olar ki, standart qiymətləndirmənin komponenetləri bir çox ölkələrdə eynidir. Bu komponentlərdən bir neçəsini qeyd etmək isdərdim:

- Bütün maraqlı tərəflər üçün problemi müəyyənləşdirmək və həllini təmin etmək imkanları;
- Layihənin bütün ekoloji, sosial və iqtisadi aspektlərinin müfəssəl ilkin və texniki tədqiqatları;
- Arzuolunmaz təsirlərin qarşısını almaq, onları minimallaşdırmaq və layihənin müsbət təsirlərini artırmaq üçün tədbirlərin müəyyən edilməsi.

Ətraf mühitə təsirin qiymətləndirilməsi karyer fəaliyyəti ilə məşğul olan müəssisələr, dövlət, yerli icra orqanları və digər maraqlı tərəflər məsuliyyətli olmalıdırlar. Buraya həmdə dövlət tərəfindən müvafiq qərarların qəbul edilməsi və qəbul olunmuş qərarların icra səviyyəsi, müddətləri daxildir. Aparılan dağ işlərinin ətraf mühitə təsirinin qiymətləndirilməsi prosesi tikinti-inşaat sənayesinin üzərinə düşən məsuliyyəti formalaşdırmalı və vaxtında icrasını təmin etmək üçün tədbirləri özündə birləşdirməlidir.

Daş karyerlərində istismar zamanı əsas nəzərə alınmalı amillərə su, səs-küy, toz, hava ilə daşınan hissəciklər, işçilərin və cəmiyyətin sağlamlığı, təhlükəsizliyi aiddir.

Qaradağ əhəngdaşı yatağı 1925-ci ildə V.Veber tərəfindən kəşf olunmuşdur.Yataq 1948-ci ildən isə açıq karyer üsulu ilə istismar olunur.

Qaradağ əhəngdaşı yatağının yerləşdiyi ərazi Böyük Qafqazın iki geomorfoloji vahidinin-Qobustan və Abşeron yarımadasının qovşağında yerləşir(Geoloji Partiya. 1979:68).



***Şəkil 1. Əhəngdaşı karyerinin görüntüsü***

Qaradağ əhəngdaşı yatağında yerləşən karyerdə dağ açılış və hasiletmə işləri bütün respublika karyerlərində işləyən alçaq pilləli sütunvari işləmə sistemi ilə relyefdən asılı olaraq yuxarıdan aşağıya doğru aparılır.

Qaradağ əhəngdaşı yatağınının sahəsində pillələrin hasiletmə işləri əmtəə daşın dib üzrə çıxışını çoxaldır və eyni zamanda faydalı qazıntı itkilərini azaldır.

Bunun nəticəsi olaraq ətraf mühitə təsirini qiymətləndirərkən əhəmiyyətli hissəsi mənfi təsirləri minimallaşdırmağa yol açır.

Karyerdə ətraf mühitin qorunması müsbət qiymətləndirilməsi üçün hazırlanan tədbirlərə əsasən istismar prosesində korlanmış torpaq sahələrinin bərpası (dağ-texniki rekultivasiya) və toz qopmanın qarşısını almaqdan ibarətdir.

Dünya təcrübəsindən buna misal olaraq Britaniya Kolumbiyasında Highland vadisində (şəkil 1) açıq üsulla istismar edilən mis mədənini qeyd etmək olar. Belə, ki mis mədənində gündə təxminən 200 000 tondan çox filiz və boş süxurları çıxaran və hər il təqribən 300 milyon futdan çox mis hasil edən ən böyük mis mədənlərindən biridir. Mədən 1960-cı ildən açılmışdır, 1980-ci ildən isə bərpa və bağlama əməliyyatlarına başlanılmışdır. Prosesin birinci hissəsi Bethlehem sahəsi üçün torpaqdan istifadənin yekun planının tərtib edilməsi olmuşdur. Bu proses bitki örtüyü üçün torpağın hazırlanması (tələb olunan yerlərdə bitki örtüyünün artımı ilə sərhədlərin müəyyən edilməsi və torpağın üst qatının örtülməsi), otların, kolların və ağacların əkilməsi, kifayət qədər bitki örtüyü yaranandan sonra torpağın monitorinqi və idarə edilməsi ilə davam etdirilir.



***Şəkil 2.Highland mis mədəni***

Karyer fəaliyyətlərində ətraf mühitə təsir göstərən proseslərdən biridə toz və havada yayılan hissəciklərdir. Beləki faydalı qatın çıxarılması zamanı və ədəd daşlarının kəsimi zamanı havaya qalxmış toz buludlarının əmələ gəlməsinə səbəb olur. Bu toz işçilərin sağlamlığına zərər verə bilər və həmçinin ətraf mühitin çirkləndirilməsi ilə nəticələnə bilər.

Dünya təcrübəsinə nəzər yetirdik də havada toz hissəciklərinin miqdarının məhdudlaşdırılması üçün bir neçə tədbirlər həyata keçirilir. Bunlara birlikdə nəzər yetirək:

→ Yolların və digər iş sahələrinin vaxtaşırı su ilə çilənməsini və ya sıxlaşdırıcı material ilə örtülməsi;

→ Emal tullantılarının toplandığı sahənin sul altında saxlanılması;

→ Xırda tullantı süxurlarının nəmləşdirməklə kipləşdirilməsi;

→ Bağlı tikililər daxilində anbarlara emal olunmalı əzilmiş, dağılmış ədəd daşlarının yığılması;

→ Süxur və emal tullantıları topalarının üzərində mümkün qədər tez bitki örtüyünün bərpa edilməsi;

→ Generatorlar və ağır avadanlıqlardan buraxılan qazlar üçün filtirlərin əlavə edilməsi.

Qaradağ karyerində toz qopmanın ətraf mühitə təsirini qiymətləndirən zaman belə bir nəticə əldə etdik ki, yuxarı sadalananlardan yalnız prosesin qarşısını almaq üçün əsas texniki tədbir yay-yaz mövsümündə işlək sahələrin sulanmasıdır.

Əlavə olaraq qeyd etmək isdərdim ki, texnoloji (süxurlar) tullantılar üçün ayrılmış sahələrin işlək sahələrə yaxın yerləşdirilməsi, gələcəkdə onların yenidən buraya nəql etdirilməsi üçün nəzərdə tutulmalıdır.

Respublikamızda mövcud olan yataqlarda ötən əsrin 30-cu illərindən başlayaraq bir neçə geoloji təşkilatlar tərəfindən mütəmadi olaraq geoloji kəşfiyyat işləri aparılmışdır. Lakin son dövlərdə bir çox yataqlarda istismarın pərakəndə və normalara riayət olunmadan aparılması, həmçinin yataqlardan istismar olunan ehtiyatlar haqqında məlumatın natamam verilməsi nəticəsində illər ərzində hərəkəti və ümumiyyətlə istismar işlərinin aparılma xüsusiyyətləri haqqında məlumatların kasadlığına gətirib çıxardır.

Bunun nəticəsi olaraq da, ətraf mühitə təsirinin qiymətləndirilməsində bir sıraçətinliklərlə qarşılaşırıq.

Dəyərləndirmə tədqiqatları aparan zaman Qaradağ yatağında əlverişli dağ-texniki şəraiti, magistral yola və mərkəzə yaxınlığı, tikinti materiallarının tələblərə cavab verməsi bu yataqda uzun illər ərzində bir çox müəssisə, təşkilat və fiziki şəxslər tərəfindən intensiv sürətdə mişar daşı üçün istismar edilə bilməsi kimi müsbət nəticəyə gəlirik.

Respublikamızda mövcud olan əhəngdaşı yataqlarının əksəriyyəti açıq üsulla istismar olunur və əsasən, daşkəsən maşınlarla hörgü daşı, üzlük plitələr, iri bloklar kəsilən kütlənin 30-50%-ə qədəri tullantıya çevrilir. Tullantılarında yaranması ətraf mühitə təsirinin yeni aspektdən dəyərləndirilməsi deməkdir. Uzun illər boyu istismar zamanı, həmin karyerlərin tullantıxanalarında və işlənmiş karyer sahələrində milyon tonlarla belə tullantılartoplanmışdır. Bunlar isə öz növbəsində tikinti materialı kimi müxtəlif sahələrdəistifadə edilə bilər.Tullantıların səciyyəvi xüsusiyyətlərindən biri də onlardan müxtəlif sahələrdə tətbiq olunmasıdır. Məsələn, əhəngdaşı sement, tikinti əhəngi, çınqıl, şüşə məmulatlarının, soda istehsalında istifadə edilə bilir; odadavamlı gil - odadavamlı məmulatlar, tikinti keramikası, tökmə qəlib hazırlanmasında və s. sahələrdə xammal kimi istifadə edilir. Lakin həmin tullantılar kifayət qədər öyrənilmədiyindən onlarkütləvi sürətdə istifadə olunmurlar. Halbuki təsərrüfatın müxtəlif sahələrində bumateriallara tələbat yüksəkdir. Abşerondakı əhəngdaşı karyerlərinin tullantısındanzavodlarında, yol tikintisində və linoleum istehsalında cüzi istifadə olunur. Yaxşı olardı ki, bu tullantılardan torpaqların şoranlaşmasının qarşısını almaq üçün, kübrə kimi də istifadə olunsun.

Karyerlərdə əmələ gələn tullantılar müxtəlif ölçülü olur. Bunlar ələkləmədən sonra sement və asfalt beton üçün doldurucu kimi işlədilə bilər. Bunların iri fraksiyasından isə bünövrə və hörgü bloklarının hazırlanmasında, narın tikinti üçün məhlul hazırlanmasında istifadə etmək olar. Karyerlərdə toplanan tullantıların istehsal dövriyyəsinə qaytarılması xammaldan kompleks istifadə olunmasına səbəb olar və xeyli iqtisadi səmərə verər. Bu həm də faydalı qazıntı itkisini azaltmaqla yanaşı, yeni karyerlərin tikilməsi lüzumunu aradan qaldırar, ekoloji mühitə müsbət təsir göstərər, xeyli miqdarda torpaq sahələri tullantılardan azad olar. Bu məsələlərin müsbət həlli üçün ətraflı tədqiqat işlərinin aparılması vacibdir.

## Nəticə

Son illər Bakı şəhərində və ümumi respublikada tikinti işlərinin geniş vüsət alınması ilə əlaqədar olaraq tikinti materiallarının (mişar daşına, quma,sementə və s.) olan tələbatı daha da artırmışdır. Bunun nəticəsi olaraq yeni yataqların kəşfi və istismarı ətraf mühitin daha çox mənfi təsirə məruz qalması deməkdir. Mənfi təsirlərin azaldılması üçün mütəmadi olaraq dağ işləri aparılan zaman ətraf mühitə təsir dairəsi və səviyyəyi qiymətləndirilməlidir. Bu məqsədlə ən düzgün qərarın alınması üçün müxtəlif alternativlərin nəzərdən keçirilməsi vacibdir. Misal üçün qeyd edim ki, bir karyer ekoloji cəhətdən həssas torpaqlardan keçdiyi halda, ən qısa və iqtisadi cəhətdən ən sərfəli başa gələn yol tikintisi, daha az mənfi təsirə malik, lakin, daha çox məsrəflə başa gələn alternativlər nəzərdən keçirilməlidir. Müvafiq olaraq, yerli əhali üçün daha yaxşı iqtisadi imkanları təmin edən çıxış yollarına üstünlük verilməlidir.

Ətraf mühitə təsirlərin qiymətləndirilməsi kimi ciddi proseslər müasir karyerlərin ətraf ərazilərdə təbii mühitə minimum təsir etməklə istismar olunmasını və karyerlər bağlandıqdan sonra uzunmüddətli mənfi təsirlərin qarşısının alınmasını təmin edir. Karyer sahəsində hər bir işçi ətraf mühitə mövcud təsirlərin monitorinqini gündəlik fəaliyyətlərinə daxil etməlidirlər.

Mənfi təsirlərin azaldılması və müsbət təsirlərin artırılması karyer sahələrinin ətraf mühitə təsirlərinin "təzminatı" kimi qonşu sahələrdə ətraf mühitin yaxşılaşdırılmasını əhatə edir. Məsələn, karyer sahəsinin tikilməsi zamanı kiçik bir göl qurudulmalıdırsa, bunun əvəzinə qonşu ərazilərdə yeni göllər salına bilər, bununla da ekoloji mühitin ümumi vəziyyəti qorunmuş və ya inkişaf etdirilmiş olar.

## Ədəbiyyat

1. Əzizov, A.M., Muxtarov H.H.,Nağıyev M.T. ( 2003)-Açıq Mədən işləri.Bakı
2. Həmdullah Qəzvini,(1336).«Nüzhət əl-qülub» Tehran.
3. Azərbaycan SSR İnteqrasiya edilmiş Geoloji Partiyası (1979).Daş əmələ gətirən tullantıların sement istehsalı kimi istifadə edilməsi məqsədilə Qaradağ əhəngdaşı yatağının 1-ci geoloji bölməsinin əlavə tədqiqi.Bakı.
4. İvanov, V.V. (2015)–Karxanalarda mədən işlərinin aparılması texnologiyası.Sank-Peterburq .
5. Rakişev, B. R.(2012)-Karxana sahələrinin açılması. Almata.
6. Petruşevskiİ. P. Həmdullah Qəzvin (1937).Şərqi Zaqafqaziya tarixi. SSSR. №4.
7. Abdoli, M.A., Jalili Ghazizade M., Samieefard R.(2010)- Hazardous waste management. University of Tehran's publication, Tehran.
8. Ahmari, S., Zhang L.(2012).Production of ecofriendly bricks from copper mine tailings through geopolymerization. Construction and Building Materials.
9. Andras, P., Turisova I., Dirner V., Krnac J., Volekova-Lalinskad B., Buccher G., Jelen S (2012). Hazards of Heavy Metal Contamination at L'ubietova CuDeposit.
10. Balvardi, M. (2010)- Geochemical model and mass balance of causing toxic heavy metals in rock, ore, soil, sediment, water and tailings geochemical cycle of Sirjan's Gol Gohar iron ore. Environmental Geology, Bahonar University, Kerman, Iran.
11. Efendieva, Z.J., Khalifazade Ch.M (2018). Economic problems and enviromental challenges in ore mining in Azerbaijan.Journal of mining science,. Vol. 54. № 1.
12. Chanturia, V. A.(1995). Mineral areas mineral complex raw materials. Mountain Journal,.№1.
13. Das, S.K., Sanja K., Ramachandra R. P. (2000). Exploitation of Iron Ore Tailing for the Development of Ceramic Tiles. Waste Management.
14. Geology of Azerbaijan (2003). Nafta Press, Vol. VI Minerals. Baku.
15. Habibinejad, M. (2000)- Industrial Waste Management Practical Guide. Avam publication. Tehran.
16. Hammond, A. A. (1998)- Mining and Quarrying Wastes. A Critical Review. Engineering Geaology.
17. Kozlovsky, E. A.(2015). Natural resources in the economy of Russia and in the world. Gornyi Zhurnal,. № 7.
18. Grega, M.D., Buckingham P.L., Evans, J.C. (2001)- Hazardous Waste Management. 2nd edition. McGraw- Hill Science, United state.
19. Mineral resources of Azerbaijan (2005). Baku. Ozan.
20. Nabiyev, N.A. (1978)-Complex use of mineral resources problems Azerbaijan.
21. Nevskaya, M.A. (2013)- The main problems of waste management of mining and processing of mineral resources.Actual problems of economics and management. Collection of articles of the First Corresponding Scientific and Practical Conference.
22. Van Zyl D. (1993)-Mine waste disposal. Daniel, D.E. (Ed.) Geotechnical Practice for Waste Disposal. - Chapman & Hall, London, Chapter 12.
23. Zhang, S., Xue X., Liu X., Duan P., Yang H., Jiang T., Wang D., Liu R.(2006).Current Situation and Comprehensive Utilization of Iron Ore Tailing Resources. Journal of Mining Science 42(4).

**Rəyçi: y.e.ü.f.d. İntizar Əliyeva**

Göndərildi: 16.03.2022 Qəbul edildi: 25.04.2022

## İÇİNDƏKİLƏR

### HUMANİTAR VƏ İCTİMAİ ELMLƏR
### HUMANITIES AND SOCIAL SCIENCES

## TƏBİƏT ELMLƏRİ
## NATURAL SCİENCES

